**1924-cü ildən çıxır**

# AZƏRBAYCAN MƏKTƏBİ

**TƏSİSÇİ**
**Azərbaycan Respublikası**
**Təhsil Nazirliyi**

**İyul-Avqust**
**№ 4 (662)**
**2014**

**Elmi-nəzəri, pedaqoji jurnal**

## BU NÖMRƏDƏ

---

LİSENZİYA № 022589

**Jurnal Azərbaycan Respublikası Prezidenti yanında Ali Attestasiya Komissiyasının qərarı ilə tövsiyə edilən nəşrlər siyahısına daxil edilmişdir.**

**Jurnal akademik Mehdi Mehdizadə mükafatı laureatı adına layiq görülmüşdür.**

**Redaksiyanın əlaqə telefonları: 496-74-20; 496-74-19**

**Redaksiyanın ünvanı:** Bakı ş., Afiyəddin Cəlilov küçəsi, 22 (Təhsil Problemləri İnstitutunun binası, 409, 410 və 411-ci otaqlar). İndeks AZ 1025 Kağız formatı 70x108 1/16 Sifariş: 08

Jurnal redaksiyanın kompyuter mərkəzində yığılıb səhifələnmiş, "Ərgünəş" FM-də (nəşriyyat-poliqrafiya müəssisəsində) çap olunmuşdur.

**В этом номере**



**In this number**

***Təbrik edirik***

# AMEA-NIN HƏQİQİ VƏ MÜXBİR ÜZVLÜYÜNƏ SEÇKİLƏRİN NƏTİCƏLƏRİ HAQQINDA

Azərbaycan Milli Elmlər Akademiyasının (AMEA) həqiqi və müxbir üzvlüyünə seçkilər keçirilib. Azərbaycan Milli Elmlər Akademiyasının prezidenti, akademik Akif Əlizadənin məlumatına görə AMEA-nın həqiqi üzvlüyünə 43, müxbir üzvlüyünə isə 265 nəfər namizədliyini irəli sürmüşdür.

Səsvermə nəticəsində 26 həqiqi və 50 müxbir üzv seçilib.

**AMEA-nın həqiqi üzvlüyünə seçkilərin nəticələri ilə bağlı siyahı**

| № | Soyadı, adı, atasının adı | İxtisası |
|---|---|---|
| **1. FİZİKA-RİYAZİYYAT VƏ TEXNİKA ELMLƏRİ BÖLMƏSİ** | | |
| 1.1. | Abdinov Cavad Şahvələd oğlu | Fizika |
| 1.2. | Cəfərov Təyyar Cümşüd oğlu | Fizika |
| 1.3. | Tağıyev Bahadur Hüseyn oğlu | Fizika |
| 1.4. | Mehdiyev Məhəmməd Fərman oğlu | Mexanika |
| 1.5. | Hacıyev Asəf Hacı oğlu | Riyaziyyat |
| 1.6. | Əliquliyev Rasim Məhəmməd oğlu | İnformatika |
| **2.KİMYA ELMLƏRİ BÖLMƏSİ** | | |
| 2.1. | Abbasov Vaqif Məhərrəm oğlu | Kimya |
| 2.2. | Əliyeva Rəfiqə Əlirza qızı | Kimya |
| 2.3. | Əzizov Akif Həmid oğlu | Kimya |
| 2.4. | Qəribov Adil Abdulxalıq oğlu | Kimya |
| 2.5. | Tağıyev Dilqəm Bəbir oğlu | Kimyəvi kinetika və kataliz |
| **3. YER ELMLƏRİ BÖLMƏSİ** | | |
| 3.1 | Babazadə Vasif Məmməd Ağa oğlu | Geologiya |
| 3.2. | Qədirov Fəxrəddin Əbülfət oğlu | Geofizika |
| 3.3. | Məmmədov Pərviz Ziya oğlu | Geofiziki axtarış üsulları |
| 3.4. | Quliyev Hətəm Hidayət oğlu | Geomexanika |
| 3.5. | Məmmədov Ramiz Mahmud oğlu | Coğrafiya |
| **4. BİOLOGİYA VƏ TİBB ELMLƏRİ BÖLMƏSİ** | | |
| 4.1. | Hüseynova İradə Məmməd qızı | Biokimya |
| **5. AQRAR ELMLƏR BÖLMƏSİ** | | |
| 5.1. | Babayev Məhərrəm Pirverdi oğlu | Torpaqşünaslıq |
| **6. HUMANİTAR VƏ İCTİMAİ ELMLƏR BÖLMƏSİ** | | |
| 6.1. | Abdullayev Kamal Mehdi oğlu | Dilçilik |
| 6.2. | Hacıyev Tofiq İsmayıl oğlu | Dilçilik |

| | | |
|---|---|---|
| 6.3 | Hüseynov Rafael Baba oğlu | Ədəbiyyatşünaslıq |
| 6.4 | Kərimov Teymur Həşim oğlu | Ədəbiyyatşünaslıq |
| 6.5. | Məlikov Arif Cahangir oğlu | Sənətşünaslıq |
| 6.6. | Fətullayev Şamil Seyfulla oğlu | Sənətşünaslıq |
| **7. NAXÇIVAN BÖLMƏSİ** | | |
| 7.1. | Talıbov Tarıyel Hüseynəli oğlu | Botanika |
| **8. GƏNCƏ BÖLMƏSİ** | | |
| 8.1. | Əliyev Fuad Yusif oğlu | Kimya |

**AMEA-nın müxbir üzvlüyünə seçkilərin nəticələri ilə bağlı siyahı**

| № | Soyadı, adı, atasının adı | İxtisası |
|---|---|---|
| **1. FİZİKA-RİYAZİYYAT VƏ TEXNİKA ELMLƏRİ BÖLMƏSİ** | | |
| 1.1. | Abdinov Ovsat Bəhram oğlu | Fizika |
| 1.2. | Cəfərov İsgəndər Həsən oğlu | Fizika |
| 1.3. | Hüseynov Rauf Rüstəm oğlu | Fizika |
| 1.4. | Kazımzadə Aydın Həsən oğlu | Fizika |
| 1.5. | Məmmədov Nazim Timur oğlu | Fizika |
| 1.6. | Nəcəfov İsmət Məhəmməd oğlu | Fizika |
| 1.7. | Nəhmədov Ənvər Piriverdi oğlu | Fizika |
| 1.8. | Pənahov Geylani Minhac oğlu | Mexanika |
| 1.9. | Bilalov Bilal Telman oğlu | Riyaziyyat |
| 1.10. | Quliyev Vaqif Sabir oğlu | Riyaziyyat |
| 1.11. | Ayda-zadə Kamil Rəcəb oğlu | İnformatika |
| 1.12. | Həsənov Afiq Rəşid oğlu | Texniki elmlər |
| **2.KİMYA ELMLƏRİ BÖLMƏSİ** | | |
| 2.1. | Babanlı Məhəmməd Baba oğlu | Qeyri-üzvi kimya |
| 2.2. | Mustafayev İslam İsrafil oğlu | Radiasiya kimyası |
| 2.3. | Əlimərdanov Hafiz Mütəllim oğlu | Neft kimyası |
| 2.4. | Cəfərov Valeh Cabbar oğlu | Yüksəkmolekullu birləşmələr kimyası |
| 2.5. | Əsədov Ziyafəddin Həmid oğlu | Yüksəkmolekullu birləşmələr kimyası |
| 2.6. | Məmmədov Bəxtiyar Əjdər oğlu | Yüksəkmolekullu birləşmələr kimyası |
| **3. YER ELMLƏRİ BÖLMƏSİ** | | |
| 3.1 | Əliyeva Elmira Hacı-Murad qızı | Geologiya |
| 3.2. | Əliyev Çingiz Səid oğlu | Geofizika |
| 3.3. | Yetirmişli Qurban Cəlal oğlu | Seysmologiya |
| 3.4. | Kəngərli Tələt Nəsrulla oğlu | Geotektonika |
| 3.5. | Əlizadə Elbrus Kərim oğlu | Coğrafiya |

| | | |
|---|---|---|
| 3.6. | Qardaşov Rauf Hacı oğlu | Okeanologiya |
| 3.7. | Salavatov Tulparxan Şarabudinoviç | Neft və qaz yataqlarının işlənilməsi |
| 3.8. | Süleymanov Bağır Ələkbər oğlu | Neft və qaz yataqlarının işlənilməsi |
| | **4. BİOLOGİYA VƏ TİBB ELMLƏRİ BÖLMƏSİ** | |
| 4.1. | Bayramov Nuru Yusif oğlu | Tibb elmləri |
| 4.2. | Qurbanov Fazil Səməd oğlu | Tibb elmləri |
| 4.3. | Musayev Şakir Məzlum oğlu | Tibb elmləri |
| 4.4 | Əli-zadə Validə Mövsüm qızı | Bitki fiziologiyası |
| 4.5. | Qarayev Zakir Ömər oğlu | Mikrobiologiya |
| 4.6. | Şahmuradov İlham Əyyub oğlu | Bioinformatika |
| 4.7. | Qurbanov Elşad Məcid oğlu | Botanika |
| 4.8. | Məmmədov Tərlan Həzərpaşa oğlu | Molekulyar biologiya |
| | **5. AQRAR ELMLƏR BÖLMƏSİ** | |
| 5.1. | İsmayılov Amin İsmayıl oğlu | Torpaqşünaslıq |
| 5.2. | Əkpərov Zeynal İba oğlu | Aqrar elmləri |
| | **6. HUMANİTAR VƏ İCTİMAİ ELMLƏR BÖLMƏSİ** | |
| 6.1. | İmanov Muxtar Kazım oğlu | Ədəbiyyatşünaslıq |
| 6.2. | Mütəllimov Təhsin Mütəllim oğlu | Ədəbiyyatşünaslıq |
| 6.3 | Nağısoylu Möhsün Zellabdin oğlu | Ədəbiyyatşünaslıq |
| 6.4. | Paşayeva Nərgiz Arif qızı | Ədəbiyyatşünaslıq |
| 6.5. | Salamzadə Ərtegin Əbdül Vahab oğlu | Sənətşünaslıq |
| 6.6. | Axundova Nərgiz Çingiz qızı | Tarix |
| 6.7. | Mustafayev Şahin Məcid oğlu | Tarix |
| 6.8. | Baxşəliyeva Gövhər Baxşəli qızı | Şərqşünaslıq |
| | **7. NAXÇIVAN BÖLMƏSİ** | |
| 7.1. | Məhərrəmov Saleh Heydər oğlu | Biologiya |
| 7.2. | Bağırov Adil Nəsib oğlu | Dilçilik |
| 7.3. | Abbasov Əliəddin Dəyyan oğlu | Kimya |
| 7.4. | Səfərli Hacıfəxrəddin Yəhya oğlu | Tarix |
| 7.5. | Şahverdiyev Zəhmət Əbülfət oğlu | Tarix |
| | **8. GƏNCƏ BÖLMƏSİ** | |
| 8.1. | Cəfərov İbrahim Həsən oğlu | Biologiya |

Azərbaycan Respublikası təhsil nazirinin
27 iyun 2014-cü il tarixli 752 nömrəli əmri ilə
təsdiq edilmişdir

# ALİ TƏHSİL MÜƏSSİSƏSİNDƏ TƏHSİLALANLARIN ELMİ TƏDQİQAT İŞİNİN TƏŞKİLİ HAQQINDA ƏSASNAMƏ

**1. Təhsilalanların elmi tədqiqat işi sisteminin metodoloji əsasları**

Müasir dövrdə istehsal texnologiyalarının informasiyalaşdırması ilə əlaqədar xüsusi informasiyaların (elmi, texniki, texnoloji və s.) həcmi sürətlə artır. Belə bir şəraitdə hazır biliklərin mənimsənilməsinə və təqdim olunmasına əsaslanan təlim texnologiyaları rasional və perspektivli hesab olunmur. Ənənəvi iqtisadiyyatdan “bilik” iqtisadiyyatına keçidin baş verdiyi şəraitdə mütəxəssislərin yaradıcılıq qabiliyyətinin yüksəldilməsi və intellektual səviyyəsinin formalaşdırılmasına yönəldilmiş təhsil texnologiyalarından istifadə edilməsi vacibdir. Bu sahədə həyata keçirilən iş yaradıcılıq fəaliyyəti konsepsiyasına söykənən pedaqoji texnologiyalar əsasında qurulmalıdır. Bunun daha səmərəli forması ali təhsil pilləsinin bakalavriat və magistratura səviyyələrində (tibb sahəsində isə baza ali tibbi təhsil müəssisələrində və rezidenturada) təhsilalanların (bundan sonra - tələbələr) elmi tədqiqat işinin (bundan sonra - TETİ) sistemli şəkildə və fasiləsiz təşkil edilməsi, tədris prosesinə maksimum yaxınlaşdırılmasıdır.

**2. Tələbələrin elmi tədqiqat işinin məqsəd və vəzifələri**

2.1. TETİ elmi-texniki tərəqqinin nailiyyətlərini praktiki fəaliyyətində tətbiq etməyi, texnikanın və iqtisadiyyatın inkişafına daha tez uyğunlaşmağı bacaran ali təhsilli mütəxəssislərin hazırlanması işinin keyfiyyətinin yüksəldilməsi üçün ən vacib vasitələrdən biridir. TETİ ilk növbədə tələbələrdə optimal qərarların qəbul edilməsi üçün imkan yaradan analitik və tənqidi təfəkkürün formalaşdırılmasına xidmət edir.

TETİ-nin əsas məqsədi tələbələrdə yaradıcılıq qabiliyyətlərinin formalaşdırılması və gücləndirilməsi, gənclərin elmi, texnoloji, yaradıcı və tətbiqi fəaliyyətə cəlb olunması formalarının inkişaf etdirilməsi və təkmilləşdirilməsi, ali təhsilli mütəxəssislərin peşəkarlıq səviyyəsinin yüksəldilməsi üçün tədris-elm-tərbiyə prosesinin vəhdətini təmin edən sistemin yaradılmasıdır.

2.2. TETİ-nin əsas vəzifələri aşağıdakılardır:

- tələbələrə elmi biliklərin, xüsusilə yeni elmi biliklərin rasional və effektiv əldə olunması və istifadə edilməsi metodlarının öyrədilməsi
- vahid təlim-tərbiyə sistemi çərçivəsində ali təhsil sisteminin elm və istehsalat fəaliyyətinə inteqrasiyasının yeni formalarının axtarılması və təkmilləşdirilməsi;
- tələbələrə elmi, yaradıcılıq və tədqi-

qatçılıq vərdişlərinin aşılanması;

- tələbələrin elmi tədqiqatlarda və texniki yaradıcılıqda real iştirakının təmin edilməsi, habelə innovasiya fəaliyyətinə cəlb edilməsi;

- elm, texnika və istehsalat sahələrində mövcud olan yeni texnologiyaların mənimsənilməsinin təşkil edilməsi;

- tələbələrin müasir elmi metodologiyalarla, habelə elmi etika normaları ilə tanış edilməsi, onlara elmi ədəbiyyatla işləmək qaydalarının öyrədilməsi;

- tələbələrə elmi layihə, məruzə və məruzə tezislərini hazırlamaq, elmi tədbirlərdə (seminar, konfrans və s.) çıxış etmək və diskussiya aparmaq bacarığının aşılanması;

- elmə meyilli tələbələrin yaradıcılıq potensialının inkişaf etdirilməsi.

**3. Tələbələrin elmi tədqiqat işinin təşkili**

3.1. TETİ tədris prosesinin davamına və dərinləşdirilməsinə xidmət edir və ali təhsil müəssisəsinin kafedra, laboratoriya, elmi tədqiqat mərkəzləri və institutlarında təşkil olunur. Tələbə elmi tədqiqat işlərinə rəhbərliyi ali təhsil müəssisəsinin professor və müəllimləri, elmi bölmələrinin əməkdaşları və doktorantlar həyata keçirir.

3.2. TETİ tədris prosesinə daxil olan və tədrisdənkənar vaxtlarda yerinə yetirilən işlərə bölünür.

3.2.1. Tədris prosesinə daxil olan TETİ-yə aşağıdakılar aiddir:

- məzmununda elmi araşdırma elementləri olan tapşırıqlar, laboratoriya, kurs, buraxılış və dissertasiya işləri;

- tədris və istehsalat təcrübəsi zamanı yerinə yetirilən konkret qeyri-standart tapşırıqlar;

- “Elmi tədqiqatların əsasları” adlı kursun tədris planına daxil edilərək tələbə və magistrantlara elmi tədqiqat işinin yerinə yetirilməsi metodikasının nəzəri əsaslarının, elmi eksperimentin təşkili və planlaşdırılmasının, elmi məlumatların toplanması və işlənilməsinin öyrədilməsi.

3.2.2. Tədrisdənkənar vaxtlarda yerinə yetirilən TETİ aşağıdakı formalarda təşkil olunur:

- tələbələrin məqalə, elmi layihə, məruzə və tezislər üzərində işi;

- tələbələrin elmi seminar, konfrans, olimpiada və müsabiqələrdə iştirakı;

- ali təhsil müəssisələrində dövlət büdcəsi hesabına, təsərrüfat müqaviləsi əsasında, yaxud beynəlxalq, respublika və ali məktəbdaxili qrantlar üzrə yerinə yetirilən elmi tədqiqatlarda tələbələrin fərdi və ya kollektiv halında iştirakı;

- tələbələrin elmi tədqiqat mərkəz və laboratoriyalarında, layihə-konstruktor, texnoloji, elmi-məlumat, tərcümə və digər bürolarında, yaradıcılıq emalatxanaları və studiyalarında yerinə yetirilən işlərdə iştirakı;

- mədəniyyət, texnika və elm sahələrində biliklərin yayılması üzrə mühazirələrdə iştirakı.

3.3. Tələbə elmi seminarları ali təhsil müəssisələrinin ümumelmi və ixtisas kafedralarında, elmi tədqiqat bölmələrində təşkil olunur. Bu seminarlar tələbələrə elmi ədəbiyyat üzrə referat hazırlamaq, elmi eksperiment aparmaq və alınmış nəticələri təhlil etmək, yerinə yetirilmiş tədqiqatların nəticələrinə dair hesabat hazırlamaq, məruzə ilə çıxış etmək və elmi diskussiya aparmaq bacarıqlarının aşılanmasına xidmət edir.

3.4. Tələbələr, bir qayda olaraq, ali təhsil müəssisəsinin elmi bölmələrində və

kafedralarında yerinə yetirilən tədqiqat işlərinin icraçıları kimi cəlb olunurlar. Bakalavriat səviyyəsində tələbələrə tapşırıqlar verilərkən onların təhsildə əldə etdiyi uğurları nəzərə alınmalı, eyni zamanda onlara problem xarakterli tapşırıqlar verilməməlidir. Bu tapşırıqlarda yaradıcılıq elementlərindən istifadə olunması, sadə araşdırmaların və tədqiqatların aparılması nəzərdə tutulmalıdır. Tələbəyə elmi tədqiqat işinin proqramının və ya təqvim planının tərtib edilməsi, tədqiqatlara başlamazdan əvvəl istifadə ediləcək ədəbiyyat mənbələrindən məlumatların toplanıb təhlil edilməsi, təqvim planında nəzərdə tutulan digər işlərin yerinə yetirilməsi, tədqiqat işinin nəticələrinin təhlil və şərh edilməsi, onları özündə cəm edən hesabatın, tələbə konfranslarında iştirak etmək üçün məruzələr və müasir texnologiyalar əsasında təqdimatın hazırlanması sahəsində biliklərin əldə edilməsi və təcrübə vərdişləri, habelə kollektiv halında işləmək bacarığı aşılanmalıdır.

3.5. Humanitar, texnika və təbiət elmləri sahəsində müstəqil elmi tədqiqat işinin elementlərini yerinə yetirməyi bacaran təhsilalanlar elmi tədqiqat işlərində iştirak edən tələbə hesab olunurlar. Tələbənin elmi tədqiqat işi müvafiq hesabatın təqdim olunması, seminarda və ya konfransda çıxışı, müsabiqədə iştirakı ilə başa çatır.

3.6. Təhsildənkənar vaxtlarda yerinə yetirilən və tədris proqramlarının tələblərinə cavab verən TETİ müvafiq laboratoriya, kurs, buraxılış və ya dissertasiya işi kimi də qəbul edilə bilər.

3.7. TETİ ali təhsil müəssisəsinin, fakültənin, kafedranın elmi iş planına daxil edilir və ali təhsil müəssisəsinin (fakültənin, kafedranın) illik hesabatında "Təhsilalanların elmi tədqiqat işi" bölməsində əks olunur.

3.8. Ali təhsil müəssisəsində TETİ-nin təşkilinə görə məsuliyyəti rektor (fakültədə - dekan, kafedrada - kafedra müdiri) və Tələbə Elmi Cəmiyyəti Şurasının sədri daşıyır. TETİ-nin təşkili və inkişafı üzrə tədbirləri rektor, elmi işlər üzrə prorektor, dekan və kafedra müdiri Tələbə Elmi Cəmiyyəti ilə birlikdə həyata keçirir.

3.9. Hər fakültədə və kafedrada TETİ-yə cavabdeh olan şəxs (ştatda olan müəllimlər sırasından) müəyyən edilir və fakültənin Elmi şurasında, yaxud kafedra iclasında təsdiq olunur.

3.10. TETİ-yə cəlb olunan hər bir tələbəyə tədris ilinin əvvəlində kafedra iclasında elmi rəhbər təyin edilir, onun tədqiqat mövzusu müəyyənləşdirilir və "Tələbə elmi tədqiqat işinin təqvim planı" tərtib olunur (nümunəsi əlavə edilir). Həmin plan tələbə və onun elmi rəhbəri (müəllim) tərəfindən imzalanır. "Tələbə elmi tədqiqat işinin təqvim planı"nı kafedra müdiri 3 nüsxədə təsdiq edir. Təsdiq edilmiş planın bir nüsxəsi tələbədə, digər nüsxəsi kafedrada saxlanılır, 3-cü nüsxəsi Tələbə Elmi Cəmiyyəti Şurasına təqdim olunur.

3.11. Tələbələrin elmi tədqiqat işinin təqvim planlarına daxil edilmiş tədqiqat mövzuları kafedralarda yerinə yetirilən elmi tədqiqat işlərinə uyğun və ya tələbələr üçün nəzərdə tutulan mövzulardan biri olmalıdır. Tələbələr həmin tədqiqat işlərini fərdi, yaxud kollektiv şəkildə müəllimin rəhbərliyi ilə yerinə yetirirlər.

3.12. Fakültə dekanlıqları və kafedralar tələbələrə verilmiş tapşırıqların və onların tədqiqatlarının yerinə yetirilməsi üçün lazımi şərait və daimi fəaliyyət göstərən tələbə dərnəkləri yaratmalı və gəncləri onla-

rın işinə cəlb etməlidir.

3.13. TETİ-yə elmi-metodik rəhbərlik Azərbaycan Respublikasının Təhsil Nazirliyi və Azərbaycan Respublikasının Səhiyyə Nazirliyi (baza tibb təhsili və rezidentura üzrə) tərəfindən həyata keçirilir.

3.14. TETİ-ni inkişaf etdirmək və stimullaşdırmaq məqsədi ilə Azərbaycan Respublikasının Təhsil Nazirliyi və bu işdə maraqlı olan digər nazirlik və təşkilatlar tələbə elmi konfransı, ən yaxşı tələbə elmi tədqiqat işi müsabiqəsi, elmi layihə olimpiadası və başqa tədbirlər keçirir. Tədbirlərin keçirilmə qaydaları müvafiq normativ sənədlərlə müəyyən edilir.

**4. Tələbə elmi tədqiqat işinin maliyyələşdirilməsi**

4.1. Kafedra və elmi tədqiqat laboratoriyalarında (elmi tədqiqat institutlarında və mərkəzlərində) yerinə yetirilən TETİ ilə bağlı tələb olunan xərclər ali təhsil müəssisəsinin əldə etdiyi gəlirlər, o cümlədən qrantlar və qanunvericiliyə zidd olmayan digər mənbələr hesabına maliyyələşdirilir.

4.2. TETİ-nin yerinə yetirilməsi üçün vəsaitlərin ayrılmasına və xərclənməsinə nəzarət rektorluq tərəfindən həyata keçirilir.

4.3. TETİ-yə cəlb edilən tələbələr ali təhsil müəssisəsinin elmi və tədris hissələrinin avadanlıqlarından, qurğularından, hesablama texnikasından, internetindən və s. istifadə edirlər.

4.4. Kafedra və elmi bölmə rəhbərləri tərəfindən tələbələr ödənişli əsaslarla (qrant hesabına, təsərrüfat müqaviləsi əsasında) aparılan elmi tədqiqat işlərinə cəlb oluna və əməkhaqqı ala bilərlər.

4.5. TETİ-yə rəhbərlik üçün sərf edilən vaxt professor-müəllim heyətinin fərdi iş planlarında elmi-metodik və elmi işə ayrılan vaxt normalarına daxildir. TETİ-yə rəhbərlik ali təhsil müəssisəsində çalışan hər bir müəllimin fərdi iş planının tərkib hissəsi sayılır.

4.6. Ali təhsil müəssisələri tələbələr üçün qrant müsabiqələri təşkil edə bilər. Müsabiqənin keçirilməsi və maliyyələşdirilməsi müvafiq əsasnamə ilə tənzimlənir.

4.7. Ali təhsil müəssisələri öz daxili imkanları hesabına tələbələr üçün müxtəlif elmi konfrans, müsabiqə, olimpiada, sərgi və s. tədbirləri planlaşdırır və həyata keçirir.

**5. Tələbələrin və müəllimlərin rəğbətləndirilməsi**

5.1. Elmdə və TETİ-nin təşkilində əldə etdikləri nailiyyətlərə görə tələbələr ali təhsil müəssisəsinin rəhbərliyi tərəfindən Fəxri Fərman, diplom, qiymətli hədiyyələr, pul mükafatları, pulsuz istirahət putyovkaları və s. ilə rəğbətləndirilə bilər.

5.2. Elmi nailiyyətlər qazanmış tələbələr xarici ölkələrdə keçirilən elmi olimpiada, konfrans, müsabiqə və sərgilərdə iştirak etmək üçün ali təhsil müəssisəsinin vəsaiti hesabına göndərilə bilər.

5.3. Fəal elmi işlə məşğul olan və təhsildə yüksək göstəricilər əldə edən tələbələrə qanunvericilikdə nəzərdə tutulmuş qaydada adlı təqaüdlər verilə bilər.

5.4. Yüksək elmi nailiyyətlər əldə edən tələbələrin elmi rəhbərləri və Tələbə Elmi Cəmiyyətinin fəal üzvləri təhsil müəssisəsinin rəhbərliyi tərəfindən rəğbətləndirilə bilər.

# AZƏRBAYCAN XALQININ TARİXİ… ÜMUMMİLLİ İDEALLARI… VƏ AZƏRBAYCANÇILIQ İDEOLOGİYASI

**Nizami Cəfərov**
***Millət vəkili, Bakı Dövlət Universitetinin professoru, filologiya elmləri doktoru, AMEA-nın müxbir üzvü***

**Azərbaycanlılıq hissiyyatını gənclərdə yaşatmaq lazımdır. Azərbaycanı sevmək azərbaycanlılıq hissiyyatını özündə cəm etmək deməkdir.**

**Heydər Əliyev**

Azərbaycan təhsilində gənc nəslin milli-mənəvi dəyərlərə hörmət ruhunda tərbiyəsində azərbaycançılıq xüsusi yer tutur. Təhsilalanlara aşılanmalıdır ki, dünyanın ən qədim xalqlarından olan azərbaycanlılar milli mədəniyyətini, zəngin mənəvi dəyərlərini yaşadaraq, onları yad təzahürlərdən hifz edərək tarixi etnos kimi mövcudluqlarını daima qoruyub saxlamışdır.

Azərbaycan xalqı dünyanın o xalqlarındandır ki, zəngin (və şərəfli!) bir tarix yaşamaqla yanaşı, bu tarixi onun ən müxtəlif dövrlərində, mərhələlərində bütün aydınlığı (və dərinliyi) ilə dərk eləməyə çalışmış, gələcəyə həmişə ümidlə (və inamla!) baxmışdır. Xalq yalnız böyük mütəfəkkirlərinin, elm və sənət xadimlərinin, dövlət adamlarının deyil, ümumkütləvi düşüncənin səviyyəsində də tarixə kifayət qədər həssas olmuş, öz tarixi yaddaşını milli mənliyinin, mentalitetinin – mənəvi xarakterinin üzvi tərkib hissəsi kimi qoruyub saxlamışdır.

Müxtəlif təzyiqlərə, müdaxilələrə ən çox məruz qalan xalqlardan olan Azərbaycan xalqı ərazi bütövlüyünü, siyasi birliyini itirsə də, tarixi təfəkkürünün bütövlüyünü heç zaman itirməmişdir. Və bu milli tarixi təfəkkürün bütövlüyüdür ki, xalq özünün milli ideallarına həmişə sadiq qalmış, onların elmi-nəzəri yekunu olaraq azərbaycançılıq ideologiyasını yaradıb inkişaf etdirmişdir.

* *
*

Azərbaycan xalqı öz mənşəyi etibarilə türk xalqlarından biridir. Və onun etnik tarixi ümumtürk tarixinin üzvi tərkib hissəsidir.

Türklər müstəqil bir etnos olaraq tarix səhnəsinə təxminən e.ə. III minilliyin ortalarında çıxmışlar. O dövrə qədər Altay etnik birliyinin tərkibində olan türklər bir neçə min illik diferensiasiya tarixi yaşamışlar.

Türk etnosunun hansı coğrafiyada formalaşması tarixşünaslıqda nə qədər mübahisəli olsa da, arqumentlərin çoxu diqqəti məhz Mərkəzi Asiyanın geniş çöllərinə yönəldir. E.ə. III minilliyin ortalarından e.ə. I minilliyin ortalarına qədər həmin coğrafiyanı məskunlaşdıran, öz etnik mənəvi xarakterlərini formalaşdıran, böyük epos mədəniyyəti yaradan türklər e.ə. I minilliyin sonlarına doğru, tamamilə təbii olaraq, Şimala, Cənuba, Şərqə və xüsusilə Qərbə yayılmağa başlayırlar.

Şimal soyuq idi. Cənub güclü Çin et-

nosları ilə diplomatik münasibət tələb edirdi.

Şərqdə cəlbedici bir şey olmadı.

Və tarix türklərin qarşısına Qərbə doğru uzanan intəhasız bir yol açmışdı. Özü də Cənub-Qərbə, yaxud Şimal-Qərbə yox, məhz birbaşa Qərbə!.. Qərb yaşayış üçün əlverişli (və boşluq!) idi.

Türklərin, yaxud onların da daxil olduğu etnik birliklərin Şərqdən Qərbə doğru axınlarının daha əvvəlki, hətta e.ə. X minilliyə qədər qədimləşdirilən dövrlərdən başlanması barədə təsəvvürlər mövcuddur. Bu təsəvvürlərə müəyyən qədər ciddi yanaşmağa əsas verən arqument Avropada türklərlə etnik qohum olan xalqların – macar, fin, eston və s. mövcudluğudur ki, onların bu qədər uzaq Qərbə düşmələrinin tarixinin e.ə. I minilliyin sonlarından sonraya aid olmasını qəbul etmək çətindir. Başqa bir arqument də vardır… Türklər eramızın ilk əsrlərindən başlayaraq Qərbə doğru böyük kütlələrlə, inamla, sanki yüzillər boyu tanıdıqları yollarla gedirmiş kimi gedirlər. Qarşılaşdıqları xalqlarla çoxtərəfli, genişmiqyaslı əlaqələrə girmələri türklərin bu hərəkatının kortəbii bir axın yox, qanunauyğun proses olduğunu göstərir…

I minilliyin ortalarında, Qərb türkləri Atillanın başçılığı ilə german və slavyan tayfalarını öz ətraflarında birləşdirərək Roma imperiyasını dağıdıb Avropa tarixinin yeni epoxasını başlayanda Şərq türkləri hələ də Mərkəzi Asiyada öz tarixi vətənlərinin keşiyini çəkir, Şərq dünyasının etnik-mədəni mənzərəsinin formalaşmasında fəal iştirak edirdilər. Və Altaylardan Qərbi Avropaya qədər yayılan bu möhtəşəm etnosun ilkin diferensiasiyası da I minilliyin əvvəllərindən başladı. Qərbə doğru axın edən türkləri tarix tədricən qıpçaqlar kimi tanıdı… Mərkəzi Asiyada isə qıpçaqlarla yanaşı, oğuzlar və qarluqlar vardı.

Asiyadan Şərqi Avropanın geniş çöllərinə keçən qıpçaq türkləri – hunlar hələ eramızın ilk əsrlərindən yalnız Qərbə yox, Şimala və Cənuba doğru da yayıldılar… Və nəticə etibarilə, Şimalda çuvaşların, tatarların, başqırdların və s., Cənubda Azərbaycan türklərinin, kumukların, qaraçay-balkarların və s. etnik əsası qoyuldu.

Mərkəzi Asiyada qalan türklərə gəldikdə isə, qıpçaqlar – Altay, qazax, qırğız və s.; qarluqlar – özbək, uyğur və s.; oğuzlar isə türkmənlərə, sonradan Asiyaya keçərək Azərbaycan, Türkiyə türklərinə və s. bölündülər. Və beləliklə, I minilliyin sonu II minilliyin əvvəllərindən etibarən türk etnosunun diferensiasiyasının ikinci dövrü başlandı: qıpçaqlar, oğuzlar və qarluqlar müasir türk xalqlarına parçalandılar…Ancaq qeyd etmək lazımdır ki, birinci diferensiasiya kimi ikincisi də yüz illər boyu davam edən mürəkkəb bir proses olub ortaq kökləri ən diferensial dövründə belə qoruyub saxlamışdır.

Türklərin etnik-coğrafi diferensiasiyasının bölünməsinin məhsulu olan Azərbaycan xalqının – Azərbaycan türklərinin əsasını e.ə. I minilliyin sonu eramızın I minilliyinin əvvəllərində Şimaldan–Şərqi Avropadan Qafqaza gələn qıpçaq türkləri – hunlar müəyyənləşdirməyə başlamışlar.

Bununla belə Azərbaycan tarixşünaslığında türklüyün tarixini müasirləşdirməklə yanaşı, daha qədim dövrlərə aparıb çıxarmaq cəhdləri də vardır. Hətta bir sıra araşdırıcılar, kifayət qədər sübutları olmasa da, türklərin dünyaya, ümumiyyətlə, Ön Asiyadan yayıldığı iddiasındadırlar. Biz bu cür iddialara dərhal “qeyri-elmi” damğası vurub üstündən keçmək fikrində deyilik, ancaq onu da əminliklə deyə bilərik ki, Azərbaycan xalqının təşəkkülünə eramızdan əvvəlləki minilliklərə aid etnik münasibətlər (və tarix!) elə bir təsir göstərməmişdir.

* *
*

Azərbaycanın etnik tarixi Azərbaycan xalqının tarixindən qədimdir.

E.ə. II minillikdən etibarən Cənubdan gələrək tədricən Qafqazda məskunlaşan Qafqaz etnosu–indiki Dağıstan xalqlarının ulu babaları bu coğrafiyanın bizə məlum olan ilk sakinləri idilər. Və onların etnik diferensiasiyasının məhz burada–Şimali Qafqazda getməsi də bunu təsdiq edir. E.ə. II minilliyin sonu I minilliyin əvvəllərində isə Qafqaza İran etnosları gəldilər… Onlar coğrafiyanın yerli sakinlərini Şimala – Böyük Qafqaz dağlarının ətəklərinə doğru sıxışdırmağa başladılar. Ancaq İran etnoslarının əsas mədəniyyət mərkəzləri İranın xeyli Cənubunda olduğuna görə Qafqazda əvvəllər geniş yayıla, kütləvi olaraq məskunlaşa bilmədilər. Ancaq İran gücləndikcə İran etnosları vaxtaşırı olaraq Qafqaza müdaxiləni davam etdirdilər…

Azərbaycan xalqının əsası qıpçaq türklərinin–hunların Qafqaza (və daha Cənuba) ardıcıl axını (və bu coğrafiyada məskunlaşması) ilə qoyuldu. Eramızın ilk əsrlərində artıq Qafqaz əhalisinin əksəriyyətini təşkil edən tanrıçı türklər I minilliyin ortalarında artıq regionun əsas siyasi qüvvəsi idilər. Böyük mədəniyyətə, beynəlxalq münasibətlər təcrübəsinə və yüksək idarəçilik qabiliyyətinə malik türklər tezliklə yerli etnosları öz ətrafında birləşdirməyə nail oldular. Onların Qafqazda xüsusi nüfuz qazanmalarının bir səbəbi də vaxtaşırı olaraq Şimaldan – Şərqi Avropadan gələn türk-qıpçaq axınları hesabına daha da güclənmələri idi… Zatən tanrıçı olan Qafqaz türklərinin müəyyən qismi tədricən xristianlaşmağa və xristianlığın atributlarını qəbul eləməyə başladılar. Bu, onları xristianlığı qəbul etmiş qeyri-türk mənşəli qafqazlılarla da yaxınlaşdırdı. Və heç də təsadüfi deyil ki, tarixşünaslıqda xristian türklərin sonralar bir sıra Qafqaz xalqları içərisində əriməsi, məsələn, ermənilərin, gürcülərin etnik tərkibinə daxil olması barədə fikirlər mövcuddur. Ancaq belə bir hal olmuşdursa da, epizodik səciyyə daşımışdır. Çünki Azərbaycan xalqının təşəkkülü tarixində birinci dövr məhz tanrıçı qıpçaq türkləri, onların Azərbaycan türklüyünün ilk əsasını təşkil etməsi ilə əlamətdardır.

İkinci dövr ərəblərin Qafqaza hücumu, islam dininin yayılması və bunun ardınca müsəlman oğuz türklərinin Azərbaycanın Cənubuna və Şimalına (Qafqaza) yürüş edərək buralarda məskunlaşması ilə başlayır. Və oğuzların bu yeni vətən tutma hərəkatı II minilliyin əvvəllərində Şərqi Anadolunu da əhatə edir.

Azərbaycan xalqının təşəkkül tarixini özünəməxsus şəkildə əksetdirən “Dədə Qorqud” eposu da təsdiq edir ki, Qafqazda oğuzların müzəffər yürüşləri qarşısında əsas maneə qıpçaq türkləri, Şərqi Anadoluda isə yunanlar olmuşlar. Eposda müasir Qafqaz xalqlarından heç birinin adının çəkilməməsi oğuzların onlara əhəmiyyət verməməsini, yaxud bu xalqların VII- XI əsrlərdə regionda heç bir əhəmiyyətli siyasi rola malik olmadıqlarını göstərir.

Nə qədər islam təəssübkeşi olsalar da müsəlmanlığı yenicə qəbul etmiş gəlmə oğuz türkləri öz tarixi tanrıçı yaddaşları (az fərqli dilləri, etnik psixologiyaları və həyat tərzləri) ilə yerli qıpçaq türklərinə kifayət qədər anlaşıqlı idilər… Xüsusilə onların əksəriyyətini təşkil edən tanrıçı qıpçaqlara… Bununla belə regionda İslamın yayılması zərurəti, eləcə də sayca çoxluq və siyasi mütəşəkkillik oğuzlara xüsusi tarixi səlahiyyət verdiyinə görə yerli qıpçaqlar çox keçmədən gəlmə oğuzların təsirini qəbul etməli oldular. Xristian qıpçaqlar isə kilsə vasitəsi ilə Qafqazdakı, eləcə də Şərqi Avropadakı dindaşları ilə müəyyən əlaqələrini nəzərə almasaq, təcrid olunaraq etnik simalarını itirdilər.

Azərbaycan xalqının təşəkkülü tarixinin üçüncü–sonuncu dövrü I minilliyin əvvəllərindən – səlcuq (oğuz) türklərinin Azərbaycanın həm Şimalında, həm də Cə-

nubunda müəyyən etnocoğrafi (və siyasi) təmərküzləşmə yaratmalarından başlayıb həmin minilliyin ortalarınadək – Mərkəzi Asiyadan (Türküstandan) gələn türk axınlarının sona çatmasına qədər davam edir. Bu dövr onunla əlamətdardır ki, Azərbaycan xalqının etnik mənşəyində dayanan qıpçaq ünsürü artıq hər cür zənginləşmədən məhrum olduğu halda oğuz ünsürü ardıcıl olaraq zənginləşir. Və nəticə etibarilə, xalqın etnik tərkibində mütləq dominantlığını təmin edir… Bu gün Azərbaycan xalqının antropologiyasında, mədəniyyətində, dilində və s. qıpçaq elementləri nə qədər az olsa da, hər halda mövcuddur. Bununla belə xalqın əsas etnogenetik təbiətini oğuz türkləri müəyyən edir. Və Azərbaycan xalqının təşəkkül tarixi onun oğuz türklərindən olan türkmənlərlə Türkiyə türklərindən ayrılması, hər üç türk-oğuz xalqının II minilliyin ortalarında tarix səhnəsinə müstəqil xalqlar kimi çıxması ilə sona çatır.

Ancaq nəzərə alınması vacib olan bir məsələ də vardır… Bu, ən qədim zamanlardan Azərbaycanda məskunlaşmış, eləcə də buraya sonralar gəlmiş Qafqaz, İran və s. mənşəli etnosların türk mənşəli Azərbaycan xalqı ilə qaynayıb qarışması məsələsidir ki, həmin proses Azərbaycan xalqının bütün təşəkkül tarixi boyu getmişdir.

* *
*

Azərbaycan xalqının II minilliyin ortalarından başlayan tarixini milli birlik, ərazi bütövlüyü və dövlət müstəqilliyi uğrunda mübarizə tarixi kimi səciyyələndirmək olar. Türk (və müsəlman) dünyasının üzvi tərkib hissəsi olan azərbaycanlılar XVI əsrin əvvəllərində Şah İsmayıl Xətainin rəhbərliyi ilə Azərbaycan Səfəvilər dövlətinin əsasını qoydular ki, bu dövlət yalnız türk (və müsəlman) dünyası ilə deyil, bütün dünya ilə bu və ya digər dərəcədə bağlı idi. Paytaxtı əvvəllər Təbriz olan Azərbaycanın, demək olar ki, bütün coğrafiyasını əhatə edən bu dövlətin başında Azərbaycan türk hökmdarları dayanırdılar. Fərmanlar dövrün beynəlxalq dilləri ilə yanaşı, Azərbaycan türkcəsində də verilirdi. Milli mədəniyyətin inkişafı üçün böyük işlər görülürdü… Ancaq xarici müdaxilələr (və milli mütəşəkkilliyin zəifliyi) ucbatından Azərbaycan Səfəvilər dövləti öz tarixi missiyasını davam etdirə bilmədi. XVIII əsrin ortalarında başqa bir Azərbaycan türk hökmdarı Nadir şahın müstəqil Azərbaycan dövlətini möhkəmləndirmək uğrunda mübarizəsi də uğursuzluqla nəticələndi. Və ölkənin ərazisində biri digəri ilə vuruşan çoxlu kiçik dövlətlər – xanlıqlar meydana çıxdı.

Bununla belə XVI əsrin əvvəllərindən XVIII əsrin sonlarına qədər Azərbaycan xalqı öz mədəniyyətinin İntibah dövrünü yaşadı… Onlarla irihəcmli folklor əsərləri – dastanlar, xüsusilə "Koroğlu" eposu məhz həmin əsrlərdə yarandı. Klassik (ümumşərq) üslubunun ümumən mədəniyyətdə öz yerini xalq üslubuna və ya milli üsluba verməsi – canlı xalq dilində yazan böyük sənətkarların yetişməsi milli intibahın təzahürü idi.

XVII-XVIII əsrlər Azərbaycan xalqının tarixinin ən paradoksal dövrü sayıla bilər… Bir tərəfdə ümummilli ruh, mənəvi-mədəni birlik və müstəqillik hislərinin güclənməsi; digər tərəfdə isə siyasi dağınıqlıq, mərkəzi dövlətin olmaması… Bunun nəticəsində, artıq bütöv bir millət kimi formalaşmış azərbaycanlılar – Azərbaycan türklərinin tarixi vətəni XVIII əsrin sonu XIX əsrin əvvəllərindən başlayaraq İran, Rusiya və Osmanlı sultanlığının təcavüz meydanına çevrildi. Və beləliklə, Azərbaycan xalqı tarix boyu biri digəri ilə çarpışan üç dövlət tərəfindən bölüşdürüldü. Bundan sonra Azərbaycan türkləri öz etnik bütövlüklərini qorumaqla yanaşı, üç böyük mədəniyyətin fərqli təsirlərini, dövlət idarəçilik texnologiyalarını qəbul etməli oldular.

Şərqi Anadoluda məskunlaşmış Azərbaycan türkləri üçün etnik-mədəni mühit hər halda daha münasib idi. Ancaq Osmanlı sultanlığının ucqarları olduğundan sosial inkişafın problemləri vardı… Şimali Azərbaycanda Rusiya imperiyasının ruslaşdırma siyasəti nə qədər güclü olsa da, mütərəqqi, xüsusilə maarifpərvər siyasət də yürüdülürdü. Ən ağır vəziyyət isə Cənubi Azərbaycanda idi… İran dövləti ölkə əhalisinin yarıya qədərini təşkil edən Azərbaycan türklərinə, demək olar ki, heç bir perspektiv vəd eləmirdi.

Və Azərbaycan xalqı onun ictimai-siyasi tarixi üçün çox mühüm olan bir dövrə – XIX əsrin sonu XX əsrin əvvəllərinə bu cür acınacaqlı bir vəziyyətdə gəlib çıxdı…

* *
*

XIX əsrin sonu XX əsrin əvvəllərində Azərbaycan ictimai-siyasi şüuru xalqın ümummilli düşüncəsinin məhsulu olaraq azərbaycançılıq ideologiyasını formalaşdırdı ki, bu, türklüyünü, islam dininə məxsusluğunu və müasirləşmək istəyini dərk edən bir millətin ideologiyası idi. Azərbaycanın görkəmli elm, mədəniyyət və siyasət xadimlərinin, müəyyən fərqlərə baxmayaraq, demək olar ki, hamısının uğrunda mübarizə apardıqları həmin ideal bütöv bir nəzəri sistemə çevrildi.

Azərbaycançılıq ideologiyasının ilk siyasi-praktik hadisəsi isə Azərbaycan Demokratik Cümhuriyyətinin yaradılması oldu… Bu dövlətin meydana çıxmasında Azərbaycanın görkəmli ictimai-siyasi xadimlərinin, bütövlükdə Azərbaycan xalqının müstəqil dövlət qurmaq ideallarının böyük rolunu qiymətləndirməklə yanaşı etiraf etməliyik ki, o (Azərbaycan Xalq Cümhuriyyəti) daha çox mövcud tarixi şəraitin konyunkturunun məhsulu idi. Azərbaycan xalqının təşəkkül tapdığı (və yüz illər boyu məskunu olduğu) coğrafiyanın təxminən beşdə birində qurulmuş bu dövlət elə ilk aylardan qonşu xalqların – erməni və gürcülərin ərazi iddiaları ilə qarşılaşdı. Xüsusilə Şərqi Anadoludan qovularaq Qafqazda dövlət qurmağa can atan ermənilər Azərbaycan ərazilərini tutmaq üçün hər cür vəhşiliyə əl atdılar. Və Osmanlı dövlətinin Qafqaz İslam ordusu adı altında göstərdiyi hərbi yardım – müdaxilə olmasaydı, yəqin ki, Azərbaycan Xalq Cümhuriyyəti yalnız elan edilməklə kifayətlənmiş olacaqdı…

İmperialist Rusiyası kimi Sosialist Rusiyası da Qafqazda Azərbaycan türklərini həm fiziki, həm də mənəvi baxımdan sıxışdırmaqla "xristian qardaşlar"a geniş meydan açır, Azərbaycan Xalq Cümhuriyyətinin "varis"i olan Azərbaycan SSR-in bütün idarəçiliyini öz əlində saxlayır və paytaxt Bakını xüsusilə ermənilərin hesabına "beynəlmiləlləşdirməyə" çalışırdı.

Azərbaycanın Şimalı ilə Cənubu arasında sovet dövrünə qədər bu və ya digər səviyyədə mövcud olan əlaqələr bütünlüklə kəsilmişdi.

Bununla belə, Moskvanın idarə etdiyi "Azərbaycan dövləti" nə qədər ideoloji təzyiqlərə məruz qalsa da, milli şüurun daşıyıcısı olan ziyalılar məhv edilsə də, xalq məhdud imkanlar daxilində öz varlığını nümayiş etdirə bilmişdi…

Və Heydər Əliyev kimi bir dahini yetişdirmişdi.

* *
*

Azərbaycan xalqının ümummilli lideri Heydər Əliyevin azərbaycançılıq ideologiyasının inkişafında, yeni tarixi şəraitə uyğun interpretasiya edilməsində-modern səviyyədə təfsirində və həmin ideologiyanın tarixdə ilk dəfə əbədi (və dönməz) olaraq həyata keçirilməsində mənsub olduğu millətlə birlikdə apardığı mübarizə (göstərdiyi qəhrəmanlıq), ən nihilist "dostlarımızın" (və düşmənlərimizin) belə inkar edə bilməyəcəyi

bir hadisədir. Heydər Əliyevin nə səviyyədə bir azərbaycançı olması, milli ideologiyamızın inkişafı, həyata keçirilməsi tarixindəki rolu barədə danışarkən yalnız bircə gerçəkliyi yada salmaq kifayətdir ki, o, məfkurə olaraq meydana çıxandan bəri həmişə istər ədəbi, istər romantik siyasi təsəvvürlərin tərənnüm obyekti olmaqdan o yana keçməmiş, azərbaycançılıq ideallarına bir millətin müqəddəratını təyin edəcək qədər rəsmi məzmun–məndərəcə verdi.

Azərbaycan xalqı öz böyük oğullarının şəxsində belə bir cəhdi XX əsrin əvvəllərində də etmişdi, ancaq tarix müsaid deyildi…

Azərbaycançılıq ideologiyasının tarixi, əslində, Azərbaycan xalqının tarixi qədər qədimdir; hər şeydən əvvəl, ona görə ki, bu və ya digər xalq (etnos) özünün ümummilli məfkurəsini – həyat fəlsəfəsini bütün mövcudluğu boyu formalaşdırır. Və tarixin elə bir dövrü gəlir ki, xalqın böyük mütəfəkkirlərində təmsil olunan idrakı uzun əsrlər ərzində təbii şəkildə formalaşmış həmin özünəməxsus (ümummilli!) məfkurəni formulə edir.

Əgər I minilliyin ortalarından XIX əsrin sonu XX əsrin əvvəllərinə qədər Azərbaycan xalqının yaşadığı kifayət qədər mükəmməl inkişaf tarixi olmasaydı (və bu tarix xalqın ümummilli məfkurəsini diqtə etməsəydi!), azərbaycançılıq ideologiyasının əsaslarını nə keçən əsrin əvvəllərində formulə etmək, nə də həmin əsrin sonlarında yenidən bərpa eləmək mümkün olardı. Azərbaycan xalqının hansı məfkurəyə əsaslandığını bütün aydınlığı ilə təqdim edən ilk mənbə “Dədə Qorqud” eposudur. O epos ki, xalqımızın təşəkkül tapdığı ilk əsrlərdən meydana çıxmağa başlamış, onun gələcək tarixinin perspektivlərini müəyyənləşdirmişdir. “Dədə Qorqud”da türklər (1) islamı qəbul edərək (2) müasir dünyanın üzvi tərkib hissəsi olan bir cəmiyyət (3) kimi hərəkət etmək-dədirlər. Burada türkçülük, islam və müasirlik emosiya-inersiyası nə qədər güclü olsa da; nə türk şovinizmi, nə islam fundamentalizmi, nə də müasirlik kosmopolitizmi var.

Eposun min üç yüz illik yubileyini keçirən və bu genişmiqyaslı hərəkata bütün Azərbaycan ziyalılığını bir neçə il səfərbər edən Heydər Əliyev yaxşı bilirdi ki,

a) Azərbaycan xalqının

b) azərbaycançılıq ideallarının

c) və nəhayət, mənsub olduğu xalqın yüz illər boyu həsrətində olduğu bir hadisənin–azərbaycançılıq ideallarının gerçəkləşməsinin yubileyini keçirir.

Azərbaycan xalqının lideri Heydər Əliyev “Dədə Qorqud” eposunda ifadə olunmuş milli ideallarən nə qədər əsaslı, nə qədər perspektivli və nə qədər səmimi olduğunu bütün ruhu ilə duyurdu.

Ancaq o, tək olmamışdı… Onun özü də müdrik sələfləri kimi tarixin dərinliklərindən gəlirdi…

XIX əsrin sonu XX əsrin əvvəllərində azərbaycançılıq ideologiyasının nəzəri əsaslarını verən böyük mütəfəkkir Əli bəy Hüseynzadə də öz formuləsində (türkçülük, islamçılıq və müasirlik) bir də ona görə haqlı sayıla bilər ki, o, “Dədə Qorqud” eposu qədər səmimi olmuşdu…

“Dədə Qorqud” eposundakı azərbaycançılıq inersiya idi.

Əli bəy Hüseynzadə (və onun daha çox siyasətçi olan davamçıları) bu tarixi inersiyanı ideologiyaya çevirdilər.

Bütün bunların ardınca, tamamilə təbii olaraq, nə gəlməli idi?.. Azərbaycan xalqının tarixən mövcud olduğu coğrafiyanı ehtiva edən Azərbaycan dövləti uğrunda siyasi-ideoloji mübarizə!..

Etiraf etmək lazımdır ki, belə bir mübarizə aparıldı, özü də kifayət qədər güclü siyasi intellekt (və ehtirasla)!.. Bunun ən böyük göstəricisi yalnız Azərbaycan Demokratik Cümhuriyyətinin yaranması olma-

dı, Azərbaycanın tarixi ərazisində bir neçə müstəqil dövlətin qurulmasına da cəhdlər edildi… Ancaq imperialist qüvvələrin təzyiqi ilə qərarlaşan beynəlxalq "harmoniya" Azərbaycan xalqının tarixi ideallarının (və milli ideologiyasının) həyata keçməsinə nəinki mane oldu, keçən əsrin 20-ci, 30-cu illərindən başlayaraq hətta bu ideallarin (və milli ideologiyanın) üzərinə dağıdıcı hücumlar başladı…

Ona görə də xalqın tarixini (və ideallarını) dərk etmiş ziyalılar bir tərəfdən nə qədər xoşbəxt idilərsə, o biri tərəfdən ondan da artıq bədbəxt idilər… Azərbaycanın müstəqilliyinin ideoloqlarından olan türkçü gənc Cəfər Cabbarlı tədricən Azərbaycan sovet ədəbiyyatının banilərindən birinə çevrildi, Azərbaycan Demokratik Cümhuriyyətinin himninin musiqisini yazmış Üzeyir Hacıbəyli Azərbaycan SSR-in himninə də musiqi bəstələməli oldu.

Azərbaycan tarixinin dərinliklərindən gələn Səməd Vurğun özünün komsomol mənşəyi ilə fəxr eləməyə məcbur idi…

Azərbaycançılığın birinci tərkib hissəsi olan türkçülük 30-cu illərin ortalarından etibarən qadağan olundu. Və qadağaların miqyası o həddə çatdı ki, Azərbaycan xalqının birbaşa genotipinə – tarixi mənşəyinə müdaxilə edildi; israrla "sübuta" çalışdılar ki, Azərbaycan xalqı türk yox, İran mənşəlidir, sadəcə olaraq, orta əsrlərdə Azərbaycana gələn köçəri türklərin dilini qəbul etmişdir. Qəribəsi də o idi ki, böyük bir xalqın etnik tarixinin saxtalaşdırılması prosesi həm sovet, həm də İran Azərbaycanında eyni forma, məzmun və üsullarla aparılırdı. Xalqı öz etnik-mədəni kökündən (və tarixi mühitindən) məhrum etmək, milli yaddaşın daşıyıcılarını (böyük ziyalıları) məhv eləməklə imperialist rejimlər bütöv bir etnosdan idarə edilməsi asan olan kütlələr formalaşdırmağa qədər gedirdilər.

Bir dövrdə ki, xalqın tarixi taleyindən bəhs edən, onun ictimai-bədii təfəkkürünün yaratdığı ən böyük əsər – "Dədə Qorqud" eposu rəsmən qadağan olunur, deməli, həmin xalqın mənəviyyatına hər cür təcavüz üçün imkan verilir.

Azərbaycançılığın ikinci tərkib hissəsi olan islam dininə münasibət bundan da acınacaqlı idi. Sovetlər hər bir xalqın mühüm mənəvi göstəricilərindən biri olan dini hakimiyyətə gəldikləri ilk günlərdən qadağan elədilər.

Müasirlik (beynəlmiləlçilik) məsələsinə gəldikdə isə burada da böyük siyasi-ideoloji məhdudiyyət qoyuldu…

Və beləliklə, keçən əsrin 20-ci, 30-cu illərindən başlayaraq Azərbaycan xalqının həyatını idarə edən ideologiyalar onun milli tarixi ideallarına qarşı yönəldiyindən tamamilə antimilli (və antibəşəri!) xarakter daşıyırdı. Xalqın gələcəyi üçün təhlükəli olan bu şəraitdən xilas olmaq üçün cəhdlər edildimi?.. Əlbəttə, nə qədər böyük məhrumiyyətlərlə üzləşsə də Azərbaycan xalqı öz milli mənliyini heç zaman unutmamış, ən çətin şəraitlərdə belə gələcəyə yönəlik ideallarının itirilməsinə imkan verməmişdir. İctimai-siyasi (ideoloji!) özünütəsdiq uğrunda mübarizənin hüdudlandığı, yaxud qadağan olunduğu dövrlərdə xalq özünün varlığını dili, ədəbiyyatı və incəsənəti ilə təsdiq etməyə çalışmış, milli ideologiyanın əsaslarını həmişə sağlam saxlamışdır.

Təsadüfi deyildi ki, Azərbaycan sovet poeziyasının müqayisəsiz lideri Səməd Vurğunun "Azərbaycan" şeiri müstəqillik illərində ümummilli liderin dilindən məhz müstəqilliyimizin himni kimi səsləndi.

Mənsub olduğu xalqın tarixini (və milli tarixi ideallarını!) dərindən bilməklə yanaşı, uzun müddət sovet təhlükəsizlik orqanlarında xidmət etdiyindən, onun (xalqın) hansı məhrumiyyətlərə məruz qaldığı barədə geniş təsəvvürə malik olan və ən əsası, həmin məhrumiyyətlərdən çıxmağın yollarını

axtarıb tapmağa qadir siyasi mütəfəkkir kimi Heydər Əliyevin milli (və ümummilli!) lider mövqeyinə yüksəlməsi ilə azərbaycançılıq ideologiyasının tarixində yeni dövr başladı.

O zamana qədər azərbaycançılıq milli ideal (və ideologiya) olaraq

a) ilk orta əsrlərdən XIX əsrin sonlarına,

b) XIX əsrin sonlarından XX əsrin sonlarına qədər iki dövrdən keçmiş, millətin liderini formalaşdıracaq mənəvi-ideoloji qüvvəyə çevrilmişdi.

Azərbaycançılıq – Heydər Əliyevin genişmiqyaslı fəaliyyətinin, sadəcə, tərkib hissələrindən biri deyil, həmin fəaliyyətin (əslində, mübarizənin!) əsası, başqa sözlə, mahiyyətidir. Və bu, həm sovet dövründə, həm də müstəqillik illərində belə olmuşdur.

Sovet dövrünün milli idealların həyata keçirilməsi üçün olduqca məhdud şəraitdə Azərbaycan rəhbəri

- respublikanın iqtisadi-təsərrüfat həyatının canlandırılması,
- elmin, təhsilin inkişafı,
- ana dilinin, ədəbiyyatın, incəsənətin mövqeyinin yüksəldilməsi,
- milli hərbi kadrların yetişdirilməsi,
- Azərbaycanın beynəlxalq miqyasda tanıdılması və s. kimi əhəmiyyətli tədbirlər görmüşdür. Və böyük mütəfəkkir bütün bunları elə etmişdir ki, görülən tədbirlər sovet rejiminin əks reaksiyası, dağıdıcı müqaviməti ilə qarşılaşmasın. Azərbaycanın yeni rəhbəri yaxşı bilirdi ki, onun ürəyində millət sevgisi olan yaxın sələfləri çox zaman məhz siyasi-ideoloji manevr imkanlarının olmaması ucbatından həm özlərini, həm də xalqı problemlər qarşısında qoymuşlar… Bütün ideologiyalar kimi azərbaycançılığın da heç zaman dəyişməyən metafizikası vardır, bununla belə o da inkişaf edən, müasirləşən, dövrün müxtəlifmiqyaslı konyunktur təzyiqləri ilə hesablaşan bir ideologiyadır. Azərbaycan xalqının ümummilli lideri öz tarixi fəaliyyətində azərbaycançılıq ideologiyasının dəyişməyən metafizikasından çıxış etməklə, ona əsaslanmaqla yanaşı, həyata keçirilmə iyerarxiyasına, metodlarına da xüsusi önəm vermişdir.

Bütün bunları nəzərə alaraq deyə bilərik ki, Heydər Əliyev XX əsrin sonu XXI əsrin əvvəllərində

1) azərbaycançılıq ideologiyasının öz təbii gücündə təzahürü üçün mədəni-mənəvi, ictimai-siyasi və ideoloji mühit yaratdı;

2) milli (ümummilli) lider olaraq həmin ideologiyanın nəzəri-metodoloji baxımdan inkişafına, zənginləşməsinə əhəmiyyətli töhfələr verdi;

3) və başlıcası, azərbaycançılığı müstəqil Azərbaycan dövlətinin ideologiyasına çevirdi.

Və beləliklə, yüz illər boyu mənəvi-mədəni (etnoqrafik), on illər boyu siyasi mübarizə həyatı yaşamış bir ideologiya qalib gələrək öz tarixinin yeni epoxasına daxil oldu. Ümummilli liderin bir tarixi xidməti həmin missiyanı reallaşdırmaq idisə, ikinci missiyası da azərbaycançılıq ideologiyası qarşısında yeni perspektivlər, üfüqlər açması oldu. Bu gün Azərbaycan xalqı məhz Heydər Əliyevin ardıcıl mübarizəsi ilə formulə edilən, elmi-nəzəri (və praktik!) baxımdan komplektləşdirilən mükəmməl bir ideologiyaya malikdir; azərbaycançılıq öz metafizik gücünü bütünlüklə qoruyub saxlamaqla yanaşı, inkişaf edib müasirləşir:

1. Azərbaycan Respublikası Azərbaycan xalqının əsrlər boyu daşıdığı mənəvi, siyasi-ideoloji ideallarının məhsuludur. Azərbaycan Respublikası ərazisində yaşayan digər xalqlarla birgə azərbaycanlılar öz müstəqil dövlətlərinin təəssübkeşi olaraq siyasi müqəddəratlarını təmin etmişlər.

Həm öz tarixi vətənlərində yaşayan, həm də dünyanın müxtəlif yerlərinə səpələnmiş azərbaycanlılar Azərbaycan Respub-

likasını özlərinin ata yurdu saymalı, məskun olduqları dövlətin qayda-qanunlarına riayət etməklə yanaşı, öz milli kimliklərini unutmamalıdırlar. Və nəinki unutmamalı, mənsub olduqları xalqın tarixi idealları uğrunda mübarizə aparmaqdan çəkinməməlidirlər.

2. Azərbaycan xalqı türk xalqlarından biridir, Türk dünyasının üzvi tərkib hissəsidir…

Bununla belə, Azərbaycan xalqının tarixən müəyyənləşmiş özünəməxsusluqları vardır ki, həmin özünəməxsusluqlar heç bir halda türklüyü istisna etmir, əksinə, zənginləşdirir.

Müasir türk xalqlarının (və dövlətlərinin) inteqrasiyası onların kökcə birliyindən və orta əsrlərdən etibarən meydana çıxmış, sabitləşmiş özünəməxsusluqlara qarşılıqlı hörmətdən keçir.

3. Türk xalqlarının əksəriyyəti kimi azərbaycanlılar da islam dinini qəbul etmiş, müsəlman dünyasının tərkibinə daxil olmuşlar.

Azərbaycan xalqı öz dini-mənəvi dəyərlərilə fəxr etməklə bərabər dünyanın bütün humanist dini dəyərlərinə hörmətlə yanaşır.

4. Azərbaycan xalqı bütün tarixi boyu müasir dünya mədəniyyətinə, modern texnologiyaya, beynəlmiləl münasibətlərə maraq göstərmişdir, özünü dünyadan heç zaman təcrid etməmişdir.

Bu gün də biz öz uğurlarımızı (və problemlərimizi), bir qayda olaraq, dünya miqyasında dəyərləndiririk. Azərbaycanın son illər, xüsusilə iqtisadi sahədə qazandığı tarixi nailiyyətlər beynəlxalq səviyyədə etiraf olunur (və böyük rezonans verir).

Heydər Əliyevdən sonra azərbaycançılıq ideologiyasının Heydər Əliyev dövrü davam edir. Azərbaycan Prezidenti, Azərbaycan xalqının yeni lideri İlham Əliyev azərbaycançılıq metafizikasının inkişafı üçün üç məqama, fikrimizcə, daha çox önəm verməkdədir:

1. Azərbaycanı iqtisadi, ictimai və mədəni inkişafına görə dünyanın nüfuzlu ölkələri səviyyəsinə qaldırmaqla Azərbaycan insanına zaman-zaman təlqin edilmiş ikinci, üçüncü… dərəcəlilik kompleksini aradan qaldırmaq.

2. Vətənpərvərlik hislərini gücləndirməklə xalqın tarixi ideallarının tam miqyasda həyata keçirilməsi üçün mənəvi potensiya hazırlamaq.

3. Və nəhayət, azərbaycançılığı müdafiə olunan hadisədən hücum edən hadisəyə çevirmək.

Biz hər əsrdə, hər onillikdə bir ideologiyanı mənimsəyən xalqlardan deyilik, ona görə də hər onilliyin, hər əsrin konyunkturunu qəbul edib milli ideologiyamızın metafizikasından imtina etməmişik… Bizim türkçülüyümüz türklüyümüzdən, müsəlmançılığımız müsəlmanlığımızdan, müasirliyimiz (beynəlmiləlçiliyimiz) isə modernliyimizdən (və humanizmimizdən) irəli gəlir. Əsas üstünlüyümüz isə ondadır ki, biz bu üç tarixi əlamətimizi bir milli xarakterə (missiyaya) çevirə, xalqımızın bütöv bir həyat idealı olaraq dərk edə və “bizim siyasətimiz bizim işimizdir” (İlham Əliyev) deyə bilmişik…

Azərbaycançılıq heç bir xalqın humanist (milli) ideallarına qarşı çıxmamışdır, bu gün də çıxmır… Və gələcəkdə də çıxmayacaqdır. Ancaq tarix Azərbaycan xalqına edilmiş çoxsaylı təcavüzlərin şahididir. Bircə faktı xatırlatmaq kifayətdir ki, Azərbaycan xalqı öz müstəqil dövlətini tarixi ərazisinin hələlik yalnız beşdə birində qurmağa nail olmuşdur… Ona görə də azərbaycançılıq ideologiyası mənsub olduğu millətin təbii hüquqları uğrunda hələ çox döyüşməli, tarixin səhvlərini düzəltməli olacaqdır.

***Təhsilin inkişafı üzrə Dövlət Strategiyası***

# DÖVLƏT STRATEGİYASI PEŞƏ-İXTİSAS TƏHSİLİNDƏ KÖKLÜ İSLAHATLAR TƏLƏB EDİR

**Rəsul Əsgərov**
***Təhsil Problemləri İnstitutunun peşə-ixtisas təhsili şöbəsinin müdiri, əməkdar müəllim***

**Malik Qurbanov**
***həmin institutun böyük elmi işçisi***

***Açar sözlər:*** *peşə təhsili, strategiya, beynəlxalq təcrübə, texnologiya, proqram, kadr hazırlığı.*

***Ключевые слова:*** *профессиональная учеба, стратегия, международный опыт, технология, программа, кадровая подготовка.*

***Key words:*** *vocational education, strategy, international practice, technology, program, training of personnel.*

Ölkəmizdə gerçəkləşdirilən islahatlar və genişmiqyaslı infrastruktur layihələri, dayanıqlı makroiqtisadi yüksəlişin təmini, yoxsulluğun azaldılması, iqtisadiyyatın diversifikasiyası və onun dünya iqtisadi sisteminə inteqrasiyası insan potensialının inkişafı üzrə qəti tədbirlərin həyata keçirilməsini tələb edir. Bu isə öz növbəsində təhsilin keyfiyyətinin yüksəldilməsi və rəqabət qabiliyyətli kadr potensialının hazırlanması ilə bağlıdır. Göstərilən məsələlərin həlli üçün zəruri şərt ilk peşə-ixtisas təhsili sistemində kadr hazırlığının əmək bazarının tələblərinə uyğunluğunun təmin edilməsidir.

Azərbaycan Respublikası Prezidentinin 2013-cü il 24 oktyabr tarixli Sərəncamı ilə təsdiq edilmiş "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası" Azərbaycan Respublikasında, keyfiyyət nəticələri və əhatəliliyinə görə dünya ölkələri sırasında aparıcı mövqe tutan, səriştəli müəllim və təhsil menecerlərinə, qabaqcıl texnologiyalara əsaslanan infrastruktura malik təhsil sisteminin yaradılması üçün aşağıdakı beş strateji istiqamətdə genişmiqyaslı tədbirləri nəzərdə tutur:

• Səriştəyə əsaslanan şəxsiyyətyönlü təhsil məzmununun yaradılması.

• Təhsilalanların fərdi xüsusiyyətlərini nəzərə alan innovativ təlim metodları və texnologiyaları vasitəsilə təhsilin məzmununun səmərəli mənimsənilməsini təmin edən yüksəknüfuzlu təhsilverənin formalaşdırılması.

• Təhsilin nəticələrə görə cavabdeh, şəffaf və səmərəli tənzimləmə mexanizmlərinə malik, dövlət-ictimai xarakterli və dövlət-biznes partnyorluğuna əsaslanan idarəetmə sisteminin formalaşdırılması.

• Müasir tələblərə cavab verən və ömürboyu təhsili təmin edən təhsil infrastrukturunun yaradılması.

• Təhsilin dayanıqlı və müxtəlif mənbələrdən istifadə olunmaqla yeni maliyyələşdirmə mexanizminin yaradılması.

Beynəlxalq təcrübəyə əsaslanan ilk peşə-ixtisas təhsili sisteminin islahat siyasəti və strategiyasının mərkəzində bacarıqların inkişaf etdirilməsi, onun əmək bazarının

tələbatlarına və iş yerində əmək fəaliyyətinin məqsədlərinə istiqamətlənmiş sistemə çevrilməsidir. Bu cür sistem, əsasən, təlimin razılaşdırılmış nəticələrindən və təlim prosesinin keyfiyyətindən çıxış edərək formalaşdırılmalıdır.

Dövlət Strategiyasının mühüm xüsusiyyətlərindən biri də ondan ibarətdir ki, ilk peşə-ixtisas təhsili sistemində tədrisin məzmununun müasirləşdirilməsi əmək bazarının geniş müstəvisində əhatə olunur. Bu, o deməkdir ki, istər iqtisadi, istərsə də sosial baxımdan uğurlu və səmərəli peşə təhsili sisteminin formalaşması və fəaliyyət göstərməsinə zəmanət olan zəruri şərtlərdən biri ilk peşə-ixtisas təhsilinin məzmununun müasir əmək bazarının tələblərinə uyğunlaşdırılmasıdır.

Son zamanlar Azərbaycan Respublikası Təhsil Nazirliyinin dəstəyi ilə ilk peşə-ixtisas təhsili sahəsində bir sıra pilot layihələr həyata keçirilmişdir.

Belə ki, 2013-2014-cü tədris ilindən ilk peşə-ixtisas təhsili müəssisələrinin infrastrukturunun inkişafına yönəlmiş və dövlət-biznes partnyorluğuna əsaslanan sosial xarakterli Müasir Azərbaycan Peşəkarları Layihəsinin icrasına başlanılıb. Layihə peşə təhsili sisteminin əhatə dairəsinin genişləndirilməsinə və kadr hazırlığı prosesinin keyfiyyətinin yüksəldilməsinə xidmət edir. Bu layihə çərçivəsində müxtəlif dövlət və özəl, o cümlədən xarici tərəfdaşlarla əməkdaşlıq qurularaq bir sıra ilk peşə-ixtisas təhsili müəssisələrinin bazasında resurs mərkəzləri yaradılıb.

Təhsil Nazirliyi kənd təsərrüfatı sahəsi üzrə ixtisaslaşmış ilk peşə-ixtisas təhsil müəssisələrinin maddi-texniki və tədris bazasının müasir tələblərə uyğunlaşdırılması məqsədilə yeni texnika, avadanlıq, əyani və texniki vasitələrin alınması prosesinə start verib.

Bütün bunlarla yanaşı, Dövlət Strategiyasında göstərildiyi kimi, bu sahədə həlli vacib olan ciddi problemlər hələ də qalmaqdadır. İlk peşə-ixtisas təhsili müəssisələrini bitirən şəxslərin sayı iqtisadiyyatın tələbatı ilə üst-üstə düşmür. Son illər ümumi təhsil müəssisələrini bitirən məzunların yalnız 11 faizinin ilk peşə-ixtisas təhsili müəssisələrini seçməsi, ümumilikdə həmin pillədə təhsilalanların cəmi 25-27 min nəfər təşkil etməsi əhalidə ilk peşə-ixtisas təhsilinə marağın aşağı olduğunu göstərir.

Dövlət Strategiyasında qeyd edildiyi kimi, ilk peşə-ixtisas və orta ixtisas təhsili kurikulumları müasir tələblərə cavab vermir. İlk peşə - ixtisas təhsilinin məzmununun təkmilləşdirilməsinə işəgötürənlərin cəlb olunması çox aşağı səviyyədədir. İşəgötürənlər kadr hazırlığı prosesində iştirak etmək, hazırlanan kadrlara dair şərtlər irəli sürmək imkanına malik olmalı və buna müvafiq olaraq cavabdehliyini dərk etməlidir.

Dövlət Strategiyası ilk peşə-ixtisas təhsili qarşısında daha mühüm vəzifələr qoyur. Bu Dövlət sənədinə əsasən keyfiyyətli və səmərəli ilk peşə-ixtisas təhsili sisteminin formalaşması üçün onun müasirləşdirilməsi istiqamətində təxirəsalınmaz işlər görülməlidir. Yeni texnologiyaları mənimsəyən, ölkənin xarici əmək bazarında rəqabət qabiliyyətinin artmasını və milli iqtisadiyyatın qlobal iqtisadi sistemə inteqrasiyası prosesini təmin edən kadrların hazırlanması məsələlərinin həllinə bütün maraqlı tərəflər (işəgötürənlər, ilk peşə-ixtisas təhsili müəssisələri, həmkarlar təşkilatları, cəmiyyət və s.) cəlb olunmalıdır.

Hazırda Azərbaycan Respublikası Təhsil Nazirliyinin 24 sentyabr 2012 – ci il tarixli 1518 nömrəli əmrinə müvafiq olaraq ilk peşə-ixtisas təhsili müəssisələri tərəfindən hazırlanan və pedaqoji şuralarda baxılıb bəyənilən, razılaşdırmaq üçün Təhsil Problemləri İnstitutuna və Təhsil Nazirliyinə göndərilən mövcud tədris plan və proqramlar fənyönümlü olduqlarından əmək bazarının müasir tələblərini ödəmir. Həmin fənyönümlü tədris plan və proqramların ilk peşə - ixtisas təhsili müəssisələrində tətbiqi zamanı

çoxlu nöqsanlara yol verildiyini nəzərə alsaq, mövcud formada onların keyfiyyətə necə mənfi təsir göstərməyini anlamaq çətin deyil. Nəticədə ilk peşə-ixtisas təhsilinin keyfiyyəti zamanın tələblərindən geri qalır. Peşə təhsilinə maraq azalır, yaxud peşə ixtisas təhsili almış şəxs əmək bazarında özünə iş tapa bilmir.

Vəziyyətdən yeganə çıxış yolu Dövlət Strategiyasının tələblərinə uyğun olaraq ilk peşə-ixtisas müəssisələrindəki mövcud fənyönümlü tədris plan və proqramlarını qabaqcıl ölkələrin təcrübəsində təsdiqini tapmış Kompetensiyalara Əsaslanan Modul tipli təhsil proqramları ilə əvəz etməkdir. Bu proses 120 ixtisas qrupu üzrə 700 – dən çox ixtisas üçün nəzərdə tutulduğundan və böyükhəcmli olduğundan müəyyən vaxt və vəsait tələb edir. Fikrimizcə, peşə ixtisas təhsili üzrə bu sahədə kifayət qədər potensial imkanı və təcrübəsi olan Təhsil Problemləri İnstitutunun əməkdaşları, işəgötürənlər, ilk peşə-ixtisas təhsili müəssisələri və digər maraqlı tərəflərin peşəkar nümayəndələrinin birgə səyi ilə bu işin öhdəsindən müvəffəqiyyətlə gəlmək olar.

Hazırlanmış təhsil proqramlarına (kurikulumlara) uyğun müasir dərslik və dərs vəsaitlərinin hazırlanması üçün də Dövlət Strategiyasında göstərildiyi kimi əməli tədbirlər həyata keçirilməlidir. Ona görə də yeni təhsil proqramlarına (kurikulumlara) əsaslanan müasir dərsliklərin, elektron resursların və tədris vəsaitlərinin hazırlanması və ilk peşə-ixtisas təhsili müəssisələrində alternativ dərsliklərdən istifadə mexanizminin yaradılması məqsədə müvafiqdir.

İlk peşə-ixtisas təhsili üzrə keçmiş sovet məkanında Azərbaycan dilində dərsliklərin olmaması problemi yalnız ölkəmiz müstəqillik qazandıqdan sonra həll edilməyə başlandı. Belə ki, son illərdə ilk peşə təhsili üzrə Azərbaycan dilində 33 adda dərslik və 8 adda dərs vəsaiti çap edilib peşə təhsili müəssisələrinə paylansa da problem tam həll edilməmişdir. Bu məsələ ilə əlaqədar ilk peşə-ixtisas təhsili müəssisələrinin kitabxanalarının da yenidən qurulmasına ciddi ehtiyac vardır.

Dövlət Strategiyasında xüsusi qayğıya ehtiyacı olanların təhsilinə, o cümlədən onların peşə təhsilinə xüsusi yer verilmişdir. Ona görə də:

• Xüsusi qayğıya ehtiyacı olan şəxslərin peşə hazırlığı və əlavə təhsilə cəlb edilməsi sahəsində tədbirlərin həyata keçirilməsi;

• onların cəmiyyətə inteqrasiyasının təmin edilməsi, seçdikləri ixtisaslar üzrə işləmələri üçün müvafiq tədbirlərin görülməsi;

• əlillər üçün fərqli (xüsusiləşdirilmiş) peşə təhsili proqramlarının (kurikulumların) hazırlanması və tətbiqi;

• işaxtaran gənclərin və evdar qadınların peşə hazırlığı və əlavə təhsilini təmin etmək məqsədi ilə müvafiq kursların təşkili və digər tədbirlərin həyata keçirilməsi;

• qaçqın və məcburi köçkünlər üçün peşə hazırlığını təmin etmək məqsədi ilə müvafiq tədbirlərin həyata keçirilməsi;

• cəzaçəkmə müəssisələrindəki, həmçinin cəzaçəkmə müəssisələrindən azad edilmiş şəxslərin məşğulluğunun təmin edilməsi məqsədi ilə peşə hazırlığı kurslarının təşkili və s. kimi məsələlər maraqlı tərəflərin diqqət mərkəzində olmalıdır.

Dövlət Strategiyasının tələbləri baxımından ilk peşə-ixtisas təhsili sahəsində islahatlar aparılmasında ən vacib amillərdən biri də müəllim heyətinin pedaqoji keyfiyyəti və ixtisaslarıdır. İşəgötürənlərin tam etibar etdiyi yüksək səviyyədə təhsil almış bacarıqlı müəllimlər olmadan digər amillərin, məsələn, işəgötürənlərin ehtiyaclarına uyğun səriştəyə əsaslanan təhsil proqramlarının (kurikulumların) və tədris – maddi bazanın yüksək təchizatının sistemə təsiri az olacaq. Peşə təhsili müəssisələrinin rəhbər və mühəndis – pedaqoji işçilərinin ilkin və fasiləsiz peşə təhsili (FPT) nümunəvi səviyyədə olmasa, onlar işəgötürənlərin mövcud və gələcək tələblərini ödəyə bilməzlər.

Hazırda Azərbaycanda ilk peşə-ixtisas

təhsili sahəsində ixtisas fənn müəllimləri və istehsalat təlimi ustaları üçün ilkin təlim mövcud deyildir. İlk peşə-ixtisas təhsili müəssisələrində də əksər ixtisas fənn müəllimləri və istehsalat təlimi ustaları (bundan sonra ixtisas müəllimləri adlandırılacaq) müxtəlif universitetləri və orta ixtisas təhsili müəssisələrini bitirmiş və müəllim üçün vacib olan müasir təlim-tədris metodologiyası üzrə bilik və bacarıqlara malik deyillər.

Ona görə də təhsilalanlarla münasibət qurmaqda çətinliklərlə üzləşir və təhsilalanlara verilən təhsilin səviyyəsi qənaətləndirici olmur. Qeyri-pedaqoji ali və orta ixtisas təhsili müəssisələrində pedaqogika və təlim metodikası tədris edilmir.

Beləliklə, peşə təhsili müəssisələrində ixtisas fənn müəllimləri ali təhsilli, istehsalat təlimi ustaları isə ali və ya orta ixtisas təhsilli olsalar belə, onların təlim texnologiyaları barədə anlayışları kifayət deyildir. Təlim almış peşəkar müəllim hədəf auditoriya üçün ən uyğun yanaşmanı seçməyi bacarmalıdır. Mövcud sistemdə isə əsas diqqət hələ də sinif otaqlarında mühazirələr vasitəsilə biliklərin ötürülməsinə və praktik dərslərin emalatxanalarda tədris edilməsinə yetirilir. Belə metodologiya hədəf auditoriyanın ehtiyaclarına uyğun deyildir.

Odur ki, ilk peşə-ixtisas təhsili müəssisələrinin ixtisas fənn müəllimləri və istehsalat təlimi ustalarının yenidənhazırlanmasını və ixtisasının artırılmasını həyata keçirəcəyi baza təhsil müəssisələri və biznes qurumlarının müəyyən edilməsi və onların bazasında müəllim və ustalar üçün mütəmadi olaraq seminar – treninqlərin keçirilməsinə ehtiyacları vardır.

İlk peşə-ixtisas təhsili müəssisələrində şagirdlərin öz təhsillərinə görə daha çox məsuliyyət daşıması məqsədi ilə təkcə müəllimin onlara verdiyi məlumat və biliklərdən asılı olmamaları üçün daha müvafiq tədris mühiti yaratmağa nail olmalıyıq. Şagirdləri öz ixtisasları və pedaqoji sahədəki yeniliklərlə çevik formada tanış etmək, bu yeniliklərin təlim prosesinə operativ olaraq tətbiqinə nail olmağın əhəmiyyəti təkzib edilməzdir.

Ona görə ki, ilk peşə-ixtisas təhsili müəssisələrinin rəhbər və mühəndis – pedaqoji işçilərinin mövcud ixtisasartırma sistemi sürətlə dəyişən, inkişaf edən və diversifikasiyaya məruz qalan iqtisadi mühitdə müasir fasiləsiz peşə təhsilini təmin etmir.

İlk peşə-ixtisas təhsili müəssisələrinin rəhbər və mühəndis – pedaqoji işçilərinin əksəriyyəti öz tədris sahələri və ya təlim-tədris metodologiyaları üzrə müasir biliklərə malik deyillər. Müsbət təcrübəni bir peşə təhsili müəssisəsindən digərlərinə ötürmək üçün mexanizm mövcud deyil. Uzaq regionlardan Bakıya kurslara gəlmək vaxt və maliyyə vəsaiti tələb edir. Təlimin məqsədi çox vaxt mücərrəd qalır. Təlimçi isə konkret kompetensiyalara malik şəxs olmadığından kursun mahiyyətini dinləyicilərə çatdıra bilmir.

Ali təhsil müəssisələrində peşə təhsili müəssisələri üçün mühəndis-pedaqoji kadrların hazırlanması da Dövlət Strategiyasından irəli gələn məsələlərdəndir.

Çünki bu gün ali təhsil müəssisələrində peşə təhsili müəssisələri üçün müəllim hazırlanmadığından bu vəzifəyə cəlb edilən müəllimləri çox böyük problemlər qarşısında qoyur. Həmin müəllimlər pedaqogika, psixologiya və metodikanın əsaslarını bilmədiklərindən təhsilalanlarla münasibət qurmaqda, onların fəaliyyətini istiqamətləndirməkdə xeyli çətinlik çəkirlər.

Dövlət Strategiyasının əsas istiqamətlərindən biri olan təhsilin nəticələrinə görə cavabdeh, şəffaf və səmərəli tənzimləmə mexanizmlərinə malik, dövlət-ictimai xarakterli və dövlət-biznes partnyorluğuna əsaslanan idarəetmə sisteminin formalaşdırılması istiqaməti peşə təhsili sahəsində işəgötürənlərlə əlaqələrin yaradılmasının, idarəetmənin beynəlxalq təcrübəyə əsaslanaraq yenidən qurulmasını tələb edir.

Azərbaycanın bugünkü sosial-iqtisadi inkişaf templəri, iqtisadiyyatda baş verən struktur dəyişiklikləri və texnologiyaların

inkişafı yaxın gələcəkdə peşə təhsilli mütəxəssislərə böyük tələbatın olacağını göstərir. Odur ki, ölkə iqtisadiyyatının rəqabət qabiliyyətli ixtisaslı kadrlarla təmin olunması üçün hər şeydən əvvəl dinamik təhsil sistemi yaradılmalı və bu, ilk növbədə, əmək bazarının tələblərini nəzərə ala bilən peşə təhsilində baş verməlidir. Milli iqtisadiyyatın müxtəlif sahələri üçün kadr hazırlığının keyfiyyətinin yüksəldilməsi əmək fəaliyyətinə və onun yerinə yetirilməsinin keyfiyyətinə tələblərin nəzərə alınması şəraitində mümkündür. Bununla əlaqədar işəgötürənlərin peşə təhsili müəssisələri məzunlarının əmək potensialı üzərinə qoyduğu tələbləri nəzərə alan yeni yanaşmaların, alətlərin və meyarların peşə təhsili sisteminin müasirləşdirilməsində tətbiqi kifayət qədər aktual məsələdir. Əmək bazarı şəraitində yalnız işəgötürənlərlə sıx tərəfdaşlıq edərək tələb edilən sayda və lazımi keyfiyyətə malik mütəxəssis hazırlığını həyata keçirmək mümkündür. Sosial tərəfdaşlıq sistemi ilk peşə-ixtisas təhsili müəssisələrinə işəgötürənlərin ehtiyaclarının daha dolğun nəzərə alınmasına imkan yaradaraq əmək bazarının konyunkturundakı dəyişikliklərə reaksiya vermək imkanı yaradır. Peşə təhsili səviyyəsinin qənaətbəxş olmaması sahibkarlığın və biznesin inkişafına mane olur.

Digər tərəfdən, əmtəə və xidmətlərin keyfiyyət normalarının dəyişməsi, texnologiyaların mürəkkəbləşməsi, rəqabətin artması peşə təhsilli kadrların peşə bacarıqlarına və səriştələrinə yeni yanaşmaların tətbiqini tələb edir. Artıq işəgötürənlər də başa düşürlər ki, dünya iqtisadi məkanına inteqrasiya prosesində işçi qüvvəsinin, xüsusilə də ilk peşə - ixtisas təhsilli kadrların ixtisasının qəbul edilmiş tələblərə cavab verməməsi özünü daha qabarıq şəkildə göstərəcəkdir. Odur ki, peşə təhsili müəssisələri biznes qurumları ilə daha sıx əməkdaşlıq etməli və əmək bazarında tələb edilən bilik və peşə bacarıqlarını dərhal kadr hazırlığı prosesində tətbiq etməlidirlər.

Peşə təhsili müəssisələrində kadr hazırlığı və göstərilən xidmətlər biznesin sürətlə dəyişən ehtiyaclarını ödəməyə yönəlməli, məzunlar isə işlə təmin olunmalıdırlar. Eyni zamanda peşə təhsili sistemi yerli işçi qüvvəsinin fasiləsiz peşə təhsilini təmin etməlidir.

Planlı iqtisadiyyat sistemində əsas əmək potensialını formalaşdıran təhsil sistemi ilə istehsalat arasında sıx əlaqə mövcud idi. Bu əlaqə istehsalat və peşə hazırlığı sistemləri arasında kəsilməz informasiya axını yaradırdı ki, bu da nəinki istehsalatın ayrı-ayrı sahələrinin, hətta konkret müəssisələrin tələbatına uyğun olaraq əmək bazarının planlaşdırılması və proqnozlaşdırılmasını təmin edirdi.

Təhsilimizin digər pillələrindən fərqli olaraq ilk peşə-ixtisas təhsili müəssisələrinin bir başa metodiki xidmət orqanları yoxdur. Məsələn, ümumi təhsil məktəbləri üçün rayon (şəhər) təhsil şöbələri yanında metodiki mərkəzlər, orta ixtisas təhsili müəssisələrində metod kabinetlər fəaliyyət göstərir. İlk peşə-ixtisas təhsili sahəsində bu vəzifələri hazırda əlavə iş kimi Təhsil Problemləri İnstitutunun İlkin Peşə Təhsilinin İnkişaf Mərkəzi həyata keçirir. Fikrimizcə, ilk peşə-ixtisas təhsili müəssisələri ilə bağlanmış müqavilələr əsasında məsləhətçilərə ehtiyac var. Təhsil müəssisəsində işin cari, perspektiv və strateji planlaşdırılması barədə sualların operativ cavablandırılmasına böyük ehtiyac vardır. İlkin Peşə Təhsilinin İnkişaf Mərkəzində təcrübəli işçi qrupunun özəyi formalaşıb. Onların köməyi ilə bu işin öhdəsindən gəlmək olar.

İlk peşə-ixtisas təhsili sistemindəki problemləri müvəffəqiyyətlə həll etməkdə əsas vasitə bu təhsil pilləsində dövlətin və özəl sektorun rolunun nəzərdən keçirilməsi və yenidən bölüşdürülməsidir. Bazar iqtisadiyyatına keçdikdən sonra peşə təhsilində dövlət və özəl sektorun rolunu və bazarın ehtiyaclarına uyğun peşə təhsili strategiyasını özəl sektorun inkişaf səviyyəsi, miqyası və nə dərəcədə güclü olması müəyyən edir.

İlk peşə-ixtisas təhsili müəssisələri əsasən dövlət vəsaiti (dövlət büdcəsi) hesabına maliyyələşdirilir. Müəssisənin büdcəsinin çox cüzi hissəsi təhsil haqqları, şagirdlərin istehsalat təcrübəsindən gələn gəlir və büdcədənkənar gəlir fəaliyyətlərindən (məhsulların və xidmətlərin satışı və qısamüddətli kurslar) toplanır.

İlk peşə-ixtisas təhsili müəssisələrinə dövlət büdcəsinin ayrılması illik büdcələşdirmə prosesi vasitəsilə aparılır. Büdcədənkənar gəlir gətirən fəaliyyət növləri hələ tam öyrənilməmiş maliyyə mənbəyidir. Qeyd etmək lazımdır ki, Nazirlər Kabinetinin 19 yanvar 2010-cu il tarixli 10 nömrəli qərarı ilə təhsil müəssisəsinin əlavə gəlir əldə etmək məqsədi ilə məşğul olmasına yol verilən sahibkarlıq fəaliyyəti növləri müəyyən edilmişdir.

Müşahidələr göstərir ki, mövcud büdcə sistemi daxilində ilk peşə-ixtisas təhsili müəssisələri, ümumiyyətlə, əlavə gəlir fəaliyyətləri vasitəsilə əhəmiyyətli məbləğ toplamağa qadir deyil.

Birincisi, ilk peşə-ixtisas təhsili müəssisələri işəgötürənin malik olduğu və ya investisiya qoyacağı müasir maddi-texniki bazaya malik deyil. Buna görə də işəgötürənlər ilk peşə-ixtisas təhsili müəssisələrinə uyğun və cəlbedici tərəfdaş kimi baxmır.

Büdcədənkənar gəlirlər ilk peşə-ixtisas təhsili müəssisələri üçün əlavə maliyyə mənbəyinə çevrilməzdən öncə, onlara ayrılan dövlət büdcəsinin azaldılmayacağı razılaşdırılmalı və paralel olaraq ilk peşə - ixtisas təhsili müəssisəsinin özünüidarəetməsi artırılmalıdır.

İlk peşə-ixtisas təhsili müəssisəsinin maliyyələşdirilməsinə təsir edən faktorlardan biri də şagird/müəllim nisbətidir. Belə ki, Azərbaycan sistemində hər 6-7 nəfər tələbəyə bir müəllim düşür. Bu göstərici beynəlxalq müqayisədə çox yaxşı nisbətdir. Lakin şagird/müəllim nisbətinin aşağı olması keyfiyyətli təhsil demək deyil. Maliyyə nöqteyinəzərindən bu, o deməkdir ki, nəticələr xərclərə nisbətdə eyni deyil.

Əminik ki, möhtərəm Prezidentimiz İlham Əliyevin imzaladığı "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası" uğurla həyata keçirilərək, respublikamızda təhsilin, o cümlədən onun mühüm hissəsi olan ilk peşə-ixtisas təhsilinin inkişafına böyük təkan verəcək, doğma Azərbaycanımızda sənətkar hazırlığı məsələləri zamanın tələblərinə cavab verəcəkdir.

*Rəyçi: prof. M.İlyasov*

**İstifadə edilmiş ədəbiyyat**


1. Təhsil haqqında Azərbaycan Respublikasının Qanunu. Bakı, 2009.
2. Azərbaycan Respublikasının təhsil sahəsində İslahat Proqramı. Bakı: Çaşıoğlu, 1999.
3. Azərbaycan Respublikasında ümumi təhsilin Konsepsiyası (Milli Kurikulumu). Bakı, 2006.
4. "Azərbaycan Respublikasının Məşğulluq Strategiyası (2005-2006-cı illər)". Bakı, 2005.
5. "Azərbaycan Respublikasının Məşğulluq Strategiyasının həyata keçirilməsi üzrə Dövlət Proqramı (2007-2010-cu illər)". Bakı, 2007.
6. Azərbaycan Respublikasında texniki peşə təhsilinin inkişafı üzrə Dövlət Proqramı (2007-2012-ci illər)". Bakı, 2007.
7. Abbasov Ə. Təhsil İslahatı və kurikulumların hazırlanması problemi. ARTPİ-nin "Elmi əsərlər"i, Bakı, 2005.
8. Ağayev Ə. Yeni təlim metod və texnologiyalarının nəzəri və praktik məsələləri. ARTPİ-nin "Elmi əsərlər"i. Bakı, 2005.
9. Bayramov Ə., Əlizadə Ə. Sosial psixologiya. Bakı: Qapp Poliqraf, 2003.
10. Qəndilov R., Əliyev A. Təhsildə yeni informasiya və kommunikasiya texnologiyaları: problemlər, prioritetlər. ARTPİ-nin "Elmi əsərlər"i. Bakı, 2003.
11. Рамазанов А., Аскеров Р. и др.

Профессиональное Образование и Обучение на Южном Кафказе: на пути от выживания к эффективному функционированию национальных систем. Баку, 2008.

12. Əlizadə Ə. Müasir Azərbaycan məktəbinin psixoloji problemləri. Bakı: Pedaqogika, 2004.

13. Олейникова О., Муравьева А., Аксенова Н. Обучение в течение всей жизни и профессиональное образование. Москва, 2011.

14. Олейникова О. и д. Разработка модульных программ, основанных на компетенсиях Москва: Альфа-М, 2005.

**Р.Аскеров,**
**М.Курбанов**

**Государственная Стратегия требует коренных реформ в профессионально-специализированном образовании**

**Резюме**

В статье отражены важные вопросы, поставленные перед начальными профессиональными школами, исходящие из утверждённого 24 октября 2013-года Распоряжения Президента Азербайджанской Республики о "Государственной Стратегии в развитии образования Азербайджанской Республики".

Анализируя положение учебного процесса на сегодняшний день, кадровый потенциал, финансовые ресурсы, техническое снабжение профессиональных училищ и лицеев, готовящих специалистов, авторы пришли к выводу, что в первую очередь должны измениться настоящие учебные программы. Из-за предметонаправленности этих программ обучающиеся не могут окончательно освоить компетенции, нужные для усвоения профессии.

Несмотря на полученные ими дипломы, работодатели им не доверяют, не хотят обеспечить работой. Наконец, эти люди, оставшиеся без работы, из-за дефектов в учебной программе, не могут создать себе карьеру.

Авторы, пришедшие к выводу, что "Модульная Технология", основанная на компетенциях, сыграет особую роль в подготовке специалистов, предлагают возможно скорее отказаться от предметонаправленных программ.

**R.Asgarov**
**M.Qurbanov**

**State Strategy demands capital reforms in vocational education**

**Summary**

In the article, significant issues based on the first-vocational schools and the "State Strategy on Education Development in the Azerbaijan Republic", approved by the President of Azerbaijan Republic, and dated 24 October, 2013. The authors, exploring the staff potential of vocational schools and high schools that prepare specialist, the financial resources, the technical equipment, and finally the condition of current status of learning process, come to a conclusion that, the existing curriculum should be changed, since they are subject-oriented, and the learners can't acquire the competences proper to their profession. The authors note that, even though those students get a diploma, employers don't trust them and don't want to employ them, so these unemployed people can't build a career because of the defects in the education system. The authors, coming to a conclusion that, Competence based Module Technologies would play a great role in specialist preparation; suggest refusing subject-based programs, and starting this project as soon as possible.

***Pedaqogika***

# PEDAQOJİ TƏHSİLİN KEYFİYYƏTİ VƏ ONUN İDARƏ OLUNMASINDA MÜASİR YANAŞMALARDAN İSTİFADƏNİN ƏSAS İSTİQAMƏTLƏRİ

**Abdulla Mehrabov**
***Rusiya Dövlət Təhsil Akademiyasının xarici üzvü, professor, əməkdar müəllim***

**İdarəetmə və tərbiyəvermə mədəniyyəti bütün mədəniyyətlər içərisində ən mürəkkəb və ən çətinidir.**
**İ.Kant**

***Açar sözlər:*** *keyfiyyət, təhsil sferasında keyfiyyət, taksonomiya, pedaqoji sistem, təhsil müəssisəsinin effektivliyi, keyfiyyətin idarəolunması, müasir dərs və onun strukturu, şəxsiyyətyönümlü təlim, keyfiyyətin ölçülməsi və qiymətləndirilməsi.*

***Ключевые слова:*** *качество, качество в сфере образования, таксономия, педагогическая система, эффективность образовательного учреждения, управление качеством, современный урок и его структура, личностно ориентированное обучение, измерение и оценка качества.*

***Key words:*** *quality, quality of education, taxonomy, education system, the effectiveness of educational institution, management of quality, modern lesson and its structure, student –centred training, measurement and assessment of quality.*

Keyfiyyət, ümumiyyətlə, istənilən obyektin müəyyənliyini bildirən fəlsəfi kateqoriya olub, onun xassələrinin məcmusunda təzahür edən obyektiv və ümumi (bütöv) xarakteristikadır. Ona görə də bütün zamanlarda təhsilin keyfiyyəti cəmiyyətin inkişafının əsasını təşkil edən mühüm göstərici kimi dəyərləndirilmişdir [3]. Təhsil sferasında keyfiyyət dedikdə, təhsilin nəticələrinə uyğun olaraq əvvəlcədən müəyyən edilmiş normativlərə (standartlara) müvafiq öyrənənlərin səviyyəsi, ümumi halda isə təhsil sisteminin durumu başa düşülür. Pedaqoji təhsilin nəticələri təkcə öyrənənin təhsilini başa vurduqda yiyələndiyi bilik və bacarıqların səviyyəsi deyil, həm də onun dünyaya, cəmiyyətin inkişafına münasibətlərini göstərən müəyyən şəxsi keyfiyyətlərdir. Pedaqoji təhsilin keyfiyyətinə bir neçə səviyyədə baxıla bilər. Məsələn, müəllim səviyyəsində təhsilin keyfiyyəti dedikdə, elə bir nizamlı tədris-təlim prosesi anlaşılır ki, o, öyrənəni tələb olunan səviyyədə biliklər, bacarıqlar və müvafiq keyfiyyətlərlə təmin edə bilsin. Öyrənən səviyyəsində təhsilin keyfiyyəti isə təhsilin məzmununun (bilikləri, fəaliyyət üsullarını və s.) mənimsənilmə dərəcəsi kimi başa düşülür. Başqa sözlə, öyrənənin təhsil keyfiyyəti dedikdə, onun müəyyən səviyyədə biliklər, bacarıqlar sisteminə malik olmasından başqa, təbiət, mədəniyyət və sosial həyat elementlərini mənimsəmə səviyyəsi də başa düşülməlidir. Ona görə də pedaqoji prosesdə öyrənənin bilik keyfiyyətinə - tamlıq,

dərinlik, sistemlilik, operativlik, çeviklik, konkretlik, ümumiləşdiricilik, genişlik, yığcamlıq, şüurluluq, möhkəmlik və b. kimi göstəricilərin təlim prosesində formalaşmasının yekun nəticəsi kimi, təlim prosesinin keyfiyyətinə isə təhsilin müəyyən mərhələsindəki tələbata uyğun effektivliyi təmin edən təlimin xassələri, əlamətləri və xarakteristikaları kimi baxılmalıdır. Deməli, pedaqoji təhsildə keyfiyyətə öyrənənlərə verilən bilik, bacarıq və vərdişlərin müvafiq dövlət standartlarına və cəmiyyətin tələbatına hansı səviyyədə uyğunluğunu müəyyənləşdirən və inkişafa xidmət edən başlıca kriteriya kimi baxmaq lazımdır. Hər bir təhsil müəssisəsində təlim prosesinin səmərəliliyinin obyektiv meyarı kimi məhz təhsilin keyfiyyət göstəricisi qəbul edilməlidir [1, 3].

Pedaqoji prosesin effektivliyinin kriteriyaları kimi təlimin məqsədləri və yaxud normativləri (standartları) götürülə bilər. Təhsilin keyfiyyəti ilə əlaqədar problemlərdən biri də təlim məqsədlərinin taksonomiyası (taksonomiya yunan sözü olub, tacis – qayda ilə yerləşdirmə, nomos – qanun deməkdir, başqa sözlə təlim məqsədlərinin şəbəkəli (iyerarxik) və ya sistemli qurulması) ilə bağlıdır, çünki təlim prosesini o halda effektiv saymaq olar ki, onun qarşısında qoyulmuş məqsədlər həyata keçmiş olsun.

Bu baxımdan pedaqoji təhsilin məzmununun formalaşmasında akademik biliklərlə yanaşı, praktiki bilik və bacarıqların, səriştənin (kompetensiyanın) vacibliyi önə çəkilməlidir. Səriştə isə əldə olunmuş bilik və bacarıqları praktiki fəaliyyətdə effektiv və səmərəli tətbiq etmək qabiliyyətidir. Səriştəyə əsaslanan təhsil sosial-iqtisadi inkişafa daha əhəmiyyətli xidmət göstərir [1].

Təhsil müəssisələrində keyfiyyətli (effektiv) təhsil sisteminin qurulmasına və onun idarəedilməsinə yanaşmalar müxtəlifdir. Bir qrup mütəxəssislər idarəetmənin effektivliyinin bürokratiyaya yol vermədən dəqiqliyə və operativliyə əməl etməkdə, digərləri onu idarəetmə aparatının minimum xərclə işləməsində, üçüncü qrup isə idarəetmədə riyazi metodlardan və kompyuter texnologiyalarından geniş istifadə etməkdə görürlər. Bu yanaşmaların hər üçündə qismən də olsa, idarəetmədə demokratik prinsiplərin tətbiq olunması istiqamətində müsbət fikirlər vardır. Müasir yanaşmalara görə, təhsil müəssisələrində elə bir pedaqoji sistem olmalıdır ki, şəxsiyyətin inkişafı, meyil, maraq və qabiliyyətlərin formalaşması, həmçinin onun mənəvi və əxlaqi cəhətdən layiqli bir vətəndaş kimi yetişməsi üçün maksimum şərait yarada bilsin [4,5].

Müasir şəraitdə təhsil müəssisələrini iki qrupa bölmək olar:

• fəaliyyət rejimi ilə işləyən təhsil müəssisələri;

• inkişaf rejimi ilə işləyən təhsil müəssisələri.

İndiki dövrdə ikinci qrup təhsil müəssisələrinə üstünlük verilir. Deməli, mütərəqqi idarəetmə sistemi təhsil müəssisəsinin həm müvafiq səviyyədə fəaliyyətini, həm də onun daim inkişafını, cəmiyyətin yeniləşməsi və sosial inkişaf istiqamətinə uyğun olaraq yenidən qurulmasını, modernləşməsini təmin etməlidir. Yəni təhsil müəssisəsinin effektiv idarəedilməsində təkcə proqnozlaşdırılmış nəticələrə nail olmaq yox, həm də onun inkişaf dinamikasını təmin etmək vacib sayılmalıdır. Təhsil sisteminin məqsədləri əsasında müəyyən edilmiş təhsil nailiyyətlərini əldə etmək üçün idarəetmənin əsas vəzifələri aşağıdakılar olmalıdır:

• demokratik prinsiplərə əsaslanan əksmərkəzləşmə metodlarının tətbiqi;

• vaxtaşırı planlaşdırılmış şəkildə qiymətləndirmə və monitorinqin keçirilməsi;

• öyrədənlərin müsbət təşəbbüslərinin dəstəklənməsi və onların tələb olunan informasiyaları əldə etməsinə şəraitin yaradılması;

• müəllimin öz ixtisas səviyyəsini yüksəltməsi və peşəkarlığını (səriştəsini) artırması üçün şəraitin yaradılması;

• öyrənənlərin effektiv tədris-təlim prosesi ilə əhatə olunmasının təmin edilməsi;

• təhsil sisteminin demokratikləşdirilməsində və onun idarə olunmasında müəllimlərlə bərabər, valideyn və öyrənənlərin ictimaiyyətin nümayəndələrinin fəal iştirakını təmin etmək üçün idarəetmə ilə bağlı Şuranın fəaliyyətinin gücləndirilməsi.

Bundan başqa, təhsil müəssisəsində təhsil keyfiyyətinin idarəolunması üç texnologiyaya əsaslanmalıdır:

• məqsədə görə idarəetmə;

• prosesə görə idarəetmə;

• son nəticəyə görə idarəetmə.

Belə yanaşmalarda təhsil müəssisəsində təlim keyfiyyətini yüksəltməyin minimum iki üsulundan istifadə etmək məqsədəuyğundur:

• qabaqcıl pedaqoji təcrübənin öyrənilməsi, ümumiləşdirilməsi və ən səmərəli olanların seçilməsi yolu ilə, tələb olunan bilik və bacarıqları öyrənənlərin əldə etməsinə mane olan halların aşkar edilməsi, prosesin optimal modelinin hazırlanması, bütün pedaqoji kollektivin fəaliyyətini bu modelin tələblərinin yerinə yetirilməsinə istiqamətləndirib, icranın həyata keçirilməsi;

• təhsil müəssisəsində həyata keçirilən tədris-təlim prosesinin və onun ayrı-ayrı elementlərinin sistemli şəkildə təhlilinin aparılması, tədris-təlim işinin mövcud problemlərinin ən səmərəli həllini təmin edə biləcək prinsiplərin müəyyənləşdirilməsi.

Bu prinsiplər tədris-təlim prosesinin və onun inkişaf səviyyələrinin effektiv həllini göstərməli, sonradan isə keyfiyyət etalonuna (normasına) çevrilməlidir. Bilmək lazımdır ki, normativlərə əvvəlcədən bütün təsiredici amillər və müəssisədaxili mühit, hər bir sinfin, tələbə qrupunun səviyyəsi, özünəməxsus xüsusiyyətləri təsir etdiyindən, istənilən vəziyyətdən uğurla çıxmaq üçün müəllimlərin ustalığı, onların normativlərə əsaslanaraq yaradıcı fəaliyyət göstərməsi ardıcıl olaraq izlənilməli, vaxtında müvafiq tədbirlər görülməlidir.

Effektiv təlim prosesini təmin edən etalon (norma) elmi cəhətdən əsaslandırılmalı və müasir elmi təcrübəyə söykənməlidir. Yalnız belə etalonla, real təlim prosesinin nəticələrini müqayisə etməklə, onun uğurlu olmasını bilmək və vaxtında gedişini lazımlı istiqamətə yönəltmək olar. Effektiv təlim prosesi normativlərini təhsil müəssisəsinin bütün müəllimləri yaxşı bilməli, bu iş pedaqoji şüurun bir hissəsinə çevrilməlidir. Ona görə də təlimin keyfiyyətini iki faktorla şərtləndirmək olar:

a) pedaqoji şüurun pedaqogikanın müasir prinsipləri və metodları səviyyəsində formalaşdırılması;

b) müəllimin bacarığının, pedaqoji ustalığının konkret təlim şəraitinə uyğunlaşdırılmasının təmin edilməsi.

Deməli, təlimin məqsədləri və mahiyyəti baxımından prosesin keyfiyyətini müəyyənləşdirmək üçün əvvəlcədən prosesin nəzəri modeli (etalonu) hazırlanmalı və real həyata keçirilən layihədən alınan nəticələr onunla müqayisə edilməlidir. Etalon kimi aşağıdakı elementlərdən və qarşılıqlı əlaqələrdən təşkil olunmuş modeli təklif etmək olar [6,8]:

• təhsilin məzmunu ilə bağlı məqsədlər;

• tədris fəaliyyəti (müəllimlərin);

• təlim fəaliyyəti (öyrənənlərin);

• təlim-idrak məsələlərinin məntiqi qoyuluşu və həlli üsulları;

• təşkilatçılıq formaları;

• təlim vasitələri;

• təlim subyektlərinin motivləri;

• təhsilalma şəraiti (təhsil müəssisəsində təşkilatçılıq mədəniyyəti);

• təlimin nəticələri.

Pedaqoji sistemin və təhsil müəssisəsinin fəaliyyətinin nəticələrini idarəetmə nəzəriyyəsinin əsas müddəaları kontekstində qiymətləndirmək üçün aşağıdakı yanaşmalardan istifadə olunmalıdır:

• prosesin effektivlik dərəcəsini müəyyənləşdirmək üçün kriteriyaların hazırlanması;

• mümkün fəaliyyət üsullarının nəzərdən keçirilməsi və ən səmərəli iş üsullarının seçilməsi;

• gözlənilən və təsadüfi dəyişə bilən bütün halların nəzərə alınması;

• tədqiq edilən obyektin və subyektlərin işinə düşünülmüş şəkildə və ya təsadüfən müqavimət göstərəcək amillərin diqqətdə saxlanılması.

Təhsil müəssisəsinin işinin effektivliyini qiymətləndirməyin ən mühüm kriteriyalarından biri onun əsas məqsədlərinin müəyyənləşdirilməsidir. Bunun üçün cəmiyyətin müasir inkişaf mərhələsində təhsil müəssisəsinin hansı rol oynamasını, hansı mühüm vəzifələri yerinə yetirməsini bilmək lazımdır. Təhsil müəssisəsində təlim prosesinin əsas məqsədi bilik, bacarıq və vərdişlərə yiyələnmənin təmin edilməsindən əlavə, öyrənənin şəxsiyyətinin inkişaf etdirilməsi olmalıdır. Bilik, bacarıq və vərdişlər bu işdə əsasən vasitə rolunu oynamalıdır. Tələbə şəxsiyyətinin inkişaf etdirilməsi onda yüksək əxlaqi davranış, ümumbəşəri mədəniyyət, yaradıcı təşəbbüskarlıq və işgüzarlıq, ictimaiyyətçilik, kamillik və s. kimi xüsusiyyətlərin tərbiyə olunması deməkdir.

Təhsil müəssisəsinin işinin effektivliyini qiymətləndirmək üçün ikinci mühüm kriteriyalar qrupu tələbələrdə bilik, bacarıq və vərdişlər sisteminin formalaşma səviyyəsi, təlim prosesinin effektivliyi, öyrənənlərin tərbiyəlilik səviyyəsi, ayrı-ayrı sahələrin, proseslərin durumu əvvəlcədən hazırlanmış parametrlər əsasında mütəmadi olaraq qiymətləndirilməli, nəticələri yekunlaşdırılaraq müvafiq tədbirlər görülməlidir.

Təhsil müəssisəsinin səmərəliliyini, tədris-təlim prosesinin nəticələrini yüksəltmək üçün aşağıdakı əsas sahələr üzrə normativlər qabaqcadan müəyyən edilməlidir:

• təhsil müəssisəsinin tədris-maddi bazası;

• təhsil müəssisəsinin maliyyə-təsərrüfat fəaliyyəti;

• təhsil müəssisəsinin pedaqoji kadrlarının keyfiyyət tərkibi;

• təhsil müəssisəsinin tədris-metodiki bazası;

• təhsil müəssisəsinin pedaqoji kollektivinin yaradıcı fəaliyyəti üçün müəssisədaxili idarəetmə şəraiti;

• müəssisədə təlim prosesinin demokratikləşdirilməsinə kömək edən faktor kimi, dövlət-ictimai xarakterli idarəetmənin tətbiqi səviyyəsi.

Bundan başqa, təlim prosesinin effektivliyini təmin edə biləcək tələblər də əvvəlcədən formalaşdırılmalı və aşağıdakı kimi müəyyənləşdirilməsi məqsədəmüvafiqdir:

✓ tələbələrin biliklərə yiyələnməsinin fərdi xarakterli olması;

✓ təlim prosesinin müasir texnologiyaların tətbiqi ilə qurulması;

✓ müəllimin qiymətləndirilmə fəaliyyətinin şəffaflığı;

✓ tədris və təlim proseslərinin dialoqlu aparılması;

✓ təlim prosesinin təşkilinə diferensial yanaşılması;

✓ təlimin geniş yayılmış didaktik prinsiplərindən istifadə edilməsi;

✓ tədris-təlim prosesinin adaptiv (uyğunlaşdırılmış) xarakterdə aparılması.

Təhsil müəssisəsinin keyfiyyətinin idarə olunmasında ən mühüm normativlərdən biri də müasir dərsin təşkilinə verilən tələblərdir. Yeniləşməyə çalışan ənənəvi təhsil müəssisələrində müasir dərsin əsas vəzi-

fəsi təlim, inkişaf və tərbiyə xətti ilə tələbə şəxsiyyətini bütöv halda formalaşdırmaqdır. Ona görə də müasir dərsin quruluşu kifayət qədər çevik və qarşıya qoyulan məsələlərin xüsusiyyətlərindən, real şəraitdən asılı olaraq asanlıqla dəyişdirilə bilən olmalıdır. Müasir dərs aşağıdakı tələblərə cavab verməlidir [7]:

- öyrənənlərə dərin sistemli bilik verməli;
- tələbələrə öyrənməyi öyrətməli;
- tələbələrdə möhkəm təlim motivlərinin formalaşmasına kömək etməli;
- öyrənənin əqli imkanlarının tərbiyə olunmasına və inkişaf etdirilməsinə şərait yaratmalı;
- bəşəri dəyərlərə yiyələnmiş şəxsiyyətə aid əxlaqın əsaslarını formalaşdırmalı;
- tələbə şəxsiyyətinin mənəvi cəhətdən dolğunlaşmasına kömək etməli.

Müasir dərsə verilən bir mühüm tələb də məqsədyönümlülükdür. Bu xüsusiyyət onun təhsilverici, inkişafetdirici və tərbiyəedici məqsəd və vəzifələrinin kompleks şəkildə nəzərə alınmasını tələb edir.

Müasir dərsə verilən digər tələb, dərs prosesində öyrənənə fərdi qaydada tədris materialını öyrənmə şəraitinin yaradılmasıdır. Bunun üçün hər bir tələbənin meyli, qavrama qabiliyyəti və emosional xüsusiyyətləri nəzərə alınmaqla, onlara fərdi yanaşılmalıdır.

Müasir dərsin mühüm xarakteristikalarından biri də proses zamanı öyrənən və öyrədən münasibətlərinin "subyekt-subyekt" münasibətləri əsasında qurulmasıdır. Bu münasibətlər, əsasən, iki cür özünü göstərə bilər:

• şəxsiyyətə (öyrənənə) laqeyd yanaşmaqla aparılan təlim prosesi;
• şəxsiyyətə (öyrənənə) yönəlmiş təlim prosesi.

Öyrənən şəxsiyyətinə laqeyd münasibət göstərilən yanaşmalarda təlim prosesinin xarakterik əlamətləri kimi aşağıdakıları göstərmək olar:

• müəllim və tələbələrin qarşılıqlı fəaliyyətində təkrarlanma və eyniliyin mövcud olması;
• öyrənən fəaliyyətinin xırdalıqlarınadək idarə olunmaması və ya onun hər hansı işinə diqqətsizlik göstərilməsi;
• stimullaşdırma və əks-əlaqənin səthi şəkildə aparılması, özünütəhlilin (refleksiyanın) reproduktivliyi;
• tələbə fəaliyyətinin effektivliyinin – tədris materialını müəllimdən sonra təkrar edə bilməsi, materialı tam və dəqiqliklə olduğu kimi söyləməsi, müəllimin nə demək istədiyini qabaqcadan tapa bilməsi və s. kimi göstəricilərlə ölçülməsi.

Şəxsiyyətyönümlü təlim prosesinin xarakterik əlamətlərini aşağıdakı kimi ümumiləşdirmək olar:

• müəllim-tələbə, tələbə-tələbə, valideyn-müəllim qarşılıqlı münasibətlərinin müxtəlif formalarından istifadənin təmin edilməsi;
• özünüidarəetmə üçün şəraiti təmin edən özünütəhlilə üstünlük verilməsi;
• daxili istəkdən irəli gələn stimullaşdırmanın, produktiv refleksiyanın bərqərar olmasına şəraitin yaradılması;
• effektiv fəaliyyəti təmin edən müstəqillik, fərdi xüsusiyyətlər nəzərə alınaraq təhsil sahələri üzrə elmi biliklərin əsaslarının öyrənilməsi və tətbiqi, tənqidi təfəkkürün inkişafı kimi göstəricilərə üstünlük verilməsi.

Təhsil müəssisələrində keyfiyyətin idarə olunmasında qiymətləndirmə fəaliyyəti xüsusi yer tutur. Birinci növbədə, istənilən obyektin, eləcə də təhsil müəssisəsinin keyfiyyət səviyyəsinin kəmiyyətcə qiymətləndirilməsi üçün əvvəlcədən keyfiyyət göstəriciləri müəyyənləşdirilməli, sonra effektivlik səviyyəsinin ölçülməsindən alınan nəticələr, optimal variant kimi seçilmiş modelin (etalonun) keyfiyyət göstəriciləri ilə müqayisə edilməlidir. Təhsilin keyfiyyəti

müəyyənləşdirilərkən onun üç əsas tərkib hissəsi – məzmun, texnologiya və əldə olunmuş nailiyyətlər təhlil olunmalı və ayrı-ayrı sahələr üzrə nəticələr çıxarılmalıdır. Təhsilin keyfiyyəti çoxparametrli və mürəkkəb proses olduğundan nəticələrin qiymətləndirilməsi variantları hazırlandıqda sistemli yanaşmadan istifadə olunmalıdır [9,10].

Parametrlər əsasında qiymətləndirmə aşağıdakı göstəricilər üzrə aparıla bilər:

- bilik, bacarıq və vərdişlərin səviyyəsi;
- təhsilalanların fərdi inkişaf dinamikası;
- təhsil prosesində baş verən əlavə effektlərin (onlar həm müsbət, həm də mənfi ola bilər) nəzərə alınması;
- müəllim və rəhbərin səriştəliliyi;
- baxılan təhsil müəssisəsinin cəmiyyətdə reytinqi.

Alınan nəticələr hər göstərici üçün ayrıca ümumiləşdirilir və toplanmış ballara görə inkişaf dinamikası qeyd edilir. Ümumi nəticə o halda müsbət hesab olunur ki, əsas proseslərin heç birində nəticələrin dinamikası mənfi olmasın.

Müasir yanaşmaların müsbət cəhətlərindən biri də şagirdlərin sistematik olaraq özünü, bilik və bacarıqlarının səviyyəsini qiymətləndirməyə, öz təlim fəaliyyətinə nəzarət etməyə cəlb olunmasının təmin edilməsidir. Bu işin əsas mahiyyəti ondan ibarətdir ki, təhsilalan müntəzəm olaraq öz hazırlıq səviyyəsini, buraxdığı səhvləri müəyyənləşdirir və təhlil edir, özünütəhlil üçün təcrübə qazanır, beləliklə də, dərsdən dərsə inkişaf edir, özünütənqid vərdişini formalaşdırır.

Müasir sosial-iqtisadi şəraitdə heç bir təhsil müəssisəsi dəyişikliklərsiz keçinə bilmir. Dəyişkən mühitə uyğunlaşmağı bacaranlar inkişaf edir, çevik olmayanlar isə sıradan çıxır. Hər bir təşkilati-hüquqi fəaliyyətin məqsədləri və ölçüləri işin xarakterindən, maliyyələşmə mənbələrindən, idarəetmədə işçilərin iştirak dərəcəsi və növündən, xidmətlərin xüsusiyyətlərindən asılı olaraq konkret şəraitə əsaslanır. İşgüzar fəaliyyətin, xüsusilə təhsil müəssisəsinin səmərəliliyi bu şəraitin nə dərəcədə dəqiq və tam nəzərə alınmasından asılıdır. Dəyişkən xarici əhatədə işləyən iri təhsil müəssisələri çevikliyi və uyğunlaşmanı təmin etmək məqsədilə mərkəzləşdirilmiş idarəetmə səviyyəsinin azaldılmasına çalışır, mərkəzləşdirilmiş idarəetmə prinsipləri ilə işləyən qurumların təcrübəsindən istifadə edir, ehtiyatları təkrar paylayır, fəaliyyət strategiyasına xarici mühitin amillərindən doğan və onlar tərəfindən diqtə olunan dəyişikliklərin idarə olunmasının yeni mexanizmlərini yaratmaq və onlardan istifadə etməyi bacarmaq hazırda ən əlverişli yanaşma hesab olunur. Bu halda təhsil sisteminin inkişafını təmin edən məqsədlərdən asılı olaraq, onun müvafiq qaydalara uyğunlaşdırılmış daxili mühiti formalaşır. Təhsil sisteminin daxili mühitinə insanlar, texnologiyalar, informasiyalar, təşkilati mədəniyyət və digər komponentlər daxil edilir. Bütün bu proseslər təhsil sistemində bərqərar olmuş əmək bölgüsünü, bölmələr arasında əlaqə və münasibətləri əks etdirən təşkilati quruluş çərçivəsində həyata keçirilməlidir. Son nəticədə, potensialın reallaşma dərəcəsi, təhsil xidmətlərinin keyfiyyətinin yüksəldilməsi və onun reallığa çevrilməsi idarəetmədən asılı olur.

Təhsil müəssisəsində (təhsil sistemində) dəyişikliklərin, təhsil xidmətlərinin keyfiyyətinin idarə edilməsi prosesini aşağıdakı mərhələlərə bölmək olar [8,11]:

1. Təhsil xidmətləri keyfiyyətinin ölçülməsi və qiymətləndirilməsi.
2. Ölçmə və qiymətləndirmə prosesində əldə edilmiş məlumat əsasında təhsil xidmətlərinin keyfiyyətinin yüksəldilməsinə nəzarət və onun planlaşdırılması.
3. Təhsil xidmətləri keyfiyyətinin yüksəldilməsi prosesinin reallaşdırılması.

4. Təhsil xidmətlərinin keyfiyyət göstəricilərinin dinamikasını izləmək və vaxtında müvafiq tədbirlərin görülməsi üçün nəticələrin ölçülməsi və qiymətləndirilməsi.

Təhsil xidmətləri keyfiyyətinin idarə olunması prosesinin məntiqi quruluşu şəkil 1-də verilmişdir [1,11].

Təhsil xidmətlərinin keyfiyyətinin yüksəldilməsinə yönəlmiş proqramın effektli işləməsi və icrası zamanı yerinə yetirilən işlərin ardıcıllığı düzgün aparılmalıdır. Dəyişikliklərin idarə olunmasına çoxsaylı amillər təsir etdiyindən effektivlik və keyfiyyət göstəriciləri üzrə prosesin təhlili, keyfiyyətin inkişaf dinamikasını xarakterizə edən parametrlər proqramlaşdırılmalı və avtomatlaşdırılmalı, sistematik nəzarət, diaqnoz, qiymətləndirmə və adaptiv tənzimləmə müasir səviyyədə qurularaq aşağıdakı istiqamətlərdə həyata keçirilməlidir:




**Şəkil 1.**

➢ tədris-təlim prosesinin kompyuterləşdirilməsi;

➢ proqressiv texnologiyaların tətbiqi;

➢ islahatla bağlı yeni yanaşmaların, ideyaların formalaşdırılması;

➢ yeni mütərəqqi üsulların tətbiqi ilə bağlı mənbələrin müəyyənləşdirilməsi.

Dəyişikliklərin idarə olunması prosesində keyfiyyətin yüksəldilməsi probleminin diaqnostikası çox vacibdir. Diaqnostikanın əsas məqsədi yeni təlim və pedaqoji texnologiyalardan istifadə edərək təhsil sisteminin (təhsil müəssisələrinin) fəaliyyətində problemli sahələri təyin etmək və onun həlli üçün müvafiq tədbirlərin görülməsidir. Eyni zamanda proqnozlaşdırma yolu ilə dəyişikliklərin daha erkən müəyyən edilməsi dəyişikliklərin tendensiyasının mənfi nəticələrini minimuma endirməyə və təhsil keyfiyyətinin yüksəldilməsinə müsbət təsir göstərən əlamətləri inkişaf etdirməyə imkan verir.

Dəyişikliklərin idarə olunması çərçivəsində keyfiyyət göstəricilərinin ümumiləşdirilmiş forması əvvəldən müəyyən edilməlidir. Əvvəl qeyd olunduğu kimi, dəyişikliklərin idarə olunmasında həm strateji, həm də operativ aspektlər iştirak edir. Bununla yanaşı, pedaqoji prosesin iştirakçılarının fəaliyyətinin məqsədyönlü təşkili təhsil sisteminin səmərəliliyinin artırılmasına gedən qısa yoldur. Onu da qeyd etmək lazımdır ki, təhsil sistemlərinin istənilən problemi – insan faktorunun idarə olunması ilə bağlıdır. Təhsil müəssisəsində şəxsi heyətin fəaliyyətinin idarə olunmasında dəyişikliklərin təhlili 2-ci şəkildə göstərilmişdir. Şəkildən göründüyü kimi, dəyişikliklərin təhlili kortəbii proses olmadığından bu işi həyata keçirmək üçün kifayət qədər məlumat toplanmalıdır. Onun yığılması və sonrakı təhlili üçün müşahidə, müsahibə, sorğu və başqa metodlardan istifadə olunmalı və təhsil müəssisəsinin əhatəsi nəzərə alınmalıdır.

Bütövlükdə təhsil müəssisəsində dəyişikliklərə şüurlu fəaliyyətə əsaslanan təşkilati proses kimi münasibət bildirilməlidir. Bu fəaliyyət tədris müəssisəsinin dinamik durumunun, təşkilati strukturunun davamlı fəaliyyətinə yönəldilməli, dəyişikliklərin idarə olunması aşağıdakı ardıcıllıqla həyata keçirilməlidir [10,11]:

• məqsədlərin və təhsil müəssisəsinin inkişaf istiqamətlərinin müəyyən edilməsi;

• inkişafı təmin edən məqsədlərin yönümünün dəqiqləşdirilməsi;

• diaqnostik yolla problemlərin həqiqi səbəblərinin öyrənilməsi;

• eksperiment nəticəsində dəyişikliklərin yenidən aşkarlanması;

• yeni qərarın və onun icrası üzrə öhdəliklərin qəbulu;

• dəyişikliklərin dəstəklənməsi və razılaşmanın həyata keçirilməsi.




**Şəkil 2.**

* 3

Xüsusi ilə qeyd etmək lazımdır ki, təhsil müəssisəsi tərəfindən idarə olunma ilə bağlı həyata keçirilən dəyişikliklərin qəbul olunması və yeniliklərin tətbiqinə razılığın dəstəklənməsi problemlərinin müzakirəsi, qərarların qəbul edilməsi işi pedaqoji heyətin bütün üzvləri cəlb olunmaqla həyata keçirilməlidir.

**İstifadə edilmiş ədəbiyyat**

1. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası. // Azərbaycan məktəbi, 2013, № 5.
2. Azərbaycan müəllimlərinin XIV qurultayının materialları. // Azərbaycan məktəbi, 2014, № 1.
3. Mehrabov A. Azərbaycan təhsilinin müasir problemləri. Bakı: Mütərcim, 2007.
4. Xəlilov S. Təhsil, təlim, tərbiyə. Bakı: Azərbaycan Universiteti, 2004.
5. Xəlilov S. Elm haqqında Elm. Bakı: Azərbaycan Universiteti, 2011.
6. Антипов В. и др. Мониторинг образовательной системы современной школы. Ростов-на-Дону, 1999.
7. Давыдов В. Теория развивающего обучения. М.: Педагогика, 1996.
8. Моисеев А. Управление современной школой. М.: Педагокика, 1993.
9. Зернер И. Знания в составе содержания образования и их качества. Ростов-на-Дону,1978.
10. Перегудов Р., Тарасенко Р. // Введение в системный анализ. М.: Высшая школа, 1996.
11. Хагер Н. Этапы формирования моделей. В сб. Эксперементы. Модель. Теория. М.: Наука, 1982.

**А.Мехрабов**

**Качество педагогического оброзования и основные направления использования современных подходов в его упровлении**

**Резюме**

Одной из самых актуальных проблем, стоящих перед системой оброзования, является качество оброзования и его эффективное управление. Требованием времени и жизненно важным вопросом нации становится его научно-теоретическое, психолого-педагогическое решение. Под качеством в системе образования понимается степень соответствия достигаемых образовательных результатов, соответствующих определенным нормативам (стандартам). За объективный критерий эффективности учебно-образовательного процесса любого учебного заведения принимается именно показатель качества образования. В статье анализируется современный подход, результаты, полученные с теоретических и практических исследований, проводятся обобщения качества системы педагогического образования в Азербайджане.

**A.Mehrabov**

**Quality of general education and major trends of modern approach to its management**

**Summary**

One of the most pressing problems facing the education system is the quality of public education and its effective management. A demand of the nation’s vital question becomes its scientific and theoretical, psychological and educational decision. By the quality of the education system is the degree of conformity achieved learning outcomes that meet certain specifications (standards). Objective criterion for the effectiveness of teaching and educational process of any educational institution is accepted indicator of quality education. This article analyzes the current approach, the results obtained from the theoretical and practical studies conducted generalization to create and manage the quality of education in secondary schools of Azerbaijan.

***Kurikulum***

# ŞAGİRD NAİLİYYƏTLƏRİNİN MONİTORİNQİ VƏ QİYMƏTLƏNDİRİLMƏSİ: MÜASİR YANAŞMALAR

**İlham Cavadov**
***Təhsil Problemləri İnstitutunun monitorinq və qiymətləndirmə şöbəsinin müdiri, pedaqogika üzrə fəlsəfə doktoru, dosent***

***Açar sözlər:*** *monitorinq, qiymətləndirmə, keyfiyyət, kurikulum, təlim nailiyyəti, meyarlar.*

***Ключевые слова:*** *мониторинг, оценивание, качество, курикулум, учебные достижения, критерии.*

***Key words:*** *monitoring, assessment, quality, curriculum, teaching achievement, criteria.*

Ümumtəhsil məktəblərində şagirdlərə sistemləndirilmiş bilik, bacarıq və vərdişlərin aşılanmasında ümumi təhsilin səviyyələri nəzərə alınmaqla, şagird nailiyyətlərinin monitorinqi və qiymətləndirilməsi üzrə sistemin təkmilləşdirilməsi, təhsil müəssisələrində keyfiyyətin monitorinqi və qiymətləndirmə mexanizminin yaradılması təhsilimizin konseptual sənədi olan təhsilin inkişafı üzrə Dövlət Strategiyasında qarşıya qoyulan başlıca vəzifələrdəndir.

Respublikamızda təhsildə monitorinq və qiymətləndirmə mexanizminin tətbiq olunması, əsasən, müstəqillik illərinə təsadüf edir.

Ötən əsrin 90-cı illərindən başlayaraq təhsil sahəsində aparılan eksperimentlərin, tətbiq olunan yeniliklərin səmərəliliyinin artırılması, nəticələrin izlənilməsi, proqnozlaşdırılması və korreksiya işlərinin vaxtında həyata keçirilməsi məqsədi ilə təhsildə monitorinq və qiymətləndirmə mexanizmi tətbiq olunmağa başlanmışdır. Hazırda nəinki ölkəmizdə, hətta dünyanın inkişaf etmiş bir sıra ölkələrinin təhsildə monitorinq və qiymətləndirmə sistemi kifayət qədər mükəmməl qurulmayıb və əksər hallarda bu, lokal xarakter daşıyır. Azərbaycan Respublikasında ilk dəfə olaraq təhsil sahəsində qiymətləndirmə siyasəti müəyyənləşdirilmişdir. Azərbaycan Respublikası Nazirlər Kabinetinin 13 yanvar 2009-cu il tarixli qərarı ilə "Azərbaycan Respublikasının ümumi təhsil sistemində Qiymətləndirmə Konsepsiyası" təsdiq olunmuşdur [3]. Sənəddə müasir dövrdə şagird nailiyyətlərinin qiymətləndirilməsi sisteminin vəzifələri, əsas xüsusiyyətləri, bu sahədə mövcud olan problemlər, Konsepsiyanın yaradılması üçün zəruri səbəblər, əsas qiymətləndirmə növləri, qiymətləndirmə standartlarının və vasitələrinin hazırlanması və sair məsələlər əks olunmuşdur. Təlim-tərbiyə işlərini müasir dövrün tələblərinə müvafiq qurmaq məqsədi ilə konsepsiyada qiymətləndirmə fəaliyyəti üçün aşağıdakı tələblər müəyyənləşdirilmişdir [3]:

- təhsildə müsbət dəyişikliklərin aparılması üçün mühüm vasitə rolunun yerinə yetirilməsi; təhsilin keyfiyyəti üçün əsas göstərici olan şagirdin təlim nəticələri haq-

qında etibarlı məlumatın verilməsi;

- qiymətləndirmə vasitəsilə şagirdin bilik və bacarıqları haqqında kifayət qədər məlumat əldə edildikdən sonra fənn kurikulumlarında və dərsliklərdə müvafiq dəyişikliklərin aparılması;

- təhsildə olan bəzi neqativ hallara qarşı mübarizə vasitəsi funksiyası;

- qiymətləndirmədə yeni yanaşmaların yaddaşa əsaslanan qiymətləndirmənin əksinə olaraq, məntiqi təfəkkür vərdişlərinin inkişafına xidmət etməsi.

Sənəddə qiymətləndirmə fəaliyyətinə qoyulan tələblərin əməli vəzifəsi məktəblərdə təlim-tərbiyə işlərinin məzmun, forma, vasitə və metodlarını təkmilləşdirmək yolu ilə təhsilin keyfiyyətini əsaslı surətdə yaxşılaşdırmaqdan, müəllimlərin yaradıcılığını artırmaqdan və məktəb işlərinin keyfiyyətini bütünlüklə müasir dövrün tələbləri səviyyəsinə qaldırmaqdan ibarətdir.

Qeyd etmək istərdik ki, respublikamızın ümumtəhsil sistemində monitorinq və qiymətləndirmə həmişə mövcud olmuşdur. Buraya şagirdlərin bilik səviyyələrini dəqiqləşdirmək üçün aparılan yoxlama işləri, imtahanlar və inspektor yoxlamaları aiddir. Lakin təcrübə göstərir ki, bütün bu ənənəvi yoxlama (monitorinq) formaları lazımi effekt vermir və onların bir sıra çatışmazlıqları meydana çıxır:

- birinci, tədrisin vəziyyətinə nəzarət mütəmadi deyil, epizodik xarakter daşıyır və buna görə də tədris prosesindəki dəyişikliklərin dinamikasını müşahidə etmək mümkün olmur;

- ikinci, əsasən, tədris prosesinin nəticəsi öyrənilir. Bu halda tədris prosesinin özü, yəni bilik, bacarıq və vərdişlərin formalaşdırılması yoxlayıcıların diqqətindən kənarda qalır;

- üçüncü, bu növ yoxlamaların nəticələri yetərincə şəffaf aparılmır, nəticələr təhlil olunduqda balla qiymətləndirmədən istifadə edilir, bu isə şagirdlər tərəfindən tədris kursunun mənimsənilməsi səviyyəsini araşdırmağa imkan vermir.

Göstərilən çatışmazlıqlar əsas problemləri - şagirdlərin biliklərindəki bu və ya digər boşluqların səbəblərini, müəllimlərin işində olan çatışmazlıqları, şagirdlərin təlim-tərbiyə prosesinə təsir edən mənfi amilləri müəyyənləşdirməyə imkan vermədiyindən mahiyyət etibarilə idarəetmədə dəqiq diaqnoz qoymaq mümkün olmur. Bu halda təhsil prosesinin özü, onun yekunlarını müəyyənləşdirən bilik və bacarıqların formalaşması diqqətdən kənarda qalır. Nəticələrin yoxlanılması və təhlili zamanı istifadə olunan qeyri-dəqiq məlumatlar, subyektiv qiymət balları və yoxlama, tapşırıqlara verilən qiymətlər bütövlükdə şagirdlərin təlim materiallarının məzmununu nə dərəcədə qavrayıb-qavramadığını aydınlaşdırmağa imkan vermir. Buna görə də təlim-tərbiyə prosesinin nəticələrinin ardıcıl öyrənilməsi sisteminin yaradılması və onun işləməsinin qaydaya salınması ümumtəhsil məktəblərinin idarəetmə fəaliyyətində mühüm məsələyə çevrilir.

Aparılmış araşdırmalar zamanı müəyyən edilmişdir ki, ümumtəhsil məktəblərində sistemli, məqsədyönlü, elmi-pedaqoji cəhətdən əsaslandırılmış qiymətləndirmə sistemindən istifadə təmin edilmədiyindən məktəbdə təlim - tərbiyə prosesinin keyfiyyət göstəriciləri getdikcə aşağı düşmüşdür. Bu baxımdan ümumtəhsil məktəblərində keyfiyyətin daha dəqiq, obyektiv ölçülməsi, bütövlükdə müəssisənin fəaliyyətinin monitorinqi və qiymətləndirilməsi üçün elmi cəhətdən əsaslandırılmış yeni, etibarlı bir mexanizmin yaradılması zərurətə çevrilmişdir.

Monitorinq və qiymətləndirmə ümumtəhsil məktəblərində təhsilin keyfiyyətinin

müəyyənləşdirilməsi üçün vacib sayılan amillərdən biridir. Apardığımız müşahidələr zamanı müəyyən olunmuşdur ki, hazırda ümumtəhsil məktəblərində təhsilin keyfiyyətinin müəyyənləşdirilməsi üçün mövcud qiymətləndirmə sistemində aşağıdakı problemlər mövcuddur:

- şagirdlərin təlim nailiyyətlərinin qiymətləndirilməsində obyektivliyin, şəffaflığın və müstəqilliyin təmin olunmaması;
- şagirdlərin təlim nailiyyətlərinin qiymətləndirilməsində biliyin keyfiyyətini qiymətləndirmə meyarlarının olmaması;
- təlim prosesində şagirdlərdə formalaşdırılacaq keyfiyyətlərin (ümuminsani, milli-mənəvi və s.) məzmununun olmaması;
- didaktik sistemlərin, pedaqoji texnologiyaların keyfiyyətinin qiymətləndirmə meyarlarının olmaması;
- müəllimin tədrisə hazırlığının keyfiyyətinin müəyyənləşdirilməsi üçün meyarlar sisteminin olmaması;
- müəllimin tədris nailiyyətlərinin qiymətləndirilməsi üçün meyarların olmaması;
- məktəb rəhbərlərinin mövcud nöqsanları aradan qaldırması üçün təlim-tərbiyə prosesinin keyfiyyətinin yüksəlməsinə yönələn təlim nəticələrinin müntəzəm qiymətləndirilməsi sisteminin olmaması;
- məktəbin tədris fəaliyyətinin qiymətləndirilməsinin vaxtaşırı monitorinqinin aparılması üçün meyarların olmaması.

Müasir anlamda ümumtəhsil məktəblərində monitorinq və qiymətləndirmənin başlıca məqsədi təhsil müəssisəsi rəhbərlərinə, müəllimlərə, həm də şagirdlərə məktəbdə təlim-tərbiyə prosesinin vəziyyəti haqqında obyektiv məlumat vermək və təhsilin keyfiyyətini daha da yüksəltmək imkanı yaratmaqdır.

Ümumtəhsil məktəblərində pedaqoji prosesin səmərəliliyini və inkişafını müəyyənləşdirmək, ilk növbədə, pedaqoji prosesin əsas iştirakçılarının fəaliyyətinin məqsədəmüvafiqliyi üçün məlumatların toplanması prosesidir. Bu zaman ekspertlərin qiymətləndirməni aşağıdakı prinsiplərə əsasən aparması məktəbin təlim-tərbiyə prosesinin keyfiyyəti haqqında tam, müfəssəl təsəvvür əldə etməyə şərait yaradar [7]:

- qiymətləndiriləcək obyekt (pedaqoji proses və yaxud onun hər hansı elementi) barədə dəqiq və etibarlı informasiyaların toplanması;
- monitorinq nəticəsində əldə olunmuş materiallar təhlil olunduqdan sonra təhsilin keyfiyyətini qiymətləndirərkən kəmiyyət ölçmələrindən istifadənin dəqiq aparılması;
- bunun üçün əvvəlcədən xüsusi normativ-hüquqi sənədlərin hazırlanması;
- monitorinq müşahidələri ilə qiymətləndirmə zamanı şəffaflığın təmin olunması məqsədi ilə nəticələr barədə, həm də qiymətləndirmənin yerinə yetirilməsi haqqında ictimaiyyətin və rəsmi orqanların mütəmadi məlumatlandırılması;
- təhsilin keyfiyyətinin qiymətləndirilməsinin beynəlxalq standartlara uyğun aparılması.

Ümumtəhsil məktəblərində real vəziyyətin obyektiv və şəffaf təsvir olunması, müvafiq korreksiya işlərinin aparılması, idarəetmə qərarlarının verilməsi üçün sadalananların dəqiq müəyyənləşdirilməsi vacib hesab edilir.

Ümumtəhsil məktəblərində təhsilin dinamik inkişafı üçün hər dərs ilinin sonunda onun müvafiq göstəricilər əsasında monitorinqinin və qiymətləndirilməsinin aparılması müəssisənin gələcək fəaliyyət istiqamətini düzgün müəyyənləşdirməyə imkan yaradır. Bu halda aşağıdakı bir sıra vacib məsələlərin həlli ön plana çəkilir:

- təhsilin keyfiyyətini müəyyən etmək üçün dövlət təhsil standartlarının (parametr-

lərin, meyarların) işlənib hazırlanması;

- ümumtəhsil məktəblərində şagirdlərin hazırlığının keyfiyyəti barədə mütəmadi obyektiv məlumatın toplanması;
- təhsilin keyfiyyətinin ictimai ekspertizası (monitorinqi) üçün şəraitin yaradılması;
- təhsilin keyfiyyətinin monitorinqi və qiymətləndirilməsi üçün yeni metodiki modellərin işlənib hazırlanması;
- təhsilin keyfiyyətinin monitorinqi və qiymətləndirilməsi məsələləri üzrə idarəetmə qərarlarının qəbulu zamanı subyektivliyin minimuma endirilməsi;
- məlumatların toplanılmasında dəqiqliyin, etibarlılığın və nəticələrin şərh edilməsində şəffaflığın təmin edilməsi;
- təhsilin keyfiyyətinə dair monitorinq və qiymətləndirmənin nəticələrinin respublika səviyyəsində vaxtında işıqlandırılması.

Bu mövqe təhsil sistemində, onun demokratik prinsiplərlə idarə edilməsində və təhsilinin keyfiyyəti haqqında düzgün informasiyaya əsaslanaraq qərarların qəbul edilməsində xüsusi əhəmiyyət kəsb edir.

Müasir dövrdə təhsilin keyfiyyətinin idarə olunması, inkişaf dinamikasının izlənilməsi və proqnozlaşdırılması üçün real vəziyyətin öyrənilməsi vacib hesab edilir. Bu işdə isə qiymətləndirmə mühüm pedaqoji vasitə kimi qəbul edilir. Qiymətləndirmə təlim-tərbiyə prosesini təkmilləşdirməyə, təlim prosesinin səmərəliliyini yüksəltməyə, şagirdlərin nəyi mənimsədiklərini, nələri öyrəndiklərini, hansı bacarıqlara malik olduqlarını və onlarda hansı keyfiyyət dəyişikliklərinin formalaşdığını müəyyənləşdirməyə obyektiv şərait yaradır.

Məhz qiymətləndirmə vasitəsilə təhsil müəssisəsi rəhbərləri müəssisədə təlim-tərbiyə işinin səviyyəsi, müəllim və şagirdlərin fəaliyyəti haqqında lazımi informasiya toplayır və bunun əsasında işin yaxşılaşdırılması üçün müvafiq qabaqlayıcı tədbirlər həyata keçirirlər. Fikrimizcə, hazırda təhsilin keyfiyyətinin müəyyənləşdirilməsi üçün tətbiq olunan qiymətləndirmənin məqsədi aşağıdakı məsələlər haqqında tam aydın təsəvvür əldə etməyə geniş imkanlar yaradar:

- məktəb kurikulumu üzrə şagirdlərin müvəffəqiyyət göstəricilərinin güclü və zəif cəhətlərinin araşdırılması;
- şagirdlərə verilən bilik, bacarıq və vərdişlərin cəmiyyətin tələbatına uyğunluğunun müəyyənləşdirilməsi;
- fənn materiallarının çətinlik səviyyəsinin şagirdlərin fiziki və anlaq səviyyəsinə uyğunluğunun müəyyənləşdirilməsi;
- kurikulumun necə yerinə yetirilməsinə, əhalinin təhsilə olan tələbat səviyyəsinin öyrənilməsi;
- şagirdlərin təlim göstəricilərinin fənlər üzrə toplanmış nəticələr əsasında fənn kurikulumunun dəyişilməsinə ehtiyacın olub-olmamasının aydınlaşdırılması üçün müvafiq təkliflərin hazırlanması;
- müxtəlif şəhər, rayon və kənd məktəblərində fənlər üzrə şagirdlərin təlim nailiyyətlərinin müqayisəli təhlilinin aparılması və milli təhsil sistemindəki vəziyyəti əks etdirən rəsmi hesabatların hazırlanması;
- müəllimlər tərəfindən istifadə edilən didaktik vasitələrin, pedaqoji texnologiyaların, təlim strategiyalarının təkmilləşdirilməsi;
- müəllimlərin elmi-pedaqoji hazırlıq səviyyəsinin müəyyənləşdirilməsi və təkmilləşdirilməsi üçün müvafiq tədbirlərin görülməsi;
- təhsil xidmətlərinin keyfiyyət dinamikasının öyrənilməsi;
- təhsilin keyfiyyətli idarə olunmasının səmərəliliyinin müəyyənləşdirilməsi.

Göründüyü kimi, təhsildə qiymətləndirmə sistemi təhsil işçisinin səmərəli fəaliyyətinin üzə çıxarılması və pedaqoji prosesin

təkmilləşdirilməsi üçün vaxtında tələb olunan tədbirlərin görülməsi məqsədini daşımalıdır. Çünki qiymətləndirmə pedaqoji prosesi tənzimləməyə, keyfiyyətini yüksəltməyə, həm də mövcud çatışmazlıqlar barədə təhsili idarə edənlərin və valideynlərin məlumatlandırılmasına xidmət edən yeganə pedaqoji vasitə olduğundan, qiymətləndirmənin düzgün təşkili və qiymətləndirmə aparılarkən məqsədin aydın olması təhsilin keyfiyyətinin yüksəldilməsində mühüm rol oynayır. Ona görə də ümumtəhsil məktəblərində elmi, pedaqoji və psixoloji cəhətdən əsaslandırılmış monitorinq və qiymətləndirmənin aparılması təhsil prosesinin keyfiyyətinin yüksəldilməsinin ən mühüm şərtlərindən biridir.

Təlim-tərbiyə prosesinin keyfiyyətinin, şagirdlərin təlim nəticələrinin mütəmadi monitorinqi təhsilin məzmununun yeniləşməsi, təhsil standartlarının tətbiqi, dərs yükünün normallaşdırılması, təhsilalanların sağlamlığının qorunması və möhkəmləndirilməsi mənəvi tərbiyə problemlərinin kəskinləşdiyi şəraitdə də xüsusi əhəmiyyət kəsb edir. İndi məktəbin qarşısında duran əsas məsələlərdən biri ümumtəhsil məktəbində monitorinq və qiymətləndirmə sisteminin yaradılmasıdır.

*Rəyçi: dos. Ə.Abbasov*

**İstifadə edilmiş ədəbiyyat**

1. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası. // Azərbaycan məktəbi, 2013, № 5.
2. Təhsil Qanunu. Bakı, 2009.
3. Azərbaycan Respublikasının ümumi təhsil sistemində Qiymətləndirmə Konsepsiyası. // Kurikulum, 2009, №2.
4. Cabbarov M. Təhsil sistemi milli dəyərlərə və peşəkar kompetensiyalara malik Azərbaycan vətəndaşı yetişdirməlidir. // Azərbaycan məktəbi, 2013, № 5.
5. Novruzov Q., Abbasov Ə. Ənənəvi təhsildən “Düşüncə və təfəkkür məktəbi”nə doğru. // Azərbaycan məktəbi, 2014, № 3.
6. Abbasov Ə. Ümumi təhsilin inkişaf perspektivləri. // Azərbaycan məktəbi, 2014, № 6.
7. Поташник М. Управление качеством образования. М.: Педагогическое общество России, 2001.

**И.Джавадов**

**Мониторинг и оценивание ученических успехов: современные подходы**

**Резюме**

В статье расскрывается суть механизма мониторинга и оценивания в образовании в нашей республике. Комментируются задачи, исходящие из Государственной Стратегии по развитию об разования.

**I.Javadov**

**Monitoring and assessment of student achievements: modern approaches**

**Summary**

In the article the essence of monitoring and assessment mechanism on education is clarified. State strategy on development of education and target goals are also interpreted here.

# FƏNN KURİKULUMLARININ TƏTBİQİ İLƏ ƏLAQƏDAR XƏRİTƏ ÜZRƏ İŞİN TƏŞKİLİNƏ DAİR

**Elmira Qasımova**
***ADPU-nun Türk və Şərqi Avropa xalqlarının tarixi və tarixin tədrisi metodikası kafedrasının dosenti***

**Ramiz Hüseynov**
***metodist***

Ümumtəhsil məktəblərində fənn kurikulumlarının tətbiqi ilə əlaqədar tarix dərslərində xəritə üzərində işin təşkili xüsusi əhəmiyyət kəsb edir. Tarixi biliklərin mənimsədilməsində təhsilin bütün pillələrində xəritənin rolu müstəsna dərəcədə böyükdür. O, iqtisadi-ictimai inkişafın aşılanmasına, ilk dövlətlərin yaranması prosesini sürətləndirən təbii-coğrafi mühitin aydınlaşdırılmasına da kömək edir.

Şagirdlərdə tarixi hadisələrin baş verdiyi yer haqqında düzgün təsəvvür yaradılması heç də az əhəmiyyətli məsələ deyildir.

Ərazi bütün tarixi hadisələr üçün meydandır və yer şəraiti çox vaxt hadisələrin konkret gedişini müəyyən edir. Bu şəraiti bilmək bir sıra hallarda tarixi hadisələrin izahına kömək edir.

Şagirdlərin tarix xəritələri üzərində işinin təşkili orta məktəbin III-IV siniflərindən başlayır. Lakin bu siniflərdə xəritə haqqında yalnız ilk anlayışlar və təsəvvürlər verilir. Xəritə ilə iş V sinifdən başlayaraq daha ardıcıl və sistemli şəkildə aparılır, bu sahədə müəyyən bacarıq və vərdişlər aşılanır və inkişaf etdirilir. V-XI siniflərdə şagirdlər xəritə ilə işin texnikasına bələd olur, onun üzərində bəşəriyyət tarixində ilk sinifli cəmiyyət olan quldarlıq, habelə feodalizm, kapitalizm ictimai-iqtisadi formasiyalarının yaradılması və inkişafı prosesini izləyirlər.

Dərslərdə xəritədən istifadə təkcə tarixi hadisələrin lokalizasiyası, bu hadisələrin inkişaf etdiyi coğrafi mühit haqqında təsəvvür yaratmaq üçün istifadə edilmir. Xəritə elə bir əyani vəsaitdir ki, o, tarixi materialı başa düşməyə, tarixi hadisələrin gedişini anlamağa, tarixi əlaqələri və qanunauyğunluqları açıb göstərməyə kömək edir. Tarixi materialların nəinki şərhi, həm də onun təhlili və ümumiləşdirilməsi gedişində istifadə olunan xəritə tarixi hadisələri aydınlaşdırmağa xidmət edir.

Bakı şəhərinin ümumtəhsil məktəblərində (13, 18, 27, 132-134, 190 və s.) aparılmış tədqiqat işlərinin nəticələrinin təhlili göstərmişdir ki, bu sahədə məktəblərimizdə müəyyən işlər görülmüşdür.

Müşahidələr göstərmişdir ki, xəritə hətta tarixi öyrənməyin ilk pillələrində öyrənilmiş materialın şagirdlər tərəfindən təhlil edilib ümumiləşdirilməsi işinə kömək edir və şagirdləri tarixi inkişafın qanunauyğunluqlarını açıb göstərməyə yaxınlaşdırır. Məsələn, qədim dünya tarixi dərsliyində verilmiş xəritələr aşağıdakı suallara cavab verməyə kömək edir: Misirin, Mesopotamiyanın, Hindistanın və Çinin təbiətində nə kimi oxşarlıqlar, bu ölkələrin əhalisinin məşğuliyyətində nə kimi ümumi cəhətlər var idi? Bu belə bir qanunauyğunluğu aydınlaşdırmağa imkan verir ki, şərq yarımkürəsində ən qədim əkinçilik ocaqları böyük çayların vadilərində meydana gəlmiş, ən qədim quldar

dövlətlər də burada yaranmışdır və s.

Həmçinin xəritə bir sıra tarixi hadisə və prosesləri izləməyə də imkan verir. Məsələn, "Azərbaycan tarixi atlasında verilmiş Xürrəmilər hərəkatı (VIII əsrin sonu- IX əsrin birinci yarısı)" xəritəsində şagirdlər hərəkatın yayıldığı ərazilərlə tanış olurlar. Onların təsəvvüründə qədim Azərbaycan canlanır.

Qeyd etmək lazımdır ki, hazırkı məktəblərimizdə tarix dərslərində xəritə ilə müntəzəm olaraq işləmək üçün müəyyən imkanlar vardır. Belə ki, V-XI siniflərdə məktəb proqramı Azərbaycan tarixi üzrə divar xəritələri və atlaslarla təmin edilmiş və tarix dərsliklərinin mətnində çoxlu xəritələr verilmişdir.

Tarix dərslərində istifadə edilən xəritələri, əsasən, üç qrupa ayırmaq olar. Divar xəritələri, kontur xəritələri və xəritə-sxemlər.

Divar xəritələrinin üç forması mövcuddur:

Bu qəbildən olan xəritələrdə tarixi inkişafın dinamikasını əks etdirən ünsürlər: müəyyən müddət ərzindəki ərazi dəyişiklikləri, hərbi əməliyyatların gedişini göstərən şərti işarələr və ictimai hərəkatlarla əhatə olunmuş rayonlar verilir.

İcmal xəritələrində hər şeydən çox uzun dövr ərzində baş vermiş ərazi dəyişiklikləri əks olunmuşdur.

Mövzu xəritələri isə tarixi prosesin ayrı-ayrı hadisələrinə və cəhətlərinə həsr olunmuşdur. Nəzərə alınmalıdır ki, dərsliklərin mətnindəki və atlasdakı xəritələrin əksəriyyəti mövzu xəritələridir.

Xəritə-sxemlər isə az yüklənmələri ilə fərqlənir, bir sıra hallarda yalnız qurunu və sərhədləri təsvir etməklə kifayətlənərək xüsusi sxem işarələrinin və təsvirlərinin köməyi ilə öyrənilən hadisənin mahiyyətini, daxili əlaqələrini, əsaslı qanunauyğunluqlarını əyani şəkildə açıb göstərir.

Kontur xəritə üzərində şagirdlərin işinin təşkili, ümumiyyətlə, xəritə ilə işləməyin ən səmərəli formalarından biridir. Kontur xəritə ilə işləyən zaman şagirdlər divar xəritələrindən qazandıqları bilikləri möhkəmləndirir. Kontur xəritələr üzərində işin təşkili, adətən, dərsin sonunda olur. Müəllimin rəhbərliyi altında şagirdlər həm atlası, yaxud dərsliyə əlavə olunmuş xəritəni, həm də kontur xəritəni açır və rəngli karandaşlarla öyrənilən mövzunu atlasdan və ya dərsliyə əlavə olunan xəritədən kontur xəritənin müvafiq səhifəsinə köçürürlər. Tarix xəritələrinin hər birindən istifadə edilməsi mövzunun xarakterindən və konkret tələbindən irəli gəlir.

Orta ümumtəhsil məktəblərinin V-XI siniflərində şagirdlərin divar xəritəsi üzərində işinin təşkili böyük əhəmiyyətə malikdir. Şagirdlər xəritə haqqında zəruri bilikləri ilk dəfə divar xəritəsindən əldə edirlər.

Divar xəritəsində əyaniliyin mühüm keyfiyyətləri öz ifadəsini tapmışdır. Xəritə tarixi proseslər haqqında şagirdlərə aydın, canlı təsəvvürlər verir. Tarix dərslərini xəritəsiz keçəndə müəllimin şərhi tarixi hadisələri nə dərəcədə dolğun ifadə etsə də, onlar şagirdlər tərəfindən zəif mənimsənilir və tez unudulur. Müşahidələr göstərir ki, sinifdə tarix xəritəsi olanda və ondan istifadə ediləndə müəllimin şərh etdiyi tarixi hadisə daha aydın, canlı obraza çevrilir və dərindən mənimsənilir.

Metodik ədəbiyyatda göstərildiyi kimi, divar xəritəsi şagirdlərdə tarixi prosesin meydana çıxdığı və inkişaf etdiyi məkan münasibətləri haqqında geniş təsəvvür yaradır. Divar xəritəsində məkan əlaqələrinin mahiyyəti dərk edildikdə şagirdlər baş vermiş tarixi hadisələrin sinfi məzmununu daha dərindən başa düşürlər.

Divar xəritəsi şagirdlərdə təkcə məkan münasibətləri haqqında deyil, həm də zaman münasibətləri haqqında müəyyən qədər təsəvvür yaradır.

Xəritəni diqqətlə nəzərdən keçirərkən

orada müəyyən zaman münasibətlərini görmək mümkündür. Biz bu münasibətləri iki formada görə bilərik: Divar xəritələrinin əksəriyyətində xəritənin adının yanında böyük tarixi hadisənin baş verdiyi il yazılır. Məsələn, Azərbaycan Ağqoyunlu dövlətindən bəhs edən xəritənin adının yanında "1468-1503-cü illər" yazılır, yəni hadisənin baş verdiyi və qurtardığı illər göstərilir. Bəzi xəritələrdə böyük şəhərlərin yanında həmin şəhərlərin ən görkəmli memarlıq abidələrinin nümunəsi verilir. Memarlıq abidələrinin tikiliş xüsusiyyətləri, onların üslubu həmin dövrün zaman əlaqələrini açmağa imkan verir.

Tədris materialını şagirdlərə mənimsətməyin əsas vasitələrindən biri olan divar xəritələri ilə işin təşkilinə qabaqcadan ciddi hazırlıq aparılması dərs prosesi üçün böyük əhəmiyyət daşıyır.

Yeni materialın öyrənilməsi üzrə divar xəritəsi ilə işin təşkilinə hazırlığı iki mərhələdə aparmaq olar. Birinci mərhələdə müəllim hazırlıq prosesində təkcə dərsliyin məzmunu ilə tanış olmur, həm də dərsliyə əlavə olunan xəritələri, tarix atlaslarını diqqətlə nəzərdən keçirir, dərslikdə adları çəkilən bütün tarixi-coğrafi obyektləri orada diqqətlə izləyib tapır.

Müəllim bu zaman dərsliyə əlavə olunan xəritələri və atlasları bir-biri ilə müqayisə edir, onların ümumi və fərqli cəhətlərini araşdırıb müəyyənləşdirir.

Xəritə ilə işin təşkilinə hazırlaşan müəllim coğrafi mühitin rolunun müəyyən edilməsi üçün lazım olan bütün məlumatları mütləq axtarıb tapmalıdır.

Tarixçi metodist M.Zinovyev qeyd edir ki, müəllim mövzunun planını tərtib edərkən bütün tarixi-coğrafi adlardan ən zəruri olanlarını seçib ayırmalıdır.

Tədris prosesində divar xəritələri üzərində yeni materialın şərhi zamanı təbii – coğrafi şərait, bəşəriyyət tarixinin ilk pillələrində onun cəmiyyətin  inkişafına təsiri, bu əsasda təbiətlə cəmiyyət arasında qarşılıqlı münasibətlər, coğrafi mühitin maddi nemətlər istehsalının zəruri şərtlərindən biri olduğu öyrədilir.

Hər bir müəllim bilməlidir ki, tarix elmində təbii-coğrafi mühit anlayışı tarixi prosesin öyrənilməsində xüsusi əhəmiyyət kəsb edir. Təbii-coğrafi mühit anlayışını isə tarix elminin xüsusi sahəsi olan tarixi coğrafiya öyrənir.

Heç bir ictimai-iqtisadi informasiyanı, hətta ən mükəmməl ictimai quruluşu belə təbii şəraitdən ayrı təsəvvür etmək olmaz.

Divar xəritələri üzərində V-XI sinif şagirdlərinin işinin səmərəli təşkili bir çox cəhətdən mövzu üzrə divar xəritəsinin düzgün seçilməsindən asılıdır.

Müəllim xəritəni ilk dəfə sinifə aparırsa onun ümumi icmallarını hazırlamalı, şagirdləri müəyyən izahat ilə maraqlandırmalıdır. O, xəritəni seçəndə müəyyən etməlidir ki, bu, şagirdlərdə hansı təlim keyfiyyətləri yarada bilər. Məşhur metodist alim P.B.Qora tarix dərsi üçün əyani vəsait seçilməsi qaydalarını müəyyənləşdirərkən xəritəyə xüsusi diqqət yetirmişdir. Çünki divar xəritəsi üzərində işin təşkilinə hazırlaşmaq tarix müəllimi üçün ən əsas şərtlərdən biridir. Əgər bu hazırlıq olmasa müəllimin şərhi, onun ifadə tərzi nə qədər emosional və elmi cəhətdən düzgün olsa da dərsin pedaqoji səmərəsi keyfiyyətli ola bilməz.

Müəllimlər xəritədən istifadə qaydalarına ciddi əməl etməlidirlər. Hər hansı bir ərazi dəqiq göstərilməli, şagirdlərin də ona əməl etməsi gözlənilməlidir. Ərazilər yuxarıdan aşağıya, sağda, solda sözləri ilə deyil, şimaldan cənuba, qərbdən şərqə ifadələri ilə izah edilməli, şəhərin adı yazıya görə yox, müəyyən edilmiş işarəyə uyğun göstərilməli, sərhədlərin dəqiqliyinə xüsusi diqqət yetirilməlidir.

Yeni xəritə ilə tanış olmaq üsullarından biri şagirdlərin diqqətini onlara yaxşı

tanış olan obyektlərə oriyentir kimi cəlb etmək, xəritə ilə sonrakı işdə bu oriyentirdən istifadə etməkdir.

Siyasi hadisələrin inkişafından bəhs edən mövzuları tədris edərkən xəritə ilə işin təşkili imkanları daha geniş olur. Məsələn, VII sinifdə "Ərəb xilafəti və onun dağılması" mövzusunu keçərkən müəllim divar xəritəsində ərəb istilahlarını, onların müvəffəqiyyət qazanması səbəblərini aydınlaşdırır. O göstərir ki, ərəblərin yaxşı silahlanmış qoşunu Bizansın və İranın üzərinə sel kimi tökülüblər. Bu ölkələr ərəblərə ona görə ciddi müqavimət göstərə bilmədilər ki, onlar daim müharibələr aparmaqla bir-birini taqətdən salmışdılar. Ağır vergilərdən əziyyət çəkən əhali ilə düşmənə lazımi müqavimət göstərə bilmədilər. Bu ölkələrdə feodal pərakəndəliyi də düşmənə müqavimət göstərməyə mane olurdu və s.

Müəllim proqram materialını şərh edəedə divar xəritəsində Ərəbistan yarımadasını, İranı, Bizansı, Suriyanı, Misiri, Cəbəllütarix boğazını, Pireney yarımadasını, Frank krallığını, Zaqafqaziya və Orta Asiyanı və nəhayət, Ərəb xilafətinin hüdudlarını şagirdlərin iştirakı ilə müəyyənləşdirir. Müəllim bu işdə yuxarıda adı çəkilən üsullardan istifadə etsə, daha faydalı olar.

Şagirdlərin xeyli hissəsi, hətta bəzi müəllimlər də xəritədə bu və ya digər obyekti düzgün tapdıqları halda, onun göstərilmə qaydasını bilmirlər.

Təcrübə göstərir ki, böyükyaşlı məktəblilər orta siniflərin şagirdlərinə nisbətən xəritəyə daha inamla bələd olur. Lakin şagirdlərdə hər hansı bir tarix xəritəsinə sərbəst şəkildə bələd olmaq qabiliyyətini formalaşdırmaq vəzifəsi IX-XI siniflərdə də müəllimin qarşısında durur. Bu vəzifənin həllinə, hər şeydən əvvəl, sinifdə və evdə müxtəlif tarix xəritələrində şagirdlərin müntəzəm surətdə məşq etməsi ilə nail olunar.

Şagirdlərdə xəritəyə bələd olmaq qabiliyyətlərinin inkişaf edib möhkəmləndirilməsinə kömək edən sınanılmış üsul eyni vaxtda iki xəritə ilə işləməkdir. Belə ki, müəllimin divardakı xəritədə göstərdiyi yerləri şagirdlər dərslikdəki xəritədə izləyirlər. Bu iş V sinifdən başlayaraq tarix xəritələrində müntəzəm surətdə aparılaraq, tədricən mürəkkəbləşir. Dərsdə tarix xəritəsi üzrə aparılan məşq evə verilmiş işlə tamamlanır. Xəritəyə yaxşı bələd olmaq üçün şagirdlər divar xəritələrində, dərslikdəki xəritələrdə, atlasda məşq etməli, bəzi şeyləri əzbərləməlidirlər.

A.İ.Strajev yazır: "Xəritəni bilmək- bu nəinki onun şərti funksiyasını (işarələrini), onun simvolik mənasını, şəhərlərini, sərhədlərini, çaylarını və s. bilmək, həm də bu şərti işarələr arxasındakı canlı tarixi həqiqəti, iqtisadi, ictimai-siyasi və mədəni qarşılıqlı münasibətlərin mürəkkəbliyini görmək deməkdir. Şagirdləri tarix xəritəsini tarix kitabını oxuyan kimi "oxumağa" öyrətməli, bu vəzifəni tarix xəritəsi ilə işləməyə başlayan tarix müəllimi, rəhbər tutmalıdır.

V-XI siniflərdə divar tarix xəritələri üzərində işin təşkili prosesində tarixi hadisələr arasında varislik əlaqələrinin yaradılması mühüm əhəmiyyət daşıyır.

Məlum olduğu kimi, tarix dərslərində, xüsusilə yuxarı siniflərdə müəyyən bir tarixi hadisə şagirdlər tərəfindən təkrarən öyrənilir. Lakin təkrar öyrənilən zaman həmin hadisə daha yeni mərhələdə, yeni məzmunda mənimsənilir. Bu prosesdə şagirdlər müəllimin rəhbərliyi altında bu iki mərhələ arasında varislik əlaqəsi yaradır, yəni müəyyənləşdirir ki, ikinci mərhələdə baş verən hadisələr birinci mərhələdə baş verən hadisələrin davamıdır. Xəritə vasitəsilə hadisələrin varisliyini üzə çıxarmaq onlar arasındakı qanunauyğunluqları, qarşılıqlı əlaqə və asılılığı üzə çıxarmaq deməkdir. Tarixi hadisələr arasında varislik əlaqələrini üzə çıxarmaq, onların mahiyyətini dərk etmək və şagirdləri də bu istiqamətdə çalışdırmaq üçün dərsdə eyni vaxt-

da iki tarix xəritəsindən istifadə etmək sahəsində IX-XI siniflərdə daha çox imkanlar mövcuddur.

XI sinifdə "Böyük Vətən müharibəsinin başlanması" mövzusu tədris olunarkən müəllimin "İkinci Dünya müharibəsi" (1939-1945-ci illər), eləcə də "Sovet İttifaqının Böyük Vətən müharibəsi" (1941-1945-ci illər) xəritələrindən istifadə etməsi məqsədə uyğundur.

Müəllim birinci xəritədə alman faşistlərinin SSRİ-yə hücumunu danışmazdan əvvəl bu vaxta kimi Avropada, dünyanın başqa yerlərində faşist təcavüzkarlığının genişlənməsindən danışır. O, Almaniya, İtaliya, Yaponiya imperialistlərinin işğalçılıq hərəkatlarını göstərə-göstərə SSRİ-ni məhv etmək siyasəti yeritdiklərini, Polşaya soxulmalarını, Danimarka və Norveçə daxil olmalarını və s. şagirdlərə xatırladır.

Nəhayət, müəllim dərhal ikinci xəritəyə keçərək alman faşistlərinin Sovet ölkəsinə xaincəsinə hücumunu izah etməyə başlamalı və göstərməlidir ki, faşistlərin ölkəmizə basqını alman faşistlərinin Avropada işğalçılıq siyasətinin davamı, onun nəticəsi idi. Müəllim bütün bunları divar xəritəsində canlandırmalıdır.

Beləliklə, aydın olur ki, XI sinifdə bir dərsdə iki xəritədən istifadə edilərkən İkinci Dünya müharibəsi ilə Böyük Vətən müharibəsi arasında mühüm əlaqələr yaradılır, onların mahiyyəti dərk edilir. Divar tarix xəritələri üzərində müəllimin göstərdiklərini şagirdlər passiv surətdə müşahidə etməməlidirlər. Onlar divar xəritəsində göstərilənləri qarşısındakı tarix atlaslarında və dərsliyə əlavə olunan xəritələrdə diqqətlə izləməlidirlər. Bu hal şagirdlərin divar xəritələrindən əldə etdikləri bilikləri daha da dərinləşdirir və möhkəmləndirir.

Metodist alim V.Q.Kotrsov dərs prosesində dərsliyə əlavə olunan xəritələrdən istifadə edilməsinin əhəmiyyətini xüsusi olaraq qeyd edir. "Şagirdlərə dərsliyə əlavə edilmiş xəritə ilə işləmək vərdişini aşılamaq çox vacibdir. Buna görə də sinif xəritəsi üzrə müəllimin şərhi zamanı şagirdlər dərsliyin xəritələrini açaraq orada müəllimin dediyini eyni zamanda izləməli, zəruri olan bütün məntəqələri axtarıb tapmalıdırlar".

Tarix atlasları və dərsliyə əlavə olunan xəritələr üzərində işin təşkili üçün müəllim, hər şeydən əvvəl, mövzunun məzmununu dərindən və hərtərəfli bilməli, atlaslar və dərslik xəritələrinin bu mövzunun tələblərinə nə dərəcədə cavab verdiyini düzgün müəyyənləşdirməlidir. Əslində atlaslar və dərsliyin xəritələrində təsvir olunan hadisələrin miqdarı əsasən bir–birinə uyğun gəlir. Lakin fərq orasındadır ki, dərslik xəritəsində hadisələrin bəziləri ya tutqun verilir, ya da digər hadisələrlə birlikdə təsvir olunur. Atlasda isə həmin hadisələr aydın verilir. Nadir hallarda dərsliyə əlavə olunan xəritələrdə verilməyən hadisəni atlasda tapmaq olur.

Şagirdlərin divar xəritələri üzərində çalışmalarında ev tapşırıqları böyük əhəmiyyətə malikdir. Xəritəyə aid ev tapşırıqlarının müvəffəqiyyətli olması üçün, hər şeydən əvvəl, atlas və dərslik xəritələrinin mövcud imkanları nəzərə alınmalıdır.

Xəritə üzərində işləyən müəllim bir məsələni də nəzərə almalıdır ki, hazırda respublikanın ümumtəhsil məktəblərində Sovetlər birliyi dövründə istehsal olunan bir sıra divar xəritəsi var və onlardan mövzuların tədrisi zamanı istifadə olunur. Müəllim nəzərə almalıdır ki, həmin xəritələrdə bir sıra təhriflərə yol verilmişdir. Belə ki, Azərbaycan torpaqları təhrif edilmiş şəkildə göstərilmişdir. Əgər məktəbdə belə xəritə varsa, yol verilmiş təhriflər şagirdlərə çatdırılmalı və onlar düzgün istiqamətləndirilməlidir.

Orta məktəbin V-XI siniflərində istifadə olunan tarix xəritələrinin üçüncü mühüm növü kontur xəritələrdir. Proqram material-

larının mənimsənilməsində kontur xəritələrin də mühüm əhəmiyyəti vardır. Məktəblərimizdə hələlik Azərbaycan dilində belə xəritələr olmasa da onlar haqqında danışmağa dəyər. Tədqiqat nəticəsində müəyyən edilmişdir ki, bu özünü iki istiqamətdə göstərir: Birincisi, kontur xəritə, hər şeydən əvvəl, şagirdlərin divar xəritəsindən əldə etdikləri bilikləri möhkəmləndirir, onun uzun müddət yadda qalmasını təmin edir. Kontur xəritə əslində divar xəritəsi üzərində işin təşkilinə verilən tələbləri özündə əks etdirir. Belə ki, istər divar xəritəsində, istərsə də kontur xəritədə şagirdlər, əvvəllər cəmiyyətin ictimai inkişafında müəyyən rol oynamış coğrafi mühitin əhəmiyyətini dərk edirlər. İkincisi, ictimai-tarixi proseslərlə mühüm siyasi hadisələrin ardıcıllığı ilə tanış olurlar. Kontur xəritə üzərində şagirdlər təbii şəraiti, mühüm tarixi hadisələri dərindən mənimsəyirlər.

Aydın olur ki, tarixi biliklərin mənimsənilməsində həm də kontur xəritələrin yeri böyükdür. Bu xəritələr biliklərin mənimsənilməsində malik olduqları xüsusiyyətlərə görə bir-birindən fərqlənirlər. Şagird divar xəritəsində tarixi prosesləri izləyir, kontur xəritədə isə həmin prosesləri praktik surətdə təsvir edir.

Kontur xəritə V-XI sinif şagirdlərində yaradıcılıq qabiliyyətini daha da inkişaf etdirir. Kontur xəritə ilə çalışma prosesində şagird əvvəlcə atlas və dərslik xəritəsində bu və ya digər obyektin yerini, mövqeyini müəyyən edir. Sonra onları kontur xəritəyə köçürmək üçün müvafiq rəngli karandaşlar seçir və işə başlayır. Kontur xəritə ilə iş prosesində şagird yeri gəldikcə qədim silahların, əmək alətlərinin, döyüş sahələrinin və s. təsvirini verir. Nəticədə eyni bir mövzudan bəhs edən iki kontur xəritəni yoxladıqda şagirdlərin hər birinin həmin işi özünəməxsus formada icra etdiyini görmək olar. Deməli, bu proses şagirdlərin yaradıcılıq imkanlarını inkişaf etdirir. Metodist Q.İ.Qoder yazır: "Kontur xəritə ilə iş həmişə özündə yaradıcılıq xüsusiyyətləri daşıyır. Bu da çox zaman xəritənin tərtibatında, rəngli karandaşlar seçməkdə, müxtəlif şərti işarələrin həcmində, xəritədə çəkilmiş xətlərin intensivliyində öz ifadəsini tapır".

Kontur xəritələrin tarixi biliklərin qazanılmasında rolunu aşağıdakı şəkildə şərh etmək olar: Şagirdlərin sinifdəki müstəqil işlərinin təşkilinə yardım göstərir. Divar xəritəsində mənimsənilmiş tarixi bilikləri daha da möhkəmləndirir və onun yadda qalmasını təmin edir. Divar xəritəsində təbii-coğrafi obyektləri şərti işarələrinin düzgün öyrədilməsi üçün imkan yaradır.

Nəzərə almaq lazımdır ki, kontur xəritə üzərində şagirdlərin işi hələ III-IV siniflərdə təşkil edilir və burada bəzi vərdiş və bacarıqlar aşılanır. Burada kontur xəritə ilə çalışmalar öz xarakterinə müvafiq bacarıq və vərdişlər aşılayır ki, bunlar da yuxarı siniflərdə işin təşkilində mühüm əhəmiyyət kəsb edir.

V-XI siniflərdə şagirdlərin kontur xəritələr üzərində çalışmasının səmərəli təşkili üçün müəllim həmin işin bir çox vacib şərtlərini bilməli və yadda saxlamalıdır. Kontur xəritə ilə iş üçün nə tələb olunur? İlk növbədə, müəllim kontur xəritə ilə işləməzdən əvvəl onu ciddi öyrənməli və bu xəritələrin bütün imkanlarına bələd olmalıdır. Kontur xəritə ilə işə hazırlıq iki istiqamətdə olmalıdır. Birincisi, müəllim dərs ilinin başlamasına bir müddət qalmış V–XI sinif dərsliklərinə əlavə olunan xəritələri, tarix atlaslarını və kontur xəritələrini müqayisə etməlidir. O, kontur xəritə ilə dərsliyə əlavə olunan xəritələr və atlaslar arasında olan uyğun və fərqli cəhətləri aydınlaşdırmalı və bunlarda dərsliyin imkanlarını nə dərəcədə ifadə olunduğunu, həmin xəritələrin hər birində müəyyən mövzuların olub-olmadığını aşkara çıxarmalıdır.

Orta məktəbin V-XI siniflərində şa-

girdlərin kontur xəritə üzərində işinin təşkilinə hazırlığın ikinci istiqaməti odur ki, müəllim növbəti dərs üçün kontur xəritədə konkret bir mövzunu diqqətlə nəzərdən keçirir. Hansı əraziləri rəngləyəcəyini, hansı tarixi coğrafi yerləri qeyd edəcəyini qabaqcadan müəyyənləşdirir.

Müəllim dərsə hazırlaşarkən bilməlidir ki, kontur xəritə üzərində çalışmanın bünövrəsini şagirdlərin divar xəritələri ilə işləmək sahəsində qazandıqları bacarıq və vərdişləri təşkil edir.

Aşağı siniflərdə müəllim əvvəlcə şagirdləri kontur xəritələrin quruluşu ilə, onlarla işləməyin qaydaları ilə tanış etməlidir. Növbəti dərsdə isə o, şagirdlərin kontur xəritə üzərində işinin təşkilinə başlayır.

Tarix müəllimləri kontur xəritə üzərində işi müxtəlif qaydada təşkil edir.

Kontur xəritə üzərində işin təşkilinə hazırlaşan müəllim sinifə tapşırıq verərkən həmişə dərsliyin tələbini nəzərə almalı, mövzular üzrə kontur xəritəni doldurarkən tələb olunmayan işarələrin qeyd edilməsinə yol verməməlidir. Kontur xəritələrin mövzular üzrə aparılmasının müsbət cəhəti odur ki, o, şagirdlərin artıq yüklənməsinə yol vermir.

Müəllim şagirdlərə tapşırıq verərkən tarix atlasını və dərsliyə əlavə olunan xəritələri vəhdətdə götürməli, onları kontur xəritə üzərində iş zamanı qarşısında açıq saxlamalıdır. Çünki qeyd olunmalı yerlərin bəziləri atlasda, bəziləri də dərsliyə əlavə olunan xəritələrdə olur. Həmçinin müəllim kontur xəritələr üzrə tapşırıq verən zaman onu ətraflı izah etməlidir ki, şagirdlər nələri işləyəcəklərini dərk edə bilsinlər.

Kontur xəritələr üzrə şagirdlərin işini təşkil edərkən sərf edilən vaxta ciddi riayət etmək lazımdır. Kontur xəritələr üzrə tapşırıqların miqdarı çox olarsa, onda ona 10 dəqiqə, az olarsa 5 dəqiqə vaxt ayrılmalıdır. Bir cəhəti də bilmək lazımdır ki, kontur xəritə üçün vaxtın az və ya çox olması, şagirdlərin işləmə sürətindən də xeyli asılıdır.

Kontur xəritələr üzərində işin təşkili sahəsində ikinci yolu tətbiq edərkən müəllim işə aid heç bir izahat vermir və şagirdlərdən müvafiq yerlərin kontur xəritəyə köçürülməsini tələb edir. Lakin müəllim bu zaman şagirdlərlə işə aid xüsusi izahat aparmasa da hər halda işin gedişinə müəyyən istiqamət verməli və kontur xəritədə hansı məsələnin işləniləcəyini yığcam şəkildə onlara çatdırmalıdır.

Göründüyü kimi, ikinci yolun tətbiqi zamanı müəllim kontur xəritə üzərində çalışmaq üçün tapşırıqları konkret olaraq başa salmır. Yalnız bu sahədə onlara müəyyən istiqamətlər verir. İkinci yolu bütün siniflər üçün məcbur hesab etmək olmaz. Çünki bunun üçün yüksək bacarıq və səviyyə tələb olunur. Lakin yadda saxlamaq lazımdır ki, kontur xəritə üzərində şagirdlərin işinin təşkilində ikinci yoldan istifadə edilməsi heç də bacarıq və vərdişlərin tamamilə başa çatdırılması demək deyildir. Əksinə, bu yoldan istifadə edilməsi bacarıq və vərdişlərin daha da inkişaf etməsi, formalaşması və təkmilləşməsi üçün vacibdir.

Orta məktəbdə şagirdlərin kontur xəritələr üzərində işinin təşkili yalnız yeni mövzunun tədrisi prosesində deyil, həm də təkrar dərslikdə mümkündür.

Dərs prosesində müəllim çox zaman öz şərhində müəyyən döyüşün gedişi, onun nəticələri, sərkərdələrin hərbi planı, niyyəti haqqında məlumat verməli olur. Belə halda o, döyüşün gedişini dərindən mənimsəmək üçün xəritə-sxemdən istifadə edir.

Divar xəritəsindən fərqli olaraq xəritə-sxem məkan vəziyyətini daha geniş miqyasda verir. Əgər divar xəritəsi hər hansı bir tarix dərsinin ayrılmaz ləvazimatıdırsa, kursun ən müxtəlif fəsillərini və ictimai həyatın müxtəlif cəhətlərini öyrənərkən əyani vəsait kimi tətbiq edilirsə, xəritə-sxemin tətbiqi müstəsna hallarda, məhz hərbi-tarixi, yaxud

hərbi-inqilabi mövzuların öyrədilməsi ilə əlaqədar olur.

Beləliklə, aydın olur ki, əgər divar xəritəsində hər hansı bir döyüşün şərti işarələri çarpazlaşmış qılınc və qalxandan ibarət olursa, xəritə-sxemdə bu hərbi əməliyyatın geniş təsviri verilir.

Müəllim xəritə-sxemin əhəmiyyətini araşdırarkən üç əsas məsələyə ciddi fikir verməlidir.

1. Xəritə-sxemdən istifadə hərbi-inqilabi prosesin başlanması, gedişi və verdiyi nəticədə coğrafi mühitin rolunu aşkara çıxarmağa imkan verir.

2. Orta məktəbdə xəritə-sxemdən istifadə edilməsi şagirdlərdə vətənpərvərlik hislərinin aşılanması üçün geniş imkan yaradır.

3. Dərsdə istifadə edilən xəritə-sxemlər tarixi şəxsiyyətin rolunu üzə çıxarmaqda əlverişli vasitədir.

Qeyd etdiyimiz bu cəhətlər bir-biri ilə bağlıdır. Onlar bütün xəritə sxemlərdə təsvir olunan hadisələrin məzmununda əhəmiyyətli motivlər kimi çıxış edir.

Qeyd etmək lazımdır ki, sxemlər bilavasitə müəllim tərəfindən deyil, məhz şagirdlərin özləri tərəfindən təhlil edilir və öyrənilir. Əlbəttə, burada şagirdlərin müstəqil işi bilavasitə müəllimin rəhbərliyi altında həyata keçirilir. Belə iş zamanı müəllim çalışmalıdır ki, sxemlərin məzmunu həddən artıq mürəkkəb olmasın. Çünki sxem mürəkkəb olduqca onun məzmununun müəllimlər tərəfindən açılmasına daha çox ehtiyac hiss edilir.

Xəritə-sxem də digər tarix xəritələri kimi tarixi hadisələr haqqında şagirdlərdə konkret məkan təsəvvürünün yaranmasına kömək edir.

Beləliklə, tam qətiyyətlə deyə bilərik ki, xəritələrin hər üç növündən istifadə etməklə tarix müəllimi fənn kurikulumunun öyrədilməsində xəritədən ardıcıl və səmərəli istifadə etməlidir.

*Rəyçi: prof. M.Əmrahov*



**İstifadə edilmiş ədəbiyyat**


1. Təhsil haqqında Azərbaycan Respublikasının qanunu. Bakı, 2009.
2. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası. // Azərbaycan məktəbi, 2013, № 5.
3. Ümumi təhsil pilləsinin dövlət standartları (Kurikulum). Kurikulum, 2010, №3.
4. Azərbaycan Respublikası ümumtəhsil məktəbləri üçün Ümumi tarix və Azərbaycan tarixi fənni kurikulumları (V-XI siniflər). Kurikulum, 2010, № 3, 4.
5. Vagin A. Orta məktəbdə tarixin tədrisi metodikası. Bakı: Maarif, 1973.
6. Məlikov A. Tarix xəritələri üzərində işin təşkili. Bakı: Maarif, 1983.


**Э.Касумова**
**Р.Гусейнов**

**Об организации работы над картой в связи с применением предметных курикулумов**

**Резюме**

Исторические карты способствуют формированию у учащихся точного представления о местонахождении и времени исторических процессов, способствуют выработке независимости и играют важную роль в расширении мировоззрения.

**E.Qasimova**
**R.Huseynov**

**On organizing the work with maps related to the implementation of subject curriculum**

**Summary**

In the article, the authors note that, historical maps help the students get a more accurate picture of the position of historical processes and their development in the given time period. This, according to the authors, enhances students’ independence and plays a great role in forming their worldview.

# FƏNN KURİKULUMU VƏ KOMMUNİKATİV BACARIQLARIN QAZANILMASI MƏSƏLƏLƏRİ

**Fəridə Hüseynova**
***Təhsil Problemləri İnstitutunun böyük elmi işçisi***

***Açar sözlər:*** *fənn kurikulumu, kompetensiyalar, qlobal səriştə, milli bəşəri dəyərlər, mədəniyyətlərarası ünsiyyət, maraq və tələbat.*

***Ключевые слова:*** *предметный Курикулум, компетенции, глобальная компетенция, национальные ценности, межкультурная коммуникация, интерес и спрос.*

***Key words:*** *curriculum, competences, global competence, national human values, intercultural communication, interest and demands.*

Yeni konseptual təhsilin sənədlərinə əsasən xarici dilin tədrisi ümumi təlim nəticələrinə uyğun olaraq şagirdlərin əldə edəcəyi bacarıqlar əsasında aparılır. Burada vacib şərt fikrini ingilis dilində sərbəst ifadə etməyi bacaran, əməkdaşlıq şəraitində müxtəlif mədəniyyətləri öyrənən gəncləri şəxsiyyət kimi formalaşdırmaqdır. İngilis dilinin ümumi orta təhsil səviyyəsi üzrə tədrisi ibtidai təhsil pilləsində əldə olunmuş bilik və bacarıqların dinamik şəkildə inkişafına əsaslanır. Müasir nəzəriyyə əsasında ingilis dilinin xarici dil kimi praktiki şəkildə tədrisi məktəbdə bu dilin yeni kurikulumunu tələb edir və onun yeni tədrisi prinsiplərinə, siniflər üzrə kurikulumuna, standartlarına, strategiyasına, qiymətləndirilməsinə, sonda əldə olunacaq bacarıqlara yönəldilir.

Xarici dil kurikulumu baza təhsili əsasında şagirdlərin əldə etdiyi dil bacarıqlarını inkişaf etdirmək, intellektual inkişafa nail olmaq, səmərəli fəaliyyət göstərmək, davamlı təhsil almaq və asudə vaxtını təmin etmək məqsədi daşıyır.

Xarici dillərin tədrisi zamanı qarşıya çıxan problemlərin həllində yeni fənn kurikulumu böyük rol oynayır. Xarici dil, Milli Kurikulumun və fənn kurikulumunun ayrılmaz bir hissəsi olaraq məktəb təhsilində əsas dövlət məqsədinin həyata keçirilməsinə xidmət edir – milli və bəşəri dəyərlərə əsaslanmaqla vətəndaş cəmiyyətinin inkişafında rol oynayacaq müstəqil bir şəxsi tərbiyə etmək.

Qarşıya çıxan çətinliklər nədədir?

Şagirdlər xarici dili bir aspektdə mənimsəməyə, dilin linqvistik aspektinə daha çox yer verirlər. İngilis dilini linqvistik qaydaları öyrənərək reseptiv dil kimi şifahi və yazılı nitqin inkişaf etdirilməsinə yönəldilməlidir. Yeni məzmuna uyğun mövzular məntiqi, tənqidi və yaradıcı təfəkkürün formalaşmasına az əsaslanırdı, qrammatik qaydalar nümunələr üzərində deyil, modellər daxilində əzbərlənir və praktiki formada az tətbiq olunurdu. Dilin linqvistik prinsipini xarici dilin tədrisində onun fonologiyası, leksik məzmunu, morfologiyası, semantikası kimi başa düşülürdü.

Bu gün ölkəmiz qərb dünyasında beynəlxalq nüfuz qazanmış və bir çox qlobal məsələlərin həllində həlledici rol oynayan qurumlarla əlaqə quraraq beynəlxalq münasibətlərini, ölkələrarası diplomatik, mədəni və iqtisadi əlaqələrini genişləndirir. Ölkəmiz

bu sahələrdə öz nailiyyətlərini əldə etmək üçün bir çox sahələrdə islahat apardı, xüsusilə də təhsilin dünya standartlarına inteqrasiyasını ön plana çəkdi və Milli Kurikulumun yaranma zərurəti meydana çıxdı. Xarici dil fənni geniş bir status qazanaraq bu sahələri özündə birləşdirən bir fənn kimi özünün yeni məzmun xətləri və məzmun standartları ilə təlimdə böyük dəyişikliklər etdi. Fənnin əsas mahiyyəti və vəzifəsi bu gün xarici dilə yiyələnən şəxsin bilavasitə beynəlxalq arenaya çıxaraq öz xalqının milli-mənəvi dəyərlərini, qazandığı nailiyyətləri başqalarına çatdırmaq, onlarla həmin dildə fikir və təcrübə mübadiləsi aparmaq imkanı qazandırmaqdır.

Bu gün gənclərin çoxu tərəqqi etməkdə olan ABŞ-a və Avropa ölkələrinə üz tutaraq elmdə, təhsildə, iqtisadiyyatda, digər sosial və mədəni sahələrdə inkişaf perspektivlərini müəyyən edirlər. Bunun səbəbləri, ilk növbədə, həmin ölkələrdə qeyd olunan sahələrdə, yüksək standartların mövcud olması və həmin ölkələrin bu standartları öz sərhədlərindən kənara çıxarmaq və inkişaf etməkdə olan ölkələrlə paylaşmaq üçün müəyyən siyasi kursa malik olmasıdır.

Avropa standartlarına inteqrasiya və Azərbaycanı qlobal dünyanın kiçik bir məkanına çevirmək, sivil və mədəniyyətlərarası dünyagörüşə malik, başqa fəaliyyətlərlə yanaşı, bir və ya iki xarici dildə ünsiyyət qurmağı, əlaqə saxlamağı bacaran şəxsiyyətin formalaşdırılması müasir məktəbin mühüm vəzifələrindən biridir. Təhsildə inteqrasiya meyilləri real olaraq mənəvi-psixoloji dəyərlərin yaxınlığından, qlobal problemlərin həllinə birgə qoşulmaqdan, gənclərin "mədəniyyətlərarası ünsiyyət potensialı" çərçivəsinin genişləndirilməsinin zəruriliyindən yaranır.

Bu gün Avropa Şurası tərəfindən orta məktəblər üçün xarici dilin tədrisində qlobal kompetensiyalar təklif edilir ki, bu da yeni fənn kurikulumu dörd məzmun xətti daxilində inkişaf etdirilir. Həm linqvistik, həm kommunikativ, həm də sosial-mədəni vərdişləri inkişaf etdirən yeni fənn kurikulumu xarici dilin tədrisində mühüm vərdişlər müəyyən etmişdir. Bunlar, əsasən, aşağıdakılardır:

- iki və ya çox xarici dildə danışmaq;
- müxtəlif situasiyalarda kommunikasiya qurmaq;
- fərqli kontekstləri və mətnləri anlamaq;
- biliyini müstəqil şəkildə dərinləşdirmək, dil, yaxud da mədəni baxışlarını zənginləşdirmək.
- başqa xarici dilləri müstəqil şəkildə öyrənmək.

Dilianlama və dildən istifadəetmə bacarığı əsasında öz gələcək maraq və tələbatlarını təmin edir. Xarici dildə müxtəlif mədəniyyətlər haqqında genişəhatəli biliyə, anlamaya və təcrübəyə malik olmaq sonrakı təhsilə hazır olmaq üçün öz təcrübələrini inkişaf etdirərək peşə təliminə və işləmək qabiliyyətinə yiyələnmək vacib amillərdəndir.

Bilik əsaslı cəmiyyətdə gedən sürətli dəyişikliklərlə əlaqədar yaranan ehtiyaclara yol verən müsbət dəyərlər və münasibətləri qurmaq və bacarıqları necə əldə etmək yollarını öyrənir.

Məzmun xətləri üzrə dil bacarıqlarının qazanılması.

Bu gün xarici dil dərslərini müasir kurikulumların tələblərinə uyğun standartlar çərçivəsində və fəal/interaktiv təlim şəraitində qurmaq tələb olunur. Müasir xarici dil fənn kurikulumunun məzmun standartlarının müəyyənləşdirilməsində idraki və kommunikativ bacarıqların formalaşdırılması əsas götürülmüşdür. Yeni məzmun xətləri əsasında kontekstdə, istənilən situasiyada qrammatikanın və yeni sözlərin tətbiqi əsasında

dinləyib-anlama, danışma, oxu və yazı vərdişləri tənqidi və yaradıcı təfəkkürün qazanılmasına yol açaraq şagirdlərin real ünsiyyət vərdişlərinin formalaşdırılmasına xidmət edir. Məzmun standartları müəyyən edilərkən idraki, informativ-kommunikativ və yaradıcı fəaliyyətlərin əsasında ünsiyyət və psixomotor bacarıqların formalaşdırılması nəzərdə tutulmuşdur.

Buraya dil sistemi və dil bacarıqlarının təkmilləşdirilməsi aiddir:

Dilin sistemi dildə fonoloji sistemdən – səslərdən, sözlərin düzgün tələffüz olunmasından, cümlə quruluşu, sözlərin ayrı-ayrı mənaları, qrammatik cəhətdən sözlərin bir-biriləri ilə bağlılığı və cümlədə hansı funksiya daşımasından ibarətdir.

Dilin sisteminin əsası olan fonologiyanın, qrammatikanın, leksikanın, lüğətin təqdimatının ayrıca yox, dinləyib-anlama, danışıq, oxu, yazı fəaliyyətləri daxilində öyrədilməsinin və bunun əsasında şagird biliyinin qiymətləndirilməsinin aparılmasını təşkil etmək.

a) Dinləyib-anlama və danışıq fəaliyyətində səslərin, sözlərin və cümlələrin tələffüzü, vurğu, ritm, intonasiya vasitəsilə tanınmasını, sadə sözləri işlətməklə dialoqların qurulmasını, yeni ideya və informasiyaları asanlıqla anlayaraq şagirdlərin xarici dildə öz fikirlərini ifadə etməyini təmin etmək.

Oxu və yazı fəaliyyətlərində yeni sözlərin öyrənilməsi, mətnlərin müxtəlif üsullarla mənimsənilməsini, sərbəst, yaradıcı yazı fəaliyyətini inkişaf etdirmək, tapşırıqlı təlim (Task Based Learning) və layihələr üzərində (Project Based Learning) təlimin fəal/interaktiv təlim şəraitində aparılmasını təşkil etmək və qarşılıqlı ünsiyyətin, kommunikativ vərdişlərin qazanılmasını təmin etmək. Bütün fəaliyyət xətləri üzrə strategiyaların tətbiqi aşağıdakı mərhələlərdə həyata keçirilir:

b) Kommunikasiya yaratmaqla (Building Communication)

c) Tapşırıqlar əsasında (Task Based Learning)

d) Layihə əsaslı təlim (Project Based Learning)

e) Tədqiqatlar və müqayisələr aparaq (Researching and Comparing)

f) Problemlərin həlli və təqdimatlarla (Solving the problems through Presentations)

g) Nəticə və dəyərləndirmə (Summarizing and evaluating)

h) Yaradıcı tətbiq və yeni fikir yaratma (Extension stage)

Xarici dil məzmun standartlarının əsas komponenti olan bilik və fəaliyyətin məqsədi xarici dilin qazanılmasında ümumi linqvistik biliklərə, kommunikativ bacarıqlara və mədəni dəyərlərə yiyələnməkdir. Kommunikativ bacarıqların formalaşmasında aşağıdakı qlobal səriştələr müəyyən edilmişdir:

Ümumi bacarıqlar (Generic skills)

• əməkdaşlıq bacarıqları; (collaboration skills)

• kommunikasiya/ünsiyyət bacarıqları; (communication skills)

• yaradıcılıq bacarıqları; (creativity)

• tənqidi təfəkkür bacarıqları; (critical thinking skills)

• informasiya texnologiya bacarıqları; (information technology skills)

• hesablama bacarıqları; (numeric skills)

• problemi həll etmək bacarığı; (problem-solving skills)

• özünü idarəetmə bacarıqları; (self-management skills)

• təhsil almaq bacarıqları (study skills).

Bunları nəzərə alaraq nəticədə xarici

dil fənn kurikulumu dilin öyrənilməsi prosesində şagirdləri aşağıdakılarla təmin edir:

• dil bacarıqlarına yiyələnmək;

• kommunikativ vərdişləri inkişaf etdirmək;

• asudə vaxtını səmərəli təşkil etmək;

• sosial tələbatını ödəmək;

• şəxsi və intellektual inkişafa nail olmaq;

• ömrü boyu öyrənmək;

• mədəniyyətlərarası dialoqa və qloballaşma prosesinə qoşulmaq.

Xarici dildə ümumi bacarıqlar üç istiqamətdə inkişaf etdirilir:

➢ Fərdlərarası (Interpersonal)- ünsiyyət yaratmaq üçün,

➢ Bilik (Knowledge) – biliklərə yiyələnmə və inkişaf etdirmə,

➢ Təcrübə (Experience) – real və təsviri təcrübəni çatdıra bilmək.

Fərdlərarası (Interpersonal)- ünsiyyət yaratmaq üçün

1. Məktəb, iş yerləri və cəmiyyətdə əlaqələr yaratmaq və möhkəmləndirmək.

2. Fikir, düşüncə, ideya, maraq, təcrübə, rəy və planlarla bağlı söhbətlər, müzakirə və müqayisə aparmaq, əsaslandırmaq, izah etmək və dəyərləndirmək.

3. Müxtəlif auditoriyalar və məqsədlər üçün şifahi və yazılı kompleks məlumatların verilməsi.

4. Görüləcək işlərin planlaşması, inkişafı, təşkili, həyata keçirilməsi və dəyərləndirilməsində əməkdaşlıq etmək.

5. Real modelləşmiş vəziyyətlərdə məqsədlərin, xidmət və məlumatların daha geniş diapozonda əldə edilməsi və təmin olunması.

Bilik (Knowledge) – biliklərə yiyələnmə və inkişaf etdirmə

1. Tanış olan və olmayan mövzularda olan məlumatları aşkar edir, seçir, təhlil edir, təşkil edir və təqdim edir.

2. Geniş və mürəkkəb məlumatları aşağıdakı fəaliyyətlər vasitəsilə şərh edərək tətbiq etmək:

- müəyyən etmək, ardıcıl sıraya düzmək, təsnif etmək, müqayisə etmək, təsvir etmək;

- sintez etmək, əsaslandırmaq, proqnoz vermək, yekunlaşdırmaq, nəticə çıxarmaq, nəticəyə gəlmək, qiymətləndirmək.

3. Şifahi və yazılı mətnlərdə olan ideyaları, problemləri, mövzuları, arqumentləri, mübahisələri, təsvirləri, görünüşləri, nöqteyi-nəzərləri və münasibətləri müəyyən etmək, tənqidi müzakirə etmək, onlar arasında əlaqə yaratmaq, tənzimləmək, ideyaları ümumiləşdirmək, fikrində ifadə edərək tətbiq etmək.

4. Verilmiş informasiyadan daha çox mürəkkəb problemləri faktlarla əlaqələndirərək müəyyən etmək, seçimləri tədqiq etmək, müzakirə etmək, problemləri həll etmək, qiymətləndirmək və onun həlli yollarını əsaslandırmaq, alternativ təkliflər vermək.

5. Yazılı mətnləri bir də nəzərdən keçirərək yeni ideyalar vermək, tənzimləmək, yenidən təşkil etmək, sərbəst və yaxud əməkdaşlıq şəraitində yaradıcı şəkildə fikrini ifadə etmək.

Təcrübə (Experience) – real və təsviri təcrübəni çatdıra bilmək.

Bu mərhələdə şagirdlər artıq qazandıqları bilik və kommunikativ vərdişlərdən istifadə edərək təcrübələrini aşağıdakı şəkildə nümayiş etdirirlər:

a) dinləyib-anlama və şifahi nitq vərdişlərini inkişaf etdirərək mətnin məzmununa aid təqdimatlar verir, rollu oyunlar, dramatik təqdimatlar, solo və kollektiv deklamasiyalar, improvizasiyalar hazırlayır;

b) ədəbi mətnləri və hekayələrin geniş təsvirini yaradaraq müzakirə edir, mətnlərin təqdimatında iştirak edir, mətndəki hadisələrə, xarakterlərə, süjetlərə yazılı və şifahi

şəkildə öz fikrini bildirir, mətni səhnələşdirərək pantomimo və tamaşalar hazırlayırlar;

c) kiçik monoloqlar, dramatik səhnələr hazırlayır, jurnal və gündəliklər yazaraq öz fikirlərini sərbəst ifadə edir, şifahi raportlar, məruzələr hazırlayır, media bukletləri hazırlayır, müsahibələr təşkil edir, disklər tərtib edir, videofilmlər çəkir, fotokartoçkalar tərtib edir, kiçik hekayə və şeir yazır, mətnin məzmununu şeir və musiqi şəklində təqdim edir.

Son illər Azərbaycanla Avropa ölkələri arasında müxtəlif sahələrdə münasibətlər inkişaf etməkdədir. Qərb və Şərqin qovşağı kimi öz tarixi rolunu bu gün də gerçəkləşdirən Azərbaycan Avropa və Amerikaya inteqrasiya yönündə vacib addımlar atmaqda davam edir.

*Rəyçi: dos. A.İsmayılova*

**İstifadə edilmiş ədəbiyyat**

1. Xarici dil Fənn kurikulumu. Azərbaycan Respublikası Təhsil Nazirliyi, 2012.
2. İsmayılova D. İngilis dili tədrisi metodikası. Azərbaycan Dillər Universiteti, 2011.
3. Baruah, T.C. The English Teacher's Handbook. Delhi: Sterling Publishing House. 1991.
4. Brown G. and Yule G. Teaching the Spoken Language. Cambridge: Cambridge University Press. 1983.
5. Harmer J. The Practice of English Language Teaching. London: Longman, 1984.

**Ф.Гусейнова**

**Предметный курикулум и задачи приобретения коммуникативных навыков**

**Резюме**

В статье говорится о коммуникативном изучении языка через предметную призму Курикулума. Есть много способов приобретения знания иностранного языка и получения глобальной коммуникативной компетенции-практиковать. В этой статье были пояснены разработки различных методов социальных навыков.

**F.Huseynova**

**Subject curriculum and problems of gaining communicative skills**

**Summary**

In the article, it is spoken about developing of communicative language learning through subject curriculum. The author speaks about ways of acquiring foreign language on practicing communicative skills and gaining global competences. All the different methods of developing social skills have been clarified in this article.

***Psixologiya***

# XARAKTERLƏRDƏ MİLLİ-MƏNƏVİ DƏYƏRLƏR VƏ ONUN TƏDQİQİNƏ DAİR

**İsfəndiyar Novruzlu**
***Heydər Əliyev adına Azərbaycan Ali Hərbi Məktəbinin professoru, psixologiya elmləri doktoru***

***Açar sözlər:*** *genealogiya, xalqın psixologiyası, xarakterin səviyyələri, xalqın ruhu.*
***Ключевые слова:*** *генелогия, психология народа, уровни характера, дух народа.*
***Key words:*** *genealogy, psychology of the nation, levels of personality, nation's spirit.*

Xarakteri tədqiq etmək cəhdləri hələ qədim zamanlardan olmuşdur. Xarakterin təsnifatı üzrə ilk cəhd Platona məxsusdur. O, etik prinsiplər əsasında xarakterin tipologiyasını yaratmışdır. "Xarakteristika" sözündən ilk dəfə qədim yunan filosofu Teofrast (eramızdan əvvəl) insanın əxlaqi keyfiyyətlərini üzə çıxartmaq üçün istifadə etmişdir. Teofrastdan sonra XVII əsrdə Labryuyer də xarakteristika sözündən insanın əxlaqi keyfiyyətləri üçün istifadə etmişdir.

Deməli, əvvəl xarakter termini insanın ictimai-əxlaqi vəziyyətini müəyyənləşdirmək üçün işlədilmişdir. XIX əsrdən isə psixoloji mənada işlədilməyə başlandı. A.Ben xarakteri intellektin fərdi xüsusiyyəti kimi, R.F.Lesqaft iradənin xüsusiyyəti kimi, Ribo hiss və iradənin xüsusiyyəti kimi vermişlər. Xarakterin tədqiqinə zahiri görünüşün onun müəyyən şəxsiyyət tipinə məxsusluğu arasında bağlılıq haqqında elm-fizioqnomika əhəmiyyətli dərəcədə təsir göstərmişdir.

XIX əsrin birinci yarısında xarakter haqqında elm yaranmağa başladı. Frenologiyanın yaradıcısı Qall insan xarakterinin təşəkkül tapdığı 27 elementar psixi xüsusiyyətləri sadalayır, onların arasında artıq törəmə instinktləri, övlada məhəbbət, bağlılıq, dostluq, dağıdıcı instinkt, mübarizəyə və özünümüdafiəyə meyilliyi qeyd etmək olar. XIX əsrin sonlarında xarakter problemi üzrə ilk maraqlı əsərlər kimi F.Cordonun "İnsanın genealogiya və bədəni nöqteyi-nəzərdən xarakter" və F.Polanın "Xarakterin psixologiyası" kitabları meydana gəldi.

XX əsrdən başlayaraq, xarakteri müəyyən psixi prosesin xüsusiyyəti kimi deyil, bütövlükdə şəxsiyyətin xüsusiyyəti kimi izah etməyə çalışmışlar.

Xarakterin istiqamətlənməsinin fərqli cəhətləri dispozisiya (A.Stern) fəaliyyətə təhrik etmə münasibətlərin əsası kimi açıqlanırdı.

XX əsrin əvvəllərində A.F.Lazurski ilk dəfə olaraq təkcə insanın subyektiv xüsusiyyətlərini deyil, həm də onun dünyagörüşünü, ictimai baxışlarını nəzərə alan xarakterin psixososial təsnifatını yaratmağı təklif etdi. Lazurski insanın ətraf mühitdə uyğunlaşma dərəcəsindən və ətraf mühitin insana hansı dərəcədə təsir göstərməsindən asılı olaraq 3 psixoloji səviyyə ayırd edirdi: aşağı səviyyə-kifayət qədər uyğunlaşmaq qabiliyyətinə malik olmayan insanlar; ali səviyyə; yaradıcı səviyyə. O, ətraf mühiti dəyişən insandır. Bu üç uyğunlaşma və üstünlük səviyyələrini

nəzərə alma əsasında Lazurski xarakterin aşağıdakı təsnifatını təklif etmişdir: aşağı səviyyə; 1) ağıllı tip 2) affektiv, hərəkətli, xəyalpərəst 3) fəal tip, enerjili, inadkar. Orta səviyyə: 1) praktik olmayan nəzəriyyəçilər, idealistlər 2) praktiklər, idealistlər, alturistlər, ictimaiyyətçilər, hökmlülər. Ali səviyyə: Bu insanlara şüurluluq, ruhi duyğuların uzlaşması, ali insani ideallar xasdır.

Z.Freyd xarakterin formalaşmasında tam fərqli bir yanaşma yaratdı. Fərdi xarakterlərin tipologiyasını tədqiq edən Z.Freyd xarakterin strukturu ideyasını əsas götürərək sübut etmişdir ki, müəyyən əlamətlərdən əsas xarakterin formalaşdırılması formulunu çıxartmaq olar, həm də nəzərə almaq lazımdır ki, daimi əlamətlər ya dəyişilməyən ilkin impulsları, ya da onların sublimasiyasını və ya onların yaratdığı reaktiv törəmələrini təmsil edir. Z.Freyd xarakteri oral-passiv, oral-təcavüzkar, anal xarakterə və genital xarakterə ayırırdı. Müasir psixoanalitiklər, xüsusilə A.Louenin tipoloji modelində xarakterin aşağıdakı tiplərini ayırır: oral, mazoxist, əsəbi, fallik-narsis, şizoid. Müasir amerika psixologiyasında xarakter iki alternativ tərəfdən istifadə olunur: 1) Xarakter-şəxsiyyətin əxlaqi və mənəvi baxışıdır. 2) Xarakter şəxsiyyətin sübutlara nöqteyi-nəzəridir. Kettelə görə, xarakter insanın müəyyən münasibətlərdə davranışında özünü büruzə verən, şəxsiyyətin əldə etdiyi daha sabit zəruri xüsusiyyətlərin fərdi uyğunluğudur. Bunlar aşağıdakılardır: 1) özünə münasibət (tələbkarlığın, tənqidin, özünüqiymətləndirmənin dərki) 2) başqalarına münasibət (fərdilik və ya kollektivçilik, eqoizm və alturizm, qəddarlıq və ya xeyirxahlıq, laqeydlik və ya həssaslıq, kobudluq və ya nəzakət, yalançılıq və ya düzgünlük və s. 3) tapşırılan işə münasibət (tənbəllik və ya işgüzarlıq, səliqəlilik və pintilik, təşəbbüskarlıq və passivlik, səbrlilik və səbrsizlik, məsuliyyətlilik və məsuliyyətsizlik) 4) xarakterin iradi keyfiyyətlərində öz əksini tapır (çətinlikləri, mənəvi və fiziki ağrıları dəf etməyə hazır olmaq, sərbəstliyin, intizamın, inadkarlığın dərəcəsi). Ribo öz işlərində xarakterin əhəmiyyətini göstərib və mənəvi inkişafının həqiqi bünövrəsini xarakterin yaratdığını etiraf edir.

Prof. College de France deyir ki, "Ağıl psixi təkamülün əlavə formasıdır. Onun əsas forması xarakterdir. Ağılın həddindən artıq inkişafı onun məhvinə gətirib çıxarır".

İ.P.Pavlovun baş-beyin böyük yarımkürələri qabığında cərəyan edən əsas sinir proseslərinin xassələrinə-oyanma və ləngimənin qüvvəsinə, müvazinətinə, mütəhərrikliyinə istinad edərək ali sinir fəaliyyəti tipləri haqqında irəli sürülən təlim insanın fərdi psixi xüsusiyyətlərinin, o cümlədən xarakterinin fizioloji əsaslarını şərh etmək imkanı verir. Pavlov adamları sinir prosesləri xassələrinə görə 4 tipə ayırmış və onların 4 temperament tipinə uyğun gəldiyini söyləmişdir.

Ç.Kerschensteynerin fikrincə, xarakter insan ruhunda sabitləşmiş prinsiplər vasitəsilə hər iradi davranışın tam və müəyyən olması ilə ruhun formalaşmış halıdır.

Allporta görə, xarakter, "insanın oturuşmuş, müstəqil şəxsiyyəti ilə çətinlikləri aradan qaldıran və hissi əsasları olan şəxsiyyət əlamətidir (yönüdür).

A.P.Çexov belə hesab edirdi ki, yazıçı sadəcə olaraq talant deyil, o həm də xarakterdir. A.Adler isə, xarakteri "həyatın məsələləri qarşısında insan ruhunda meydana gələn müxtəlif ifadə şəkilləri" olaraq qəbul edir və xarakterin anadangəlmə deyil, əksinə, sosial əsasları olan bir anlayış kimi nəzərdən keçirirdi. Xarakterin anadangəlmə, yoxsa sonradan qazanılma olması həmişə psixoloqlar arasında mübahisə doğurmuşdur. Bir çox psixoloqlar, o cümlədən A.Adler xarakterin genetikayla əlaqəsini göstərən heç bir əlamətə rast gəlmədiyini qeyd etmiş, bir qisim tədqiqatçılar isə xarakterin forma-

laşmasında genetikanı əsas götürmüşdür. Xarakterin formalaşması haqqında qədim zamanlardan iki mühüm nəzəriyyə formalaşmışdır. Bu nəzəriyyələr biogenetik və sosiogenetik nəzəriyyələrdir. Biogenetik nəzəriyyənin tərəfdarları düşünürlər ki, xarakterin inkişafı bioloji, irsi amillərdən asılıdır. Müasir alimlər belə hesab edirlər ki, uşaq yalnız zahiri görkəminə görə deyil, həm də xarakterinə görə müəyyən dərəcədə atasına və anasına oxşayır. Bunun səbəbi uşağın ata və anasından irsən keçən informasiyalara sahib olmasıdır. Deməli, xarakterin formalaşmasında irsi amillərin rolunu inkar etmək olmaz. Sosiogenetik nəzəriyyənin tərəfdarları isə xarakterin formalaşmasında əsas olaraq ictimai mühiti, təlim və tərbiyəni götürürlər. Sosioloji baxımdan xarakter insanın birlikləri, həyat tərzi ilə əlaqəli olan və davranışlarında təzahür edən sabit, oturuşmuş düşüncə tərzinin məcmusudur.

Hər iki nəzəriyyəni birtərəfli adlandırmaq olar. Çünki xarakterin formalaşmasında həm irsi amillər, həm də sosioloji amillər birgə fəaliyyət göstərirlər.

Bunlarla yanaşı, “xarakterin” uşaqlıqdan formalaşmağa başlaması, uşaq dünyaya gəldikdə potensial olaraq xarakter əlamətlərini daşıması, bunların bir qisminin psixoloji yetişkənlik, bir qisminin də ətraf mühitin təsiri ilə formalaşması, yenə də dəyişməyən xüsusiyyətlərin qalması haqqında yanaşmalar həqiqətə uyğundur. Bu baxımdan, V.Şternin irsiyyət və ictimai mühit faktorlarının bir-birinə mexaniki təsirindən ibarət olan konvergensiya nəzəriyyəsi maraqlıdır. Bu nəzəriyyəyə görə həm bioloji amillər-irsi informasiyalar, həm də ictimai amillər qazanılmış xarakterin formalaşmasına səbəb olur.

Xarakter haqqında yaranan təlimlərin və xarakterin məsələsinə yaranan marağın artması ilə yeni elm sahəsi xarakteriologiya yaranmışdır. Xarakteriologiya elmi psixologiya elmləri içərisində xüsusi əhəmiyyətə malikdir. Çünki şəxsiyyətin mühüm tərkib hissəsi olan xarakter insanın bir şəxsiyyət kimi formalaşmasında başlıca amildir.

*Rəyçi: prof. H.Əlizadə*

**İstifadə edilmiş ədəbiyyat**

1. Bayramov Ə. Şagirdlərdə əqli keyfiyyətlərin inkişaf xüsusiyyətləri. Bakı, 1967.

2. Əlizadə Ə. Yeni pedaqoji təfəkkür. Bakı, 2001.

3. Алиев Б. Методология социално-психологическое исследования. Баку, 1995.

4. Kerschenstayner G. Xarakter kavramı ve terbiyesi. Çev. H.F.Kanad. Ankara, 1977.

5. Adler A. İnsanı tanımaq sanatı. Çevirdi S. Başar. İstanbul, 1977.

**И.Новрузлу**

**Национально-духовные ценности в характерах и об их исследованиях**

**Резюме**

Статья посьящена изучению патриотизма, национальных ценностей в характерах курсантов авиаторов. Основное внимание направлено на формирование новых ценностей у курсантов авиаторов.

**I.Novruzlu**

**About the investigation of national-moral values in characters**

**Summary**

In the article, it is spoken about the study of the sense of patriotism and national moral values in the characters of students-aviators. The main focus is made on formation of new values and new characteristics of patriotism in students-aviators.

# MƏKTƏB PSİXOLOQUNUN İŞİNƏ DAİR

**Vəfa Nağıyeva**
***Bakı Dövlət Universitetinin müəllimi,***
***psixologiya üzrə fəlsəfə doktoru***

***Açar sözlər:*** *məktəb psixoloqu, pedaqoq-psixoloq, psixoloji xidmət.*
***Ключевые слова:*** *школьный психолог, педагог-психолог, психологическая служба.*
***Key words:*** *school psychologist, pedagogue-psychologist, psychological service.*

"Məktəb psixoloqu", "pedaqoq–psixoloq" kimi məfhumlar müstəqilliyimiz dövründə öz müasir anlamında yeni status almış və inkişaf etməyə başlamışdır. Doğrudur, onların məqsəd və vəzifələrini, funksiyalarını dəqiq müəyyənləşdirməyə ehtiyac yoxdur. Lakin hər kəs öz problemlərini müəyyənləşdirməyə cəhd göstərməlidir.

Çox da uzaq olmayan sovet keçmişində bugünkü məktəb psixoloqunun məqsəd və vəzifələri başqa yanaşma və meyarlarla tənzimlənirdi. Hazırda isə onun təhsil sistemində yeri, funksiyaları, fəaliyyət istiqamətləri yeniləşən dünyanın ruhuna uyğun olaraq yeni məzmun və məna kəsb etməkdədir.

Qısa bir məqalədə məktəb psixoloqunun hazırlanmasından tutmuş onun kifayət qədər geniş fəaliyyət dairəsinə daxil olan və fəaliyyətinin daxil olduğu sferadakı çoxsaylı problemləri nəinki təhlil etmək, hətta sadalayıb qurtarmaq belə, mümkün olmadığı üçün ən başlıca məqamlardan söz açmaq lazım gəlir.

Psixoloq, xüsusilə gənc mütəxəssis üçün məktəb nəhəng bir sosial institutdur. Psixoloq məktəbə nə üçün lazımdır? Onun məktəbdəki rolu nədən ibarətdir? Əvvəla, qarşıda psixoloqun məktəbdəki rolunu düzgün anlamaq və dəyərləndirmək üçün müasir psixologiya elminin nailiyyətləri, bu elmin qarşısında açılan perspektivlər, onun hüdudları barədə aydın təsəvvürə malik olmaq zərurətinə toxunulmalıdır. İkincisi, psixologiya pedaqogikanı əvəz edə bilməz. Üçüncüsü də, digər elmlərdə olduğu kimi, ən yeni eksperimental psixologiyada da məlumatlar bərabər qiymətli deyil. Bu baxımdan, psixologiyanın gəldiyi nəticələr pedaqogika üçün də həmişə məcburi olmur. Onları yalnız tutuşdurmadan, yoxlamadan, tənqidi (yaradıcı) yanaşmadan sonra qəbul etmək lazım gəlir. Deməli, pedaqogika ilə psixologiya arasında daim əlaqə və mehriban əməkdaşlıq, fikir və nəticə mübadiləsi olmalıdır. Eləcə də pedaqoqlarla psixoloqlar arasında.

Məktəb uşaq üçün də sosiumu mənimsəmək mərkəzidir. Psixoloq uşağa bu təcrübəyə davranışı ilə, öz mövqeyini qurmaqla yiyələnməkdə kömək edir. Uşaqda dərk olunmuş dünyaqavrayışı əmələ gəlir. Psixoloqun başlıca mövqeyi uşaqlar üçün həyat sistemləri və bu sistemləri seçmək şəraiti yaratmaqdır. Uşaqların maraq və imkanlarının həlli üçün onlarla pedaqoqlar arasında zəruri təşkilati həlqə kimi məhz psixoloq çıxış edir.

Pedaqoji məsələlərin formalaşdırılması şəraiti də psixoloqun uğurlu işindən asılıdır. Psixoloq uşaqların mənimsəməsindəki geriliyin və ya aqressivliyinin səbəblərini aşkarlayır, sonra valideynlərilə iş aparır. Beləliklə, psixoloq, valideyn və pedaqoqların uğurlu əməkdaşlığı baş tutur və birgə fəaliy-

yətləri lazımi nəticələr verir.

Psixoloqun məktəbdəki işi təhsil prosesi ilə ayrılmaz şəkildə bağlıdır. Digər tərəfdən, mütəxəssislər haqlı olaraq yekdil bir fikirdədirlər ki, məktəb psixoloqu yalnız uşaqlarla deyil, eləcə də onların valideynləri ilə və pedaqoqlarla işləyir, bütövlükdə məktəbdə psixoloji xidməti həyata keçirir. Deməli, məktəb psixoloqunun fəaliyyət sferası olduqca genişdir. Bu fəaliyyətin aşağıdakı başlıca istiqamətləri belə ayırd edilir:

psixoloji maarifləndirmə; psixoloji profilaktika; məsləhət; psixodiaqnostika; korreksiya; peşəorientasiyası fəaliyyəti.

Mütəxəssislər həm də bütün bu sadalanan başlıca istiqamatlər üzrə fəaliyyətin sinxron və eyni dərəcədə səmərəli olmasını zəruri sayırlar.

Lakin məktəb psixoloqunun bütün işi sadalanan istiqamətlərlə məhdudlaşmır. Məsələn, psixoloqlar müəllimlərə psixoloji – pedaqoji araşdırmalar aparmaqda da kömək edə bilirlər.

Aydındır ki, bu qədər geniş fəaliyyət spektrinin öhdəsindən gəlmək xüsusi bilik, bacarıq və məharət tələb edir. Unutmaq olmaz ki, məktəb psixoloqunun fəaliyyətində ən əsas istiqamət problemi öncədən bildirməkdir.

Psixoloqun ümumtəhsil məktəblərində işi bir sıra problem – xüsusiyyətlərlə də səciyyələnir. Məsələn:

1) Məktəbdə psixoloji işin təşkilinin dəqiq, sabit alqoritmi olmadığı halda, istiqamətlər spektri genişdir.

2) Məktəbdə psixoloqun işi məktəbin özünün spesifikası ilə əhəmiyyətli dərəcədə şərtlənir.

3) Psixoloqun işinə məktəb müdiriyyəti tərəfindən etibarlı metodiki kömək.

4) Məktəbdə əvvəllər psixoloqun, yaxud psixoloji xidmətin olub-olmaması.

5) Psixoloqların da işi tez-tez yaranan qeyri-standart situasiyalarla bağlıdır.

6) Müəllimlərin, valideyn və şagirdlərin əksəriyyətində psixoloqun fəaliyyəti haqqında sərt stereotip təsəvvürlərin olması problemi də vardır.

Məktəblilərin çoxunda psixoloqlar haqqında konkret təsəvvür var. Onlar bilirlər ki, psixoloq kimdir və o nə etməlidir. Lakin psixoloqlar haqqında bu stereotip təsəvvürlər çox zaman bir qədər qeyri-adekvat olur. Çünki formalaşmış əminliyi dəyişmək yenisini formalaşdırmaqdan daha çətin və mürəkkəbdir. Ona görə də məktəblilər arasında psixoloji biliklərin təbliği az səmərəli olur. Belə ki, psixoloqun verdiyi və yaxud özünə aid istənilən informasiya onların öz əminlik prizmasından qarşılanır və qavranılır. Yanlış və təhrif olunmuş təsəvvürlər (stereotiplər) məktəb psixoloqunun psixoloji fəaliyyətinin inkişafını da əngəlləyir.

Göründüyü kimi, məktəb psixoloqunun iş istiqamətləri spektri geniş olduğu kimi, buradakı elmi-nəzəri və praktiki problemlər də qat-qat çoxdur.

*Rəyçi: fəlsəfə doktoru E.Məmmədova*

**İstifadə edilmiş ədəbiyyat**

1. Битянова М. Организация психологической работы в школе. М., 1998.

2. Овчарова Р. Справочная книга школьного психолога. М., 1996.

3. Рабочая книга школьного психолога / Под ред. Дубровиной И.В. М., 1991.

**В.Нагиева**

**О работе школьного психолога**

**Резюме**

В статье повествуется о работе школьного психолога.

**V.Nagiyeva**

**About the school psychologist**

**Summary**

The article is dedicated to the activity of school psychologist.

***Təhsil islahatı fəaliyyətdədir***

# MƏKTƏBİMİZ QABAQCILLAR SIRASINDADIR

**Əlisultan İbrahimov**
***Hacıqabul rayonu Rəncbər kənd tam orta məktəbinin direktoru, əməkdar müəllim***

***Açar söz:*** *təhsil islahatı, sertifikatlar, internet və lokal şəbəkə.*
***Ключевая слова:*** *реформа образования, сертификаты, интернет и локальная сеть.*
***Key word:*** *education reform, certificates, internet and local network.*

Hacıqabul rayonunun ən qabaqcıl məktəblərindən biri də Rəncbər kənd tam orta məktəbidir. Bu təhsil ocağı 1928-ci ildən ibtidai, 1934-cü ildən yeddiillik, 1937-ci ildən səkkizillik və 1956-cı ildən orta məktəb kimi fəaliyyət göstərir. Məktəb binası 1979-cu ildə istifadəyə verilib, 2012-ci ildə əsaslı təmir olunub, 824 şagird yerlikdir. Məktəbdə "Mədəd" HTİB tərəfindən 5 ədəd, Təhsil Nazirliyi tərəfindən 12 ədəd kompyuter dəsti 2 otaqda quraşdırılmışdır.

Məktəbə rəhbərlik işi Azərbaycan Respublikası Təhsil Nazirliyinin qəbul etdiyi qərarlara, əmr və sərəncamlara, normativ sənədlərə, təhsilin inkişafı, formalaşdırılması, məktəb işinin yenidən qurulması haqqında irəli sürülən elmi-metodiki göstərişlərə və qəbul edilmiş yeni təhsil qanununa müvafiq şəkildə qurulmuşdur. Ona görə də pedaqoji kollektiv ayrı-ayrı illərdə yüksək təhsil göstəricilərinə nail olmuş, respublika məktəbləri arasında özünəməxsus yer tutmuşdur.

Məktəbdə təhsil islahatının tələbləri ilə bağlı şagirdlərə keyfiyyətli təlim vermək və onları gələcəyə hazırlamaq sahəsində əsaslı işlər görülmüşdür. İndi təlim prosesində qarşıya gənc nəslə öyrənməyi öyrənmək, öyrəndiklərindən həyatda istifadə etmək bacarığını aşılamaq kimi məqsəd və vəzifələr qoyulmuşdur. Bunun üçün məktəb şagirdlərə əvvəlcədən müəyyən olunmuş milli standartlara uyğun bilik verməyə, onlarda müvafiq bacarıqlar formalaşdırmağa və vərdişlər yiyələndirməyə nail olmalıdır.

Məktəbin pedaqoji kollektivi yeni metodlar ilə işləməyə, dərslərdə müasir texnologiyalardan istifadə etməyə daha geniş yer verir. Məktəbdə İKT ilə bağlı mövcud layihə geniş formada həyata keçirilir. İnformatika kabinetində və bir neçə fənn kabinetlərində internet və lokal şəbəkə yaradılmışdır. Müəllimlər dərs prosesində müasir texnologiyalardan, proyektorlardan geniş istifadə edirlər.

Tədris planına uyğun olaraq yeni fənn kurikulumlarının tətbiqi ilə işləyən I-VI siniflərdə dərs deyən müəllimlər təkmilləşmə kurslarından keçmiş və sertifikatlar almışlar. Məktəbin müəllimləri mütəmadi olaraq kurslara cəlb olunurlar.

Məktəbin məzunlarından görkəmli elm adamları yetişmişdir. Belə ki, akademik Bilal Dadaşov, akademik Nizami Süleymanov, fizika-riyaziyyat elməri doktoru, professor Əli Məmmədov məktəbimizin yetirmələridir. Məktəb bu gün də öz ənənələ-

rini qoruyub saxlayır. Məktəbin 2001-ci il məzunu Zeynalov İlkin Akif oğlu rayonun tarixində ilk dəfə 658 bal toplayıb Azərbaycan Neft Akademiyasının mühəndis iqtisadiyyatı fakültəsinə qəbul olunub, hazırda iqtisadiyyatda uğurla çalışır. Məktəbin 2009-cu il məzunu Məmmədova Günay Əbülfəz qızı 655 balla Azərbaycan Tibb Universitetinin müalicə işi fakültəsinə qəbul olunub, Prezident təqaüdünə layiq görülüb. Rayonun Prezident təqaüdünə layiq görülmüş ilk şagirdidir. Hazırda təhsil əlaçısıdır. Məktəbin 2010-cu il məzunu Məmmədova Gülər Hüseyn qızı 631 balla Azərbaycan Tibb Universitetinin pediatriya fakültəsinə qəbul olunub. Hazırda əla və yaxşı qiymətlərlə oxuyur. Məktəbin 2011-ci il məzunu Mənsimov Məhəmməd Zahid oğlu 619 balla Azərbaycan Tibb Universitetinin müalicə işi fakültəsinə qəbul olunub. Son 5 ildə attestat alan 173 nəfərdən 57 nəfəri ali məktəblərə, 16 nəfəri isə orta ixtisas məktəblərinə qəbul olunmuşlar. Bunlardan 3 nəfəri 600-dən artıq, 8 nəfəri 500-dən artıq, 14 nəfəri isə 400-dən artıq bal toplamışlar.

Tələbə Qəbulu üzrə Dövlət Komissiyası tərəfindən 2009-cu ildə ali məktəblərə qəbulun elmi-statistik təhlilinin nəticələrinə görə məktəbimiz rayonun ən yaxşı məktəbi kimi qeyd olunmuşdur, 2010-cu ildə ali məktəblərə qəbulun elmi-statistik təhlilinin nəticələrinə görə məktəbimiz respublika üzrə yaxşı məktəblərin sırasına daxil olub. 2012-ci ildə isə "Ən yaxşı ümumi təhsil müəssisəsi" adına layiq görülmüşdür.

Tələbə Qəbulu üzrə Dövlət Komissiyası tərəfindən ali məktəblərə qəbulun elmi-statistik təhlilinin nəticələrinə görə Rəncbər kənd tam orta məktəbi son illər respublika üzrə yaxşı məktəblərin sırasındadır.

Milli-mənəvi, əxlaqi dəyərlərə hörmət, Vətənə, torpağa, ədəbiyyata, müasirliyə məhəbbət ruhunun aşılanması üçün məktəbimizdə vaxtaşırı görkəmli sənət, elm, ədəbiyyat xadimləri ilə görüşlər keçirilir. Şagirdlərin intellektual səviyyəsinin daha da yüksəldilməsi üçün elmi-praktik konfranslar, disputlar, dəyirmi masalar təşkil olunur. Tarixi abidələrə, şəhid və milli qəhrəmanların adlarını daşıyan abidə komplekslərinə ekskursiyalar şagirdlərin mənəvi dünyasını daha da zənginləşdirir.

Məktəbimizin yuxarıda göstərilən bu uğurlara nail olmasında, gənc nəslin şəxsiyyət kimi formalaşmasında, doğma Azərbaycanımız üçün layiqli, vətənpərvər vətəndaşların yetişməsində müəllimlərimizdən dil-ədəbiyyat müəllimi Seyidbəyim Məmmədova, riyaziyyat müəllimləri Qənimə İsrafilova, Mehriban Qasımova, kimya müəllimi Əlikram Hüseynov, fizika müəllimi Ələkbər Mənsimov, ibtidai sinif müəllimləri Sahibə Rüstəmova, Kürsüm Hüseynovanın əməyi xüsusi ilə diqqətə layiqdir.

Məktəbimizin pedaqoji fəaliyyəti dövlətimizin daim diqqət mərkəzində olmuşdur. Möhtərəm Prezidentimiz İlham Əliyev cənablarının sərəncamı ilə məktəbin direktoru Ə.İbrahimov əməkdar müəllim fəxri adına layiq görülmüşdür. Riyaziyyat müəllimi Qənimə İsrafilova Təhsil Nazirliyinin "Qabaqcıl təhsil işçisi" döş nişanına layiq görülmüşdür.

Bu gün məktəbimiz cəmiyyətimizin fəal qurucularının, yüksək əxlaqi keyfiyyətlərə malik vətənpərvər gənclərin yetişdirilməsinə xidmət edir.

Bütün bunların bünövrəsi Azərbaycan dövlətini quran, onu yaradıb bizlərə ərmağan edən ümummilli liderimiz Heydər Əliyev tərəfindən qoyulmuşdur.

Elmimizdə, təhsilimizdə bugünkü tərəqqiyə, xüsusilə təhsilimizə göstərdiyi diqqət və qayğıya görə məktəbimizin pedaqoji kollektivi möhtərəm Prezidentimiz İlham Əliyev cənablarına, Heydər Əliyev Fondunun prezidenti, millət vəkili Mehriban xanım Əliyevaya öz dərin minnətdarlığını bildirir. Bu etimaddan ruhlanan pedaqoji kollektiv daha əzm və inamla işləməyi özünə borc bilir.

# UĞURLARIMIZ BİZİ ARXAYINLAŞDIRMIR

**Yaqub Tahirov**
***Qəbələ rayonu İ.Abdulkərimov adına Nohurqışlaq kənd tam orta məktəbinin direktoru***

Ölkəmizdə hər bir sahədə müşahidə olunan fasiləsiz inkişaf tendensiyası özünü təhsil sahəsində də göstərməkdədir. Çünki bu inkişafın əsasında ulu öndər Heydər Əliyevin ideyaları və həmin ideyaların işığında həyata keçirilən aydın və ardıcıl strateji kurs dayanır. Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin rəhbərliyi ilə müəyyənləşdirilən və icra edilən dövlət proqramları təhsil sistemində keyfiyyətcə yeni inkişaf meyillərinin əldə edilməsinə, yüksək nəticələrin qazanılmasına geniş imkan və şərait yaradır. Ölkədə keçirilən təhsil islahatları təhsil siyasətinin səmərəliliyini artıran nəticələrə gətirib çıxarır.

Respublikada həyata keçirilən təhsil islahatı təhsil müəssisələrinin fəaliyyətində, bütövlükdə təhsil sisteminin strukturu, idarəsi və iqtisadiyyatında köklü yeniləşmənin keçirilməsini nəzərdə tutur. Hər bir məktəb rəhbəri bilir ki, tədrisin keyfiyyətinin yüksəldilməsi naminə müəllimlərdə zəruri bilik, bacarıq və vərdişləri inkişaf etdirmək lazımdır. Ölkədə görülən qlobal işlər də məhz bu məqsədi güdür.

Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası və bu strategiyada nəzərdə tutulan təhsilin 12 illik olması, ibtidai siniflərdə fənlərin bir və ya bir neçə müəllim tərəfindən tədrisi, monitorinq və qiymətləndirmə sahəsində görülən işlər, pedaqoji təmayüllü ali təhsil müəssisələrində kurikulumların öyrədilməsi səviyyəsi, eləcə də müəllimlərin ixtisaslaşma dərəcəsi, yeni kurikulumların tətbiqi ilə əlaqədar treninqlərin aparılması, icbari təhsilin müddəti və s. məsələlərlə bağlı aparılan fikir mübadilələrində müəllimlərimizin fəal iştirakı, demək olar ki, gündəlik uğurlarımızın əsasını təşkil edir.

Təhsil nazirimiz cənab Mikayıl Cabbarovun dediyi kimi “Aparılan məqsədyönlü islahatlar ölkəmizi müasir inkişaf səviyyəsinə çatdırmaqla yanaşı, həm də gələcək üçün etibarlı zəmin yaradıb”.

Azərbaycan təhsil sistemində aparılan islahatlar dünya təhsil təcrübəsini öyrənməyə müəyyən nəticələr çıxarmaqda və təhsildə müəllim roluna, şagird nailiyyətlərini qiymətləndirməyə geniş imkan verir. Təhsildə nailiyyətlərimiz, hər şeydən əvvəl, dövlətin təhsilə qayğısından, diqqətindən çox asılıdır. Xalqımızın ümummilli lideri Heydər Əliyev çox gözəl demişdir: “Təhsil millətin gələcəyidir”. Qəbələ rayonu İ.Abdulkərimov adına Nohurqışlaq kənd tam orta məktəbi öz işini məhz bu şüar altında qurmuşdur.

Məktəbimiz 1937-ci ildən 7 illik, 1954-cü ildən isə orta məktəb kimi fəaliyyət göstərir. Bu illər ərzində məktəbimiz çox böyük uğurlar əldə etmişdir. Gərgin əmək nəticəsində bu gün məktəbimiz respublikada tanınan məktəblərdəndir. İndi məktəbimizi bitirmiş neçə-neçə müəllimlər, elmlər doktoru və elmlər namizədi, Azərbaycan Respublikası Prezident Aparatında, Nazirlər Komitəsində işləyənlər, çoxlu iş adamları, ziyalılar vardır.

Uğurların nəticəsidir ki, Azərbaycan Respublikasının Prezidenti Heydər Əliyevin sərəncamı ilə 2010-2011-ci illər təhsil sahə-

sində respublikada 50 ən yaxşı məktəblərdən biri də bizim Nohurqışlaq məktəbi oldu. 2013-2014-cü ildə məktəbimizi bitirən 44 məzundan 22 nəfərinin respublikada ən yüksək ali məktəblərə daxil olması məktəbdə təhsilin ən yüksək səviyyədə olmasından xəbər verir. Bu il də uğurlarımızın yüksək olacağından əminik. 2013-2014-cü illərdə respublikada keçirilən fənn olimpiadasında məktəbimizin şagirdlərindən Tahirli Nərgiz kimya fənni üzrə 2-ci yeri, Əzizli Vüsalə isə tarixdən 3-cü yeri tutmuşdur.

Məktəbimizdə yüksək hazırlıqlı, şəxsi keyfiyyəti ilə fərqlənən müəllimlər çoxdur. Bunlardan F.Atakişiyev, F.Mirzəyeva, F.Mehduyev, H.Məmmədova, O.Mehdiyev, M.İsayeva, M.Məmmədova, İ.Abdurahmanovanı misal göstərmək olar.

Fənn olimpiadasının qaliblərini təltif etmək üçün Təhsil Nazirliyi görüş təşkil edib. Təhsil naziri M.Cabbarovun şəxsi nəzarəti altında keçirilən olimpiadalar mütəşəkkil, şəffaf keçirilib, qiymətləndirmə isə ədalətli olmuşdur. Olimpiadada qalib olan Tahirli Nərgiz və Əzizli Vüsalənin hər birinə diplom və planşet hədiyyə verilmişdir. Olimpiadada qalib olan Tahirli Nərgiz öz təəssüratlarını belə bölüşmüşdür.

Olimpiadada qalib gələcəyimə əmin idim. Çünki keçən il də iştirak etmişəm və 4 - cü yeri tutmuşam. Təbii ki, bu il də uğur gözləyirdim. Suallar asan olsa da bir sual orta məktəbdə keçmədiyim mövzuya aid idi. Ona görə də mənə çətin gəldi. 4 sualımı tam cavablandırdım. Nəticəmdən tam razıyam. Olimpiadanın təşkilindən mən də razı qaldım. Kimya üzrə yarışların keçirildiyi Kimya və Biologiya təmayüllü liseydə finalçılara yaxşı şərait yaradılmışdı. Nəzarət də kifayət qədər yüksək idi. Səmimi mühit mövcud olduğundan heç bir həyəcan keçirmirdim. Ötən il də olimpiadada iştirak etdiyim üçün müqayisə apararaq deyə bilərəm ki, bu ilki yarışma məhz obyektivliyi ilə ötən ildəkindən xeyli yüksək oldu.

Uğuruma özüm də, məktəbimizin kollektivi də xeyli sevindi. Bu sevinci bizə yaşatdığına görə olimpiadanın əsas təşkilatçısı olan Təhsil Nazirliyinə minnətdarlığımı bildirirəm. Bizim məktəbdən daha bir şagird 10-cu sinifdə oxuyan Vüsalə Əzizli də tarix olimpiadasının qalibi oldu. Bu faktın özü mənim fikrimcə olimpiadanın necə obyektiv keçirildiyini sübut edir. Mən məktəbimizin rəhbərliyinə, müəllimlərimizə də təşəkkür edirəm. Onlar bizim üzərimizdə çox əziyyət çəkirlər. Yəqin ki, bu qələbəmi ömrü boyu xatırlayacağam. Axı o mənim ilk böyük qələbəmdir.

Qeyd etmək lazımdır ki, hər hansı bir tədris materialının məzmunu, mahiyyəti ilə bağlı şagirdlər müəllimin və dərsliyin verdiyi hazır bilikləri müstəqil olaraq mənimsəməyə daha çox maraqlanırlar. Unutmaq olmaz ki, bütün fənlər inteqrasiya olmaqla tədris edilməlidir.

Qarşımızda Azərbaycan təhsilinin böyük perspektivləri açılmışdır. Bu işdə sadə müəllimlərdən tutmuş əməkdar müəllim, elm, maarif fədailəri, adi müəllimlərlə yanaşı vəzifədə olan direktor və onun tədris-təlim üzrə müavinləri, təqaüddə olan təhsil işçiləri fədakarlıq göstərməlidir. Təhsilimizin tərəqqisi yolunda müəllim-şagird münasibətlərinin yeni tələblərə uyğun formalaşdırılması, dərsliklərdəki materialların təsir gücünün artırılması, şagirdlərdə milli qürur, vətənpərvərlik və millətsevərlik hissinin gücləndirilməsi sahəsində aparılan işlərin səviyyəsi yüksəldilməlidir. Təhsilimizin dünya təhsilinə inteqrasiyası gündəlik tələbata çevrilməlidir.

Bütün bunlar isə, ilk növbədə, məktəbdə idarəetmə işinin yeniləşdirilməsi ilə bağlıdır. Uğurlarımız da bundan asılıdır.

# BİR DƏRSİN İCMALI

**Pərvanə Həsənova**
***Saatlı şəhər 1 nömrəli tam orta məktəbin fizika müəllimi***

Kurikulumda fizika üzrə qarşıya qoyulan vəzifələrin həcmi elədir ki, onları uğurla yerinə yetirmək üçün həm sinif, dərs məşğələlərindən, həm də sinifdənxaric işlərin müxtəlif formalarından kompleks şəkildə istifadə olunmalıdır. Bəzən dərsliklərin, proqramların ağırlığı, çətinliyi ilə rastlaşsaq da bu hal müəllimə haqq qazandırmır ki, şagirdin sualı cavabsız qalsın. Müəllim hər dərsini elə qurmalıdır ki, şagird dilemma qarşısında qalmasın. Dərsdə bir məqsəd var ki, mövzu, şərhlər müəllimin səviyyəsinə enməsin, əksinə, müəllimin səviyyəsi fənnin ucalığına istiqamətlənsin. Respublikamızda uğurla həyata keçirilən təhsil islahatının indiki mərhələsində digər fənlərlə yanaşı fizika üzrə də müasir dərsliklər, şagirdlər üçün iş dəftərləri və müəllimlər üçün metodik vəsaitlər hazırlanmışdır. Lakin konkret hər bir dərsdə müəllimin öz dəsti-xətti olmalıdır. Bu məqsədlə bir dərsin nümunəsini oxuculara təqdim etməyi lazım bildim.

**VI sinifdə fizika dərsi.**

**Mövzu: Kütlə və onun ölçülməsi.**

**Standartlar**

- 1. Maddələr quruluşuna (aqreqat hallarına) görə fərqləndirilir.
- 2. Materiyanın formaları fərqləndirilir.
- 3. Maddənin quruluşuna (aqreqat hallarına) dair məsələlər həll edilir.
- 4. Sadə ölçü cihazlarından istifadə edilir.

**Məqsəd**

- Kütlənin maddənin əsas xassəsi olduğu şərh olunur və onun mahiyyəti açılır.
- Cismin kütləsi qollu və elektron tərəzi vasitəsi ilə ölçülür.
- Kütlənin BS-dəki vahidi digər vahidlərlə əvəz edilir.
- Mövzuya aid məsələlər həll edilir.

**İnteqrasiya**

- H. – b. – 1.1.1

**İş forması**

- Bütün siniflə iş, qruplarla iş

**Üsullar**

- Beyin həmləsi, müzakirə, müşahidə

**Resurslar**

- Dərslik (6-cı sinfin “Fizika” dərsliyi)
- İşçi vərəqləri
- Qollu tərəzi
- Elektron tərəzi
- Müxtəlif kütləli cisimlər
- Çəki daşları
- Sxem
- Cədvəl
- Ensiklopediya
- İKT vasitələri

**Dərsin gedişi**

**Motivasiya**

- Masanın üzərində olan cisimləri ağırlığına görə necə sıralamaq olar?

**Tədqiqat sualı**

Bəs cisimlərin ağırlığını necə müəyyən etmək olar?

**Yönəldici suallar**

Hər şagirdin öz masasının üstündəki kitabın, qələmin, dəftərin, vərəqin ağırlığına görə sıralanması

Bütün bunlar keçəcəyimiz Kütlə və onun ölçülməsinə xidmət edir.

**Tədqiqatın aparılması**

- Müəllim tədqiqat işini aparmaq üçün şagirdləri üç qrupa ayırıb, onlara işçi vərəq-

ləri paylayır.

▸ Vaxt təyin edib, tapşırıqları işləmək üçün dərslikdən səh. 61-də 15-ci mövzudan istifadə edərək işçi vərəqlərindəki tapşırıqları yerinə yetirmələrini tapşırır.

**Günəş qrupu**

1.15-ci mövzudan istifadə etməklə kütlə nədir? sualına cavab yazın.

2. BS-də kütlə vahidi?

3. Kütlə hansı cihazla ölçülür?

4. Məsələ: filin kütləsi 1.32 tondur. Onu kq-a çevirin.

**Ulduz qrupu**

1. Qollu tərəzidən istifadə qaydalarına əməl edərək cisimlərin tək – tək çəki və kütlələrini təyin edin.

2. Qiymətlərin nəticələrini cədvələ qeyd edin.

3. Məsələ: verilən kütlələri kiçikdən böyüyə olmaqla ardıcıl sıralayın: m1= 0,2 kq; m2=0,002 t; m3=400 q; m4=359 q.

**Ay qrupu**

1. Elektron tərəzidən istifadə etməklə, mayelərin kütlələrini təyin edin.

2. Nəticəni işçi vərəqində qeyd etdiyiniz cədvəldə qeyd edin.

3. Məsələ: Tarazlıqda olan tərəzinin sağ gözündə 1 ədəd 50 q-lıq ; 2 ədəd 10 q-lıq və 4 ədəd 2q-lıq çəki daşı qoyulmuşdur. Sol gözdəki cismin kütləsi nə qədərdir?

**Tədqiqatın aparılması**

Məlumat mübadiləsi və müzakirə

▸ Hər qrup lideri öz işini təqdim edir. Əldə etdikləri məlumatları digər şagirdlərlə bölüşdürürlər. Qiymətləndirmə aparılır və nəticə sonda deyilir.

Müəllim hər təqdimata öz əlavələrini edir. Əlavə: kütlə cismin ağırlıq dərəcəsini ifadə edir. Cismin ağırlığı ondakı maddənin miqdarından asılıdır. Belə ki, cisimdəki maddənin miqdarı nə qədər çox olarsa, o daha ağır olar.

Beynəlxalq Vahidlər sistemində (BS) kütlə vahidi 1 kq qəbul olunmuşdur. Kütlə vahidi olaraq Platin və İridiumdan hazırlanmış xüsusi ölçülü silindrin kütləsi qəbul edilmişdir. Bu vahid kiloqram (1 kq) adlanır.

Həmin etalon Paris şəhəri yaxınlığında yerləşən Sevr şəhərində saxlanılır. Başqa ölkələrdə bu etalonun nömrələnmiş surətləri vardır.

Praktikada kq-dan böyük və kiçik vahidlərdən də istifadə olunur;

Ton – 1(t) ; qram – 1 (q) ; milliqram – 1 (mq) ;

Ümumiləşdirmə və nəticə

▸ Şagirdin cavabı ümumiləşdirilir və istiqamətləndirici suallarla aşağıdakı nəticələr çıxarılır:

▸ Eyni həcmli və formalı müxtəlif cisimlərin kütlələri də müxtəlif ola bilər.

▸ Eyni materialdan olan müxtəlif həcmli cisimlərin kütlələri də müxtəlifdir.

▸ Cismin kütləsi müxtəlif vahidlərlə müxtəlif qiymətlər alır.

Beləliklə, şagirdlər axtarış fəaliyyəti prosesində bilik əldə etməyi öyrənir, təlim tapşırıqlarını yaradıcı həll etməyə imkan qazanır. Məlumdur ki, uğurlu təlimin arxasında şagirdin yaradıcı təxəyyül və təfəkkürə yiyələnməsi məqsədi durur.

Hansı fənnin tədrisindən asılı olmayaraq müəllim təlimin təşkilinə verilən tələbləri nəzərə almalıdır. O, pedaqoji prosesin tamlığını diqqətdə saxlamalı, təlimdə bərabər imkanların yaradılmasına, onun şagirdyönümlü, inkişafyönümlü olmasına çalışmalıdır. Həmçinin təlim zamanı şagirdlərin fəaliyyətləri stimullaşdırılmalı, sinifdə dəstəkləyici mühit yaradılmalıdır. Fizika üzrə bütün dərsliklərin rəngarəng tədrisi o fənni şagirdlərə sevdirir.

***İnnovasiyalar***

# TƏHSİL SİSTEMİNİN İNKİŞAFINDA MÜƏLLİM HAZIRLIĞINA DAİR

**Şəhla Cəlilzadə**
***Azərbaycan Müəllimlər İnstitutunun kabinet müdiri, dissertant***

***Açar sözlər:*** *təhsil sistemi, təlim texnologiyaları, inklüziv təhsil, pedaqoji ustalıq.*
***Ключевые слова:*** *образование, технологии обучения, инклюзивное образование, педагогическое мастерство.*
***Key words:*** *education system, training technologies, inclusive education, pedagogical skills.*

“Azərbaycan - 2020: gələcəyə baxış” İnkişaf Konsepsiyasında qeyd edilir: “Təhsil sisteminin səmərəliliyində, onun nailiyyətlərinin formalaşmasında müəllim amilinin həlledici əhəmiyyətini nəzərə almaqla müəllim hazırlığının gücləndirilməsinə xüsusi önəm veriləcəkdir. Bütün ümumi təhsil müəllimləri üçün fəal (interaktiv) təlim texnologiyaları və inklüziv təhsil üzrə məqsədli ixtisasartırma təmin ediləcək, hər bir müəllimin İKT bacarıqlarına yiyələnməsi üçün çevik sistem yaradılacaqdır.” Konseptual sənəddə ehtiva olunan fikirlərdən aydın olur ki, təhsil sisteminin inkişafında qlobal səciyyə daşıyan müəllim hazırlığı mühüm əhəmiyyət kəsb edir.

Xalqımızın ümummilli lideri Heydər Əliyev demişdir: “Müəllim sənəti, peşəsi cəmiyyətdə yüksək qiymətə layiq olan bir peşədir. Müəllim olmaq kimi şərəfli bir iş yoxdur. Çünki müəllim xalqın elminin inkişaf etməsinin əsasını qoyanlardandır”.

XXI əsrin tələblərinə uyğun olaraq şagirdlərdə mənəvi keyfiyyətlər (çeviklik, bilikləri müstəqil qazanmaq, dostluq, əməkdaşlıq, öz xalqının və dünya sivilizasiyasının dəyərləri ilə tanış olmaq və s.) formalaşdırmaq, planetimizin hər yerində eyni tələblərin həlli müəllim qarşısında başlıca vəzifə kimi durur.

Deməli, müasir dövrdə müəllimin təlim hazırlığının aşağıdakı istiqamətlərdə təkmilləşdirilməsinə ciddi zərurət vardır:

- Peşə fəaliyyətinin ümumi əsasları;
- İxtisas sahələri;
- İnnovasiyalar.

Dünya təcrübəsindən aydın olur ki, müəllimin səriştəlilik və peşəkarlıq səviyyəsinin yüksəldilməsində interaktiv təlim metodlarından səmərəli istifadə bacarığı vacibdir. Məhz buna görə də Azərbaycan təhsilində uğurla həyata keçirilən təlimin məzmunu və metodları, öyrədici mühit, qiymətləndirməni özündə birləşdirən model milli zəminə söykənməklə dünya təcrübəsi əsasında öyrənilir, ümumbəşəri dəyərlərə müvafiq olaraq tətbiq edilir.

Müəllim hazırlığının başlıca amil olması dünyada aparılan məzmun islahatları və standartlara əsaslanan təhsil sisteminin qurulması ilə bağlıdır.

Ali pedaqoji məktəblərdə müəllim kadrlarının hazırlığını müasir tələblər səviyyəsində qurmaq üçün əmək bazarının rəqa-

bətinə uyğun öz təhsilini daim artıran, biliyin yeni nəslə verilməsi texnologiyasına yiyələnən mütəxəssislərin yetişdirilməsinə zərurət yaranmışdır. Bu baxımdan, müəllimin səriştəliliyi və peşəkarlığı ilə bağlı olan bütün elmi, nəzəri, praktik və metodik əsasların tədqiq olunması aktual problem kimi qarşıda durur.

Pedaqoji elmlər sistemi pedaqogikaya daxil olan elmlərin məcmusu olub, başlıca vəzifəsi insanın şəxsiyyət kimi formalaşmasını həyata keçirən təlim-tərbiyənin məqsədyönlü tələblərini reallaşdırmaqdır. Burada, ilk növbədə: məktəbəqədər pedaqogika; məktəb pedaqogikası; orta ixtisas məktəbi pedaqogikası; xüsusi pedaqogika; ali məktəb pedaqogikası; hərbi pedaqogika; istehsalat pedaqogikası; mədəni fəaliyyət pedaqogikası; pedaqogika tarixi; ailə pedaqogikası; müqayisəli pedaqogika və b. nəzərdə tutulur.

Qeyd olunan pedaqoji istiqamətlərin hər birinin obyekti eyni olsa da, predmetləri müxtəlifdir. Məsələn, ali məktəb pedaqogikası ali təhsil sistemi müəssisələrində (institut, universitet, akademiyalar) pedaqoji prosesin aktual problemlərini araşdırır, təlim, tərbiyə, təhsilin məzmununu, səmərəli yol və vasitələri və s. məsələləri müəyyən edir.

Ali pedaqoji məktəblərdə təhsil alan tələbələrin bilikləri, müstəqil mənimsəmə vərdişlərinin artırılması, tədris prosesində yeni elmi nəticələrlə tanış edilməsi, təlim texnologiyalarından istifadə bacarıqlarının formalaşdırılması onların yaradıcılıq imkanlarını artırır.

Təhsil sisteminin inkişafında əhəmiyyətli dərəcədə rol oynayan müəllim amilinin keyfiyyət baxımından inkişafında gənc pedaqoji kadrların hazırlığını "öyrənməyi öyrətmək" texnologiyası prinsipinə uyğun reallaşdırmaq vacib şərtdir. Ancaq etiraf etməliyik ki, uzun illərdir ki, biliyin hazır şəkildə yeni nəslə ötürülməsi texnologiyası müasir tələblərə, dünyada baş verən inkişaf sürətinə cavab vermir. Pedaqoqlar bu sahədə baş verən dəyişiklikləri təhsil paradiqmasına keçid kimi dəyərləndirirlər. Hazırkı dövrdə ali pedaqoji məktəblərdə təhsil alan gələcəyin müəllimi müstəqil işini tədris prosesinin ayrılmaz tərkib hissəsi kimi qəbul etməlidir.

Aparılan müşahidələr göstərir ki, ali pedaqoji məktəblərdə oxuyan tələbənin müəllimlik peşəsinin tələblərinə uyğun formalaşdırılmasını təmin edən müstəqil işinin tədris prosesində həyata keçirilməsinə təlimin məqsədi kimi yanaşılmır. Unutmaq olmaz ki, səriştəli və peşəkar müəllimin formalaşmasında ən mühüm qanunauyğunluqlar onun tələbəlik illərində müstəqilliyinin artırılması, biliklərin mənimsənilməsində interaktiv metodlardan bacarıqla istifadə edilməsi, yaradıcılıq qabiliyyətinin inkişafı ilə şərtlənir. Müəllimin başlıca funksiyası pedaqoji prosesdə öyrənənin təlim məqsədlərinə yiyələnməsini təmin etmək üçün onu tədqiqata yönəltməkdir.

Ali pedaqoji məktəbdə təhsil alan tələbə gələcəkdə müəllim adını əməli fəaliyyətində doğrultmaq üçün, ilk növbədə, müstəqil iş, onun planlaşdırılması, forma və metodları, təşkili və nəticəsini alqoritmik olaraq reallaşdırmağı bacarmalıdır.

Araşdırmalardan məlum olur ki, müstəqil iş problemi ən çox ümumi didaktik, psixoloji və metodik istiqamətlər üzrə tədqiq olunmuşdur. M.İ.Maxmutovun, İ.Y.Lernerin, N.A.Polovnikovun, L.Q.Vyatkinin və başqalarının bu sahədə dəyərli tədqiqatları vardır.

Təhsildə uğurla həyata keçirilən islahatların pedaqoji texnologiyaların tətbiqi ilə reallaşdırılması ali məktəbdə tələbənin idrak fəaliyyətinin inkişafı və məntiqinin gücləndirilməsinə optimal şərait yaradan müstəqil tədqiqatçılıq funksiyasının icrasına xidmət etməlidir.

Müşahidələr göstərir ki, tələbənin biliklər qazanmasında təlimin əsas təşkili forması olan mühazirələr ənənəvi səciyyə daşıyır. Əslində, tələbələr mühazirədə nəzərdə tutulan elmi biliklərə pedaqoji texnologiyadan səmərəli istifadə etməklə müstəqil ola-

raq yiyələnməlidirlər. Ali pedaqoji məktəbdə təhsil alan tələbələrlə aparılan sorğu zamanı aydın olur ki, onların əksəriyyəti mühazirənin mahiyyətini proqram materialının ardıcıl şərhində görürlər.

İcmallaşdırılmış tezislər əsasında oxunan, tələbə ilə dialoqa üstünlük verilən, sual-cavab üzərində qurulan mühazirələrin hər birində öyrənənlərə biliklərin aşılanması texnologiyaları fərqli xarakter daşıyır. Məşhur alman pedaqoqu və psixoloqu A.Disterverqin mövzu ilə bağlı çox məntiqli fikrinə görə, pis müəllim həqiqəti təqdim edir, yaxşı isə onu tapmağı öyrədir.

Azərbaycan Respublikasında demokratik və humanist prinsiplərə üstünlük verilməsi pedaqoji kadr hazırlığında mühüm əhəmiyyət daşıyaraq bilik, bacarıq, vərdiş, münasibət, ünsiyyət və əməli qabiliyyətlərin formalaşmasını təmin edir. Pedaqoji ustalıq təlim-tərbiyə fəaliyyəti ilə məşğul olan müəllimlərin professionallığı ilə müəyyən olunur. Müasir əməkdaşlıq pedaqogikası öyrənənlərlə münasibətlərin demokratikləşməsinə yönəlir. Ali pedaqoji məktəblərdə kadr hazırlığının müasir tələblərə uyğun aparılması "Pedaqogika" fənninin fəal təlim metodları ilə tədrisi texnologiyasından çox asılıdır. Pedaqogikanın obyekti insanın formalaşması, həyata hazırlanması, zəruri olan bilik, bacarıq və vərdişlərə yiyələnməsi prosesidir. Predmeti isə bu prosesin pedaqoji nöqteyi-nəzərdən tədqiq edilməsidir. İnteraktiv pedaqogika bilik, bacarıq və vərdişlərə yiyələnmə prosesini fəal təlim mexanizmlərinin köməyi ilə texnolojiləşdirir. Yəni fəal təlimin metod və üsullarından pedaqoji prosesin optimallaşdırılması üçün istifadə olunur. Ali pedaqoji məktəblərdə kadr hazırlığının keyfiyyətinin yüksəldilməsində qeyd olunan amil mühüm rol oynayır.

Ali məktəbdə pedaqogikanı tədris edən mütəxəssis fəal-interaktiv təlimin məzmununa daxil olan anlayışlar, mexanizmlər, fəal dərsin quruluşu, öyrədici mühit və onun təşkili, planlaşdırma və fasilitasiya bacarıqları, metod və texnikaların səmərəli tətbiqinə nail olmalıdır. Pedaqogikanın tədrisində təlimin səmərəliliyini təmin edən psixoloji mexanizmlər (problemli vəziyyətin yaradılması, dialoq və əməkdaşlığın zəruriliyi, tələbə tədqiqatçı, müəllim fasilitator, psixoloji dəstək, hörmət və etibar) reallaşdırılmalıdır.

Hazırda "İnteraktiv pedaqogika" ifadəsinə tez-tez rast gəlirik. Bu anlayışı ilk dəfə 1975-ci ildə alman tədqiqatçısı Hans Frits işlətmişdir. Ona görə təlimdə interaktivlik öyrədən və öyrənənin qarşılıqlı təsir - əməkdaşlıq qabiliyyəti kimi başa düşülməlidir. Cəmiyyətin inkişafı pedaqoji kadrların hazırlığında yeni tələblər irəli sürür. Bu isə pedaqoji prosesin təkmilləşməsini, yeni məzmun, forma və metodlar tətbiq etməyi zəruri edir.

Pedaqoji sistemin intensiv və ekstensiv yollarla təkmilləşdirilməsi keyfiyyətcə yeniləşməlidir. Yeni metodların tətbiqi, şagirdlərin müstəqil olaraq bilik və bacarıqlara yiyələnmələri interaktiv pedaqogikanın imkanlarına daxil olub, intensiv səciyyə daşıyır. Ekstensiv yol pedaqoji prosesə əlavə vaxt və vəsait sərf etməklə reallaşır. Məsələn, təlim müddətini uzatmaq, proqramları genişləndirmək və s.

Pedaqoji texnologiyaların tətbiqi təlim prosesində ən səmərəli yol və situasiya üçün əlverişli şəraiti təmin edir. Ənənəvi pedaqogikadan fərqli olaraq interaktiv pedaqogika təlim prosesində öyrədən və öyrənənin bərabərhüquqlu subyekt kimi fəaliyyətini təmin edir. İnteraktivlik psixoloji-sosioloji və pedaqoji anlamlarda müxtəlif mahiyyət daşıyır.

Y.P.Azarov, N.V.Kuzmina, A.V.Petrovski kimi alimlərin əsərlərində pedaqoji ustalığın təkmilləşdirilməsinin səmərəli yolları geniş işıqlandırılmışdır. Təsadüfi deyildir ki, keçmiş SSRİ dövründə ilk dəfə olaraq 1979-cu ildə Ukraynanın Poltava Pedaqoji İnstitutunda "Pedaqoji ustalığın əsasları" fənninin tədrisi həyata keçirilmişdir. A.S.Makarenko və V.A.Sxomlinski kimi görkəmli

pedaqoqlar yetişdirən bu ali məktəbdə təhsil alan gələcək müəllimlərin real maraqları əvvəlcədən öyrənilir, müvafiq maarifləndirmə işləri aparılır. Məhz buna görə də yuxarı sinif şagirdləri üçün “Gənc pedaqoq” fakültativ məşğələləri təşkil edilir. İnstitutun I-IV kurslarında tədris olunan “Pedaqoji ustalığın əsasları” fənninin öyrədilməsinə ayrılan 108 saat vaxt ərzində müəllimliyə xüsusi istedadı, qabiliyyəti, marağı olanlara bu peşənin mahiyyəti, məqsədi, xüsusiyyətləri, xarakterik cəhətləri, əhəmiyyəti ilə əlaqədar geniş elmi biliklər verilir. Pedaqoji ustalıq problemi müasir tələblərə cavab verən müəllim hazırlığında öz aktuallığını saxlayır.

“Təhsil sisteminin dinamik inkişafında pedaqoji ustalıq başlıca şərtdir” - ifadəsi daim diqqətdə saxlanılmalıdır. Çünki gələcək müəllimlərin hazırlanmasında pedaqoji ustalığın formalaşdırılması mühüm şərtdir.

Usta müəllimin yetişməsi yalnız təhsil sistemindən asılı deyil, eyni zamanda öyrənənlərin (tələbələrin) imkanlarının real səviyyəsi ilə bağlıdır.

Buraya aşağıdakı keyfiyyətlər daxildir:

• Tələbələrdə gələcək sənət, onun incəlikləri və özünüdərketmə haqqında təsəvvürlərin yaradılması;

• Pedaqoji texnologiyaların səmərəli yollarına yiyələnmək;

• Pedaqoji prosesin idarə olunması ustalığının əsaslarına yiyələnmək.

Azərbaycan Respublikasında fasiləsiz pedaqoji təhsil və müəllim hazırlığının konsepsiya və strategiyasında (Azərbaycan Respublikası Nazirlər Kabinetinin 2007-ci il 25 iyun tarixli 102 nömrəli qərarı ilə təsdiq edilmişdir) qeyd olunur: “Yeni texnologiyaların meydana gəlməsi çoxdan formalaşmış zaman və məkan əlaqələrinin dəyişməsinə, həmçinin tam məşğulluğun, yoxsulluğun və ailənin yeni formalarının yaranmasına, onların strukturunun və xarakterinin dəyişməsinə səbəb olmuşdur. Eyni zamanda biz müxtəlif mədəniyyətlərin mövcudluğu şəraitində yaşayırıq.

Bizim milli dəyərlərimizin, adət və ənənələrimizin qorunub saxlanmasında və milli mənliyimizin formalaşmasında qədim mədəni dəyərlərimizin dərk edilməsi, nəzərə alınması və həyatımızdakı müxtəliflik böyük rol oynayır”.

Qabaqcıl texnologiyalara əsaslanan infrastruktura malik təhsil sisteminin yaradılması üçün beş strateji istiqamətdə genişmiqyaslı tədbirlərin keçirilməsi “Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası”nda nəzərdə tutulur. Buraya daxildir:

• Səriştəyə əsaslanan şəxsiyyətyönümlü təhsil məzmununun yaradılması;

• Təhsil sahəsində insan resurslarının müasirləşdirilməsi;

• Təhsildə nəticələrə görə cavabdeh, şəffaf və səmərəli idarəetmə mexanizmlərinin yaradılması;

• Müasir tələblərə uyğun və ömürboyu təhsili təmin edən təhsil infrastrukturunun yaradılması;

• Azərbaycan Respublikasında iqtisadi cəhətdən dayanıqlı və dünyanın aparıcı təhsil sistemlərinin standartları ilə eyni səviyyəyə uyğun təhsil sisteminin maliyyələşdirilməsi modelinin qurulması.

Konseptual sənəd olan strategiyada qeyd olunur: “Müəllim amili təhsilalanın öyrənməsi və inkişafı, nailiyyətlərinin monitorinqi prosesində həlledici rol oynayır. Təhsilalanın savadlı və səriştəli şəxs kimi formalaşmasına müəllimin təsiri müəllimin akademik bacarıqlarından, tədris təcrübəsindən və peşəkarlıq səviyyəsindən xeyli asılıdır”.

Müasir müəllim təfəkkürə əsaslanan pedaqoji texnologiyalardan biri olan konstruktiv təlimin tətbiqi imkanlarından geniş istifadə imkanına malik olmalıdır. “Yaradıcı öyrənmə” texnologiyası (müəllifi Aleksandr Mixaleviç Kandır) təhsildə fərdi yanaşmanı üstün tutur. Pedaqoji texnologiyaların başlıca vəzifəsi təhsildə müstəqil öyrənməni

təmin etmək üçün istifadə olunan metod və üsulların səmərəli tətbiqini reallaşdırmaqdır. Demək, müəllim konstruktiv təlimin məqsədlərini (öyrənənin əxlaqının saflaşdırılması, öz-özünü inkişaf etdirərək bilik qazanmaq) məhz pedaqoji texnologiyalardan bacarıqla istifadə etməklə gerçəkləşdirə bilər. Müəllimin layihələşdirdiyi hər hansı bir dərsin əsas məqsədi tələbə şəxsiyyətinin formalaşması və mənəviyyatının saflaşdırılmasına xidmət etməkdir. Digər mühüm məqsəd tələbənin daxili qüvvəsinə istinad olunaraq onda müstəqil inkişafa, dərketməyə, bilik qazanmağa maraq oyatmaqdır.

Pedaqoji prosesdə müəllim təlim işini inkişafetdirici və düşündürücü istiqamətdə qurmalıdır.

Nəzəri və praktik cəhətdən müəllim hazırlığının təmin edilməsi dünyanın təhsil sistemində aktual problem kimi pedaqoq alimlərin diqqətini cəlb etmişdir. Burada fərdi şəxsi keyfiyyətlər, pedaqoji prosesdə tələbə şəxsiyyətinin formalaşdırılması, fasiləsiz təhsil sistemində xüsusi hazırlıq, didaktik prosesdə imkanların stimullaşdırılması və bir çox istiqamətlər üzrə geniş araşdırmaların aparılması məqsədəuyğun sayılır.

İdrak fəaliyyətinin bir növü olan təlim prosesi elm, incəsənət, oyun və əməklə birlikdə ətraf aləmin dərk olunmasına kömək edir. İdrak və təlim fəaliyyət olub, yolları fərqlidir. İdrak canlı müşahidə, mücərrəd təfəkkür, praktika ilə şərtlənir. Təlim qavrama, anlama, möhkəmlətmə, tətbiqetmə fəaliyyətlərini özündə ehtiva edir.

Ali pedaqoji məktəbdə müəllim təlim işini elə təşkil etməlidir ki, tələbə müşahidə aparsın, faktlar toplasın, onları mücərrəd təfəkkürdə təhlil etsin, fikri əməliyyatlar aparsın, problemləri həll etsin, müstəqil düşünmək və əməli fəaliyyət göstərmək bacarıqlarına yiyələnsin, elmi idrakı formalaşsın. Yəni təlim prosesində canlı müşahidə, mücərrəd təfəkkür və praktikanın vəhdəti təmin edilməlidir.

Müəllim tələbələrin elmi idraka marağını artırmaq üçün onların müstəqil yaradıcılıq qabiliyyətlərinin inkişafına daim şərait (müşahidələr aparmaq, faktlar toplamaq və s.) yaratmalıdır.

*Rəyçi: prof. İ.İsmayılov*

**İstifadə edilmiş ədəbiyyat**

1. Ağayev Ə. Pedaqoji innovasiyalar probleminə müasir yanaşmalar. // Azərbaycan məktəbi, 2013, № 5.
2. Nəzərov A. Müasir təlim texnologiyaları. Bakı, 2012.
3. İlyasov M. Müəllim hazırlığında seçim problemi. Azərbaycan məktəbi, №2, 2014.
4. Черкасова И., Яркова Т. Интерактивная педагогика: учебно-методическое пособие. СПБ.: НОУ "Экспресс", 2012.

**Ш.Джалилзаде**

**О подготовке учителей в процессе развития системы образования**

**Резюме**

В статье комментируется подготовка компетентного и профессионального развития учителей, которая играет важную роль в развитии системы образования и педагогических технологий и способы, которые обеспечивают его.

**Sh.Jalilzadeh**

**Teacher training in education development**

**Summary**

In the article, it is commented on the competency training and professional development of teachers, which play an important role in the development of education, as well as, educational technologies and methods that provide it.

***Tərbiyə məsələləri***

# NİTQ MƏDƏNİYYƏTİ: TARİXİ TƏCRÜBƏYƏ BİR NƏZƏR

**Gülşən Bəşirova**
***Heydər Əliyev adına AAHM-in humanitar fənlər kafedrasının müəllimi, filologiya üzrə fəlsəfə doktoru***

***Açar sözlər:*** *nitq mədəniyyəti, natiqlik, məharət, öyrədicilik, təsiredicilik, inam, təəccüb, heyrət, heyranlıq, alim, hünər, söhbət etmək, ədalət, humanizm.*

***Ключевые слова:*** *культура речи, ораторство, мастерство, обучающий, влиятельность, доверие, удивление, восторг, восхищение, учёный, отвага, разговаривать, справедливость, гуманизм.*

***Key words:*** *culture of speech, oratory, mastery, teaching, persuasion, trust, surprise, astonishment, amazement, scientist, courage, conversation, justice, humanism.*

Müstəqil ölkəmizə Azərbaycan Respublikasının dövlətçilik ideologiyasının prinsipləri ilə silahlandırılan, dövlətçiliyi, azərbaycançılığı ideoloji rupora çevirən, aydın ifadə tərzi, yüksək etik mədəniyyəti, sözlə işi, əməli birləşdirməyi bacaran natiqlər çox lazımdır. Elə natiqlər ki, mədəni nitq normalarını öz nitqində parlaq şəkildə nümayiş etdirməkdə nümunəyə çevrilsin. Etiraf edək ki, bu qabiliyyəti aşılamaqda ali məktəblərdə tədris olunan "Nitq mədəniyyəti və natiqlik sənəti" fənninin tədrisinin çox böyük rolu var. Təxminən, 60 saatlıq mühazirə və seminar dərsləri şifahi imtahanlarla yekunlaşır. "Gənc natiqlər" dərnəkləri fəaliyyət göstərir. Onların iştirakı ilə yubiley tədbirlərində nitqlərin, çıxışların müsabiqəsi də keçirilir.

Bununla belə, paytaxtımız Bakıda dialekt, şivə və ləhcə leksikası məktəblərdə, müəllimlərin nitqlərində, radio və televiziya verilişləri aparıcılarının çıxışlarında az eşidilmir. Ədəbi tələffüzün xüsusi fənnə çevrilməsinə baxmayaraq, imtahanlar qurtarandan sonra bunlar tələbələrin də nitqindən "silinir". Bunun da başlıca səbəbi nitq mədəniyyətinə az diqqət yetirilməsi, nəzarətin olmaması və ya müntəzəm xarakter daşımaması ilə əlaqədardır.

Nitq mədəniyyəti və natiqlik sənətini tədris edən müəllimlər, EA-da fəaliyyət göstərən Nəsimi adına Dilçilik İnstitutu, habelə nitq mədəniyyəti şöbəsi yaranmış problemin səbəblərini öyrənib aradan qaldırmaqda az əmək sərf etmirlər. Bizim fikrimizcə, həm də bu işdə məharət amili aktuallaşdırılmalı və bu barədə təbliğat gücləndirilməlidir. Bu fənni tədris edənlərin özlərinin də məharət amilinə nəzəri və təcrübi cəhətdən yiyələnildiyini və ya kütləviliyə nail olunduğunu söyləmək çətindir.

Deməli, məsələnin mahiyyətini şərh etməyə ehtiyac vardır. Nitq mədəniyyəti nəzəri məsələlərdən, natiqlik isə təcrübədən bəhs edir. Məharət amilini nitq mədəniyyəti araşdırıcıları belə şərh edirlər:

1) natiq dilin ədəbi tələffüz normalarına, o cümlədən orfoepik qayda-qanunlarına mükəmməl şəkildə yiyələnməli; intonasiyaya, vurğuya, fonetik hadisələrə praktik cəhətdən bələd olmalı; yazıldığı kimi deyil, necə oxunmalı və ya deyilməlidirsə, elə də oxu-

mağı bacarmalıdır. O nitq xoşa gəlir ki, o, səs amilinə, yəni orqan və motiv amilinə tam cavab verir. Vurğulardan düzgün istifadə olunduqda natiqin həyəcanlı səsindəki avazlanma dinləyicilərdə sevinc hissi doğurur, onlarda qələbəyə inam yaradır. Təəssüf doğuracaq bir informasiya isə, səsin orta, orta-ağır ləngərli tonallıqda eşidilməsinə səbəb olur. Keçmiş sovet informasiya bürosunda Levitan, Azərbaycan radio və televiziya məkanında Şəmistan Əlzamanlı dinləyicilərə belə təsir bağışlamışdır.

2) Nitq mədəniyyəti dərslərində məharət nümunələri səsləndirilməlidir. Belələrinə Ramil Səfərovun məhkəmədə söylədiyi nitqi, Mübariz İbrahimovun “Atama və anama” məktubu da nümunə ola bilər.

3) Nitqin möhtəşəmliyini şərtləndirən cəhətlər çoxdur. Tarixi təcrübə göstərir ki, fikri aydın, səlis çatdırmaq natiq üçün məharət sayılır. Çünki şifahi nitqdə ədəbi tələffüz gözləniləndə, nitqdə ardıcıllığa, rabitəliliyə, məntiqi keçidlərə əməl olunanda dinləyici hər şeyi anlayır və qavrayır. Yazılı nitqdə də sözün düzgün seçilməsinə, nitqin qurulmasına, qrammatik bağlılıqlara, dəqiqləşmələrə riayət edilməsinə məharət kimi baxılır. Natiqlikdə ikinci dərəcəli olan cəhət yoxdur. Nitqin həcmi, yaxud da yığcam və ya geniş olması ideyanın, fikrin məna tutumundan asılıdır.

Məharət problemindən danışarkən alim natiqlərdən də nümunələr gətirmək olar. Belə ki, elm adamı kimi tanınan natiq gələcək humanitar və planetar qayələrdən, elmi təsnifatlardan xəbərdar olmalıdır.

M.Plank yazır: “Təsnifat idrakın ən yüksək növüdür”. Alimlərin təsnifatı isə belədir:

1. İdeyalar generatorları
2. İdeyalar moderatorları (yeni elmi informasiyalar tənqidçisi)
3. İdeyalar animatorları (generatorların məsləhətçiləri)
4. Yeni ideyalar hazırlayanlar
5. Elm təşkilatçıları
6. Pedaqoq-mühazirəçilər [2, 97].

Tarixi təcrübə göstərir ki, pedaqoq-mühazirəçilər elmi mənbələri yeni elm kəşf edənlərdən daha məharətlə şərh edirlər. Onlarda müəllimlikdən irəli gələn öyrədicilik keyfiyyəti yüksək olur. Təkcə öz fikrini deyil, bir çoxlarının ideya istiqamətlərini, kəşflərini və kəşflərə bərabər yeniliklərini şərh edənin nitqindən dinləyici çox şey öyrənir və belə natiqlərə heyranlıqla həsəd aparılır. Buna hərtərəflilik amili deyilir.

Azərbaycan Respublikasının dövlətçilik ideologiyasından danışan natiq öz məharətini yalnız dövlətin möhkəmləndirilməsi və azərbaycançılıq prinsiplərini sadalamaqla göstərə bilməz. Bunun üçün dövlət və dövlətçilik, dövləti möhkəmləndirməyin forma və üsulları, strateji və taktiki yollar ayrı-ayrı məsələlərə çevrilməli və sonda geniş anlayışlarda inteqrasiya olunmalıdır. Həmçinin bu prinsiplərin kimlərin əsərləri, məruzə və çıxışları əsasında formalaşdığını, milli tərəqqi, milli mənafe, milli müstəqillik anlayışlarının əqidəyə çevrilməsinin tarixi köklərini meydana qoymaq tələb olunur. Natiqdən bu məsələdə tələb olunan məharət odur ki, XIX-XX əsrdə milli müstəqillik şüurunun oyanıb cücərməsində M.F.Axundzadə, Ə.Hüseynzadə, C.Məmmədquluzadə, M.Ə.Sabir, Ü.Hacıbəyov, N.Nərimanov, M.Rəsulzadə və başqalarının ideya istiqamətlərinin fraqmental nöqtələrini vurğulasın, habelə müstəqil Azərbaycan dövlətini möhkəmləndirməyin strategiyasını vermiş, ölkəmizə “neft siyasəti” gətirməklə azərbaycançılığı dövlət ideologiyası səviyyəsinə yüksəltməkdə şöhrət tapmış Heydər Əliyev xidmətlərindən danışmağı bacarsın. Natiqin məharəti xalqı bir qlobal ideya ətrafında birləşdirməyindədir. Azərbaycanda yaşayan bütün vətəndaşlar etnik mənsubiyyətindən asılı olmayaraq, öz dədə-baba torpaqlarında – Azərbaycanda yaşayırlarsa, deməli, onlar azərbaycanlıdırlar. Ölkəmizə ruslar, yəhudilər bu torpaqlara sonralar gəliblər; onlar öz millətlərinin adı ilə çağrılsalar, buna söz yoxdur, lakin digər etniklər – türk, ləzgi, talış, tat, kürd və s. bir millət kimi azərbay-

canlı adını – vətən oğlu adını daşımağa haqlıdırlar. Bu fikrin ulu öndərə aid olduğunu və necə də birləşdirici, ruhyüksəkliyi yaradıcı olduğunu demək əsl məharət deyilmi?

4) Natiqlikdə məharət göstəriciləri çoxdur. Onlardan biri də dinləyicidə maraq yaratmaq, onu müzakirəyə cəlb etmək və dialoqa qoşmaqdır.

Metodik təfəkkürü güclü olan natiq cəmiyyətdə ədalətlilik, bərabərlik prinsipindən danışarkən dahi Nizamidən, Konfutsidən sitatlarla öz nitqini bəzəyə, fəlsəfi ricətlər, haşiyələrlə zənginləşdirərkən dinləyiciyə “bəs siz necə düşünürsünüz?”-deyə müraciət edə bilər. Dahi Nizami də Hörmüzə istinad edərək öz dövrünün hökmdarlarına (sifarişi ilə “Xosrov və Şirin”i yazdığı hökmdarı da nəzərdə tutaraq) bu sözləri eşitdirir:

“İndi yüz fəqirin tökülə qanı,
Halına yanacaq bir insan hanı?”

Konfutsi traktatlarında dövləti möhkəmləndirməyin başlıca şərtini dövlət başçısına inamın yaradılmasında görür. Natiq öz dövlətinin ideoloji ruporu olmalı və Konfutsi kəlamlarından şərhlər verməlidir; bunu deməyə borcludur ki, “öz Allahına inamı möhkəm olmayan insana da, hökmdara da inanmaz; inanmaq mərdanəlikdir”.

Bu məsələdə Qurani-Kərimdən bir kəlam səsləndirərsə, nə gözəl olar: “La dina bil-la mura'vvatin”, “İnamsız qəhrəmanlıq olmaz” və s. [2, 30].

İdeallar mücəssiməsi olan natiqlərin həmişə bir neçə dildə danışa bilməyi məharət sayılıb.

Natiqin məharəti humanist qayələrdən bəhs etməsində, humanizmi təbliğ eləməsindədir. Filosof-natiqlər buna misal ola bilərlər. İ.Kant yazır: “Mən iki halda təəccüblənir və heyrətdə qalıram: bir üstümüzdə göylərə baxıb işıqlı ulduzları seyr edəndə və bir də insan daxilindəki mənəvi normaları görəndə” [2, 31].

Qeyd olunanlara yekun vuraraq bunları deyə bilərik ki, natiqlik məharəti müəllimə, alimə, hərbiçiyə, bir sözlə, bütün sənət adamlarına aşılanmalı keyfiyyətdir. Ana dilini sevən hər kəs bu dildə gözəl danışmaq üçün öz üzərində çalışmalıdır. Natiqlik mədəniyyəti insanın ümumi mədəniyyətinin tərkib hissəsi olub, insanda humanist qayələr tərbiyə edir, mənəvi-əxlaqi hislər aşılayır. Buna görə də natiqlik məharəti ilə bağlı təbliğatı gücləndirmək və bütün təhsil müəssisələrində bu istiqamətdə sistemli, planlı işlər aparmaq zəruridir.

*Rəyçi: dos. T.Rəhimli*

**İstifadə edilmiş ədəbiyyat**

1. Əsgərov M. Natiqlik sənətinin əsasları. Bakı: Maarif, 1975.
2. Мирзаджан-заде А. Этюды о гуманитаризации образования. Б.: Азернешр, 1993.
3. Об ораторском исскустве. М.: Изу-во политической литературы, 1973.

**Г.Баширова**

**Культура речи: взгляд на исторический опыт**

**Резюме**

Культура речи и ораторское искусство, как наука и мастерство были и остаются одними из актуальными вопросами воспитания и образования. Поэтому в статье делается попытка ряд пояснений о сущности ораторского мастерства на примере философов и политиков мирового класса.

**G.Bashirova**

**Culture of speech: a glance at history of practice**

**Summary**

In the article, it is noted that, culture of speech and oratory, as a field of science and mastery, are still actual matters of upbringing and education. The author attempts to explain the concept of oratory using the examples of world famous philosophers and politicians.

# TƏLİMDƏ FƏALİYYƏTLƏRİN TƏNZİMLƏNMƏSİNİ TƏMİN EDƏN KOMPONENTLƏR

**Baloğlan Quliyev**
***pedaqogika üzrə fəlsəfə doktoru, dosent***

***Açar sözlər:*** *fəaliyyət, tənzimlənmə, komponent, intellektual, yaradıcı, təfəkkür.*
***Ключевые слова:*** *деятельность, регулирование, компонент, интеллектуальный, творческий, познание.*
***Key words:*** *activity, regulation, component, intellectual, creative, mentality.*

Təhsil Konsepsiyasında (Milli Kurikulum) ümumtəhsil məktəbi üzrə təlimin nəticələri, məzmun standartları, orta təhsilin bütün pillələrində pedaqoji-psixoloji prosesin təşkili, təlim nailiyyətlərinin qiymətləndirilməsi üzrə əsas prinsiplər əhatə olunmuşdur. Bunlar şagirdlərin şəxsiyyət kimi formalaşması, milli və bəşəri dəyərləri mənimsəməsi, mübarizlik, vətənpərvərlik ruhunda tərbiyələndirilməsi, cəsur, igid, dözümlü və fiziki cəhətdən sağlam böyümələri üçün təlim şəraitinin yaradılmasını tələb edir. Şagirdin şəxsiyyət kimi formalaşmasına yönəlmiş milli təlim proqramların prinsiplərinin nəzərə alınması, tətbiqi onlarda zəruri qabiliyyət və keyfiyyətləri aşılayır. Yəni bu zaman şagirdlərdə onların intellektual, emosional və yaradıcı sferalarının harmonik inkişafına imkan yaranır, məntiqi, yaradıcı təfəkkürü formalaşır. Təlimin səmərəliliyini yüksəltmək üçün daha optimal prinsiplərin seçilməsi, onların şəraitdən asılı olaraq düzgün tətbiqi mexanizmlərinin tədqiqi və ümumiləşdirilməsi vacib şərtdir. Məsələyə ənənəvi təlim baxımından yanaşmış olsaq, deyə bilərik ki, tədris prosesi fiziki tərbiyə müəlliminin tam rəhbərliyi, nəzarəti və "diktatorluğu" şəraitində qurulmalı, müəllimin göstərişi, verdiyi tapşırıqlar hamı üçün qanun və məcburi olmalı, heç bir təklif nəzərə alınmamalıdır. Müstəqil və sərbəst fəaliyyət göstərmək, yəni hərəkətlərin özbaşına icrası qadağandır.

Qeyd etmək lazımdır ki, müasir təhsil sistemində müəllim təlim prosesini fəal təlim prinsipləri əsasında təşkil etməli, şagirdlər əsas tərəf kimi qəbul edilməli, onların qabiliyyətləri, tələbatları, fiziki tərbiyə sahəsindəki bilik və bacarıqlara yiyələnməsi potensialı üzə çıxmalı, qabaqcıl təlimin tələblərinə riayət etməklə cəmiyyətin dinamik inkişafına istiqamətlənməlidir.

Təlimin prinsipləri prinsip xatirinə, yəni formal xarakter daşımamalı, təsadüfən, kor-koranə deyil, tədris prosesində yaradılmış mühitə, şəraitə uyğun tətbiq edilməlidir. Burada öyrənənlərin, yəni kiçikməktəbli uşaqların ümumi bilik və bacarıq fəaliyyətləri, hərəki qabiliyyətləri, vərdişləri nəzərə alınmalıdır. Xüsusən qabaqcıl müəllim və məktəblərin iş təcrübəsi, direktiv tədris sənədlərinin tələbatı təlim fəaliyyətində əsas götürülməlidir.

Təlim-tərbiyə prinsipləri bir fənn çərçivəsində məhdudlaşdırılmamalı, digər ümumtəhsil fənləri ilə əlaqə yaradılmaqla həyata keçirilməlidir. Bu prosesdə qohum fənlərlə inteqrasiya (ana dili, musiqi, həyat bilgisi və s.) daha üstünlük təşkil etməlidir. Belə ki, ayrı-ayrı hərəki bölmələr üzrə (gimnastika, atletika, mütəhərrik və idman oyunları, kross hazırlığı) nəzəri biliklər, tədris materialları bir-birilə əlaqəli şəkildə təlim olunmalıdır. Fəndaxili mövzular üzrə təlim materialları

əlaqələndirilərək tədris edilməlidir.

Təlim prinsiplərinin fəal tətbiqində tədris işlərinin düşünülmüş şəkildə əvvəlcədən planlaşdırılması onun tədrisinin yaxşılaşdırılmasında həlledici mahiyyətə malikdir. Planlaşdırma apararkən müəllim şagirdin idraki, informativ-kommunikativ və psixomotor bacarıqları inkişaf etdirən tədris materialını təlim prosesinə daxil etməsi təbii zərurət kəsb edir. Müxtəlif növ maraqlı, cəlbedici və təsiredici fiziki hərəkət kompleksləri hazırlanmalı, onların tədrisi mərhələlər üzrə ardıcıllıqla aparılmalıdır. Hər bir fiziki hərəkət üzrə bilik, bacarıq və vərdişlərin qazanılmasının özünəməxsusluğu nəzərdən qaçmamalıdır. Dinamik inkişafı təmin edən hərəki bacarıqların formalaşdırılması yönümlü texniki fəndlərin ardıcıllıqla həyata keçirilməsi daha məqsədəuyğun sayılır.

Fiziki tərbiyə təliminin nailiyyətləri onun məzmunundan və qarşısında duran başlıca vəzifələrdən mühüm dərəcədə asılıdır. Bu mənada təhsilin Dövlət Standartları əsasında hazırlanmış fiziki tərbiyə fənn kurikulumuna uyğun hərəki təlimin məzmunu və vəzifələri müəyyənləşdirilir. Göstərməliyik ki, digər ümumtəhsil fənlərində olduğu kimi, fiziki tərbiyə fənnində də məzmun yaşadığımız ictimai-siyasi mühitin tələbatına uyğun müəyyən edilməli, daim təkmilləşdirilməli və yeniləşdirilməlidir. Müəllim və şagirdlərin təhsil fəaliyyətləri inkişafetdirici, tərbiyəedici, qabaqlayıcı mahiyyət daşımalı, hərəki bilik, bacarıq və vərdişlər təhsil pillələri üzrə konsentrik prinsip əsasında reallaşmalıdır. Bununla yanaşı, öyrənənlərin nailiyyətlərinin düzgün stimullaşdırılmasına, təhlilinə və qiymətləndirilməsinə istiqamətləndirilməlidir. Xüsusən şəxsiyyətyönümlü, tələbəyönümlü və şagirdyönümlü olmalıdır. Bütün bunlar isə şəxsiyyətin hərtərəfli və harmonik inkişafına, ictimai mühitin və cəmiyyətin mənafeyinə xidmət etməlidir. Bu şərtlə ki, təlimin məzmunu və vəzifələri birbirinə uyğun seçilməli, biri o birini və əksinə tamamlaması daha məqsədəmüvafiqdir. Fiziki tərbiyə təliminin çoxşaxəli funksiyalarının (təhsil, tərbiyə, inkişaf və s.) olmasına səbəb Azərbaycan təhsil sisteminin daim inkişafda olması, bəşəri təhsil sisteminin dəyərlərinə qovuşması, bu yöndə irəliləməsi zərurətindən irəli gəlməsi və təhsil islahatı proqramına əsaslanmasıdır.

Fiziki tərbiyədə tədris materialları həyatla sıx əlaqələndirilməli, yəni keçmiş, bugünkü və proqnozlaşdırılmış gələcək mühiti əhatə etməli, yaşadığımız quruluşun reallıqları ilə birbaşa uzlaşdırılmalıdır. Tədris işinin faktik materiallara istinad olunaraq görülməsi, şagirddə təlimə marağı artırır, idrak fəallığının yüksəlməsini təmin edir və hərəki, psixomotor fəaliyyətlərin (qaydalara uyğun fəaliyyət, sərbəst fəaliyyət, yaradıcılıq fəaliyyəti) məqsədəuyğunluğunu tənzimləyir, onun dəyərliliyini xeyli artırır, həyatyönümlülüyünü yüksəldir.

Fiziki tərbiyə üzrə təlimin məzmun və vəzifələrinin düzgün qoyuluşu şagirdlərin tədris fəallığının yüksəlməsinə, bu prosesin intensiv təşkilinə səbəb olur. Bir cəhəti də yadda saxlamalıyıq ki, tədris prosesi əlverişlilik prinsipinə də əsaslanaraq təşkil olunmalıdır. Bu da təhsilalma və təhsilvermənin imkanlarının daha da genişlənməsinə və təhsilin səviyyəsinin yüksəlməsinə əlverişli şərait yaradır.

Tədris prosesinin səmərəliliyinə zəmin yaradan amillərdən biri də təlim zamanı bərabərhüquqluluğun təmin olunmasıdır. Yəni şagirdlərin idrak fəallığı, təlimə şüurlu və düşüncəli yanaşması təmin edilməklə, onların müstəqilliyinə, sərbəst hərəkət etmələrinə də üstünlük verilməlidir. Bu öyrətmə və öyrənmənin vahidliyinin gözlənilməsi ilə sıx əlaqədar olmaqla müəllimin və şagirdlərin fəaliyyətinin tənzimlənməsini stimullaşdıran mexanizmlərdən hesab olunur.

Qeyd etmək lazımdır ki, təlimin təşki-

li üsulunu seçərkən ayrı-ayrı sinifin ümumi fiziki hazırlığını, anatomik-fizioloji və psixoloji xüsusiyyətlərini də nəzərə almaq zəruridir. Bu şərtlə ki, dərsin təşkili formalarına uyğun metodlar, vasitələr, məzmun, eyni zamanda vəzifələr müəyyənləşdirilmiş olsun. Deyilənlər eyni vaxtda, həm də bir-biri ilə əlaqəli şəkildə aparılmalıdır. Bütün bunlar təlimin səmərəli formasının seçilməsinə səbəb olur.

Yuxarıda sadalanan komponentlərdən kompleks istifadə olunması təlimdə nailiyyət qazanılmasında ən başlıca şərtlərdən sayılır və bu təlimdə fəallaşmağa müsbət təsir göstərir, tədris materialının mənimsənilməsini şərtləndirir.

Fiziki tərbiyənin təlim prosesinin düzgün təşkili və keçirilməsində yalnız pedaqoji komponentlərin təlim dövründə düzgün tətbiqi ilə kifayətlənməməlidir. Fiziki tərbiyənin tədrisi zamanı məktəbli gigiyenasına riayət edilməsi, təlim üçün mənəvi-psixoloji və estetik şəraitin yaradılması da əhəmiyyətli komponentlərdəndir. Təlim prosesi üçün maksimum dərəcədə məqsədəuyğun sanitariya-gigiyena şəraitinin yaradılması da nəzərə alınmalıdır. Tədris-tərbiyə işlərinin səviyyəsinin yüksəldilməsində ümumi pedaqoji prinsiplərin rolu böyük olsa da, təlim prosesi elmi surətdə təşkil olunsa belə bu təlimin hələ tam müvəffəqiyyətlə həlli demək deyildir. Şagirdlərin təlim-tərbiyə işində və sürətli inkişafının təmin edilməsində tədris prosesinin optimallaşdırılması prinsiplərinin də tətbiqinə ehtiyac duyulur. Bu şərtlə ki, bunlar müəllim və şagirdlərin tam idrak fəallığı əsasında həyata keçirilmiş olsun. Təlim prinsiplərindən birtərəfli və yaxud həddindən artıq istifadə heç də təlimin uyğun prinsipinin təmini deyildir. Burada prosesin optimal qurulması  başlıca amildir.

Şagirdlərin hərtərəfli inkişaf etdirilməsi, şəxsiyyət kimi formalaşdırılması və mənəvi aləminin zənginləşdirilməsinin məqsədəmüvafiq təşkilində təlimin kompleks həllinə yönəldilmiş prinsiplərinin tətbiqi daha müvəffəqiyyətli hesab olunur. Burda da müəllimdən dərsin qarşısında duran vəzifə və məqsədi həyata keçirməkdən ötrü onun əsas və başlıca olanlarını seçib diqqət mərkəzində saxlamaq və ilk növbədə, təlimini təmin etməyə ciddi səy göstərmək tələb olunur.

Təlimdə optimal yanaşmanın da özünəməxsus yeri vardır. Burada ayrı-ayrı fiziki hərəkət və oyunlar öyrədilərkən istər hərəkət texnikasının və istərsə də oyunların nə məqsədlə icra olunduğu və keçirildiyinə aydınlıq gətirmək tələb edilir. Bu, onunla əlaqədardır ki, məqsəd və vəzifələrin aydınlığı şagirdlərin təlimə həvəsini artırmaqla onun hərtərəfli və düşüncəli surətdə qavranılmasına kömək edir.

Fiziki tərbiyə təliminin nəticəyönümlülüyü hazırda təhsil sistemində ciddi şəkildə tələb olunur. Bu işə diqqət, qayğı günbəgün artırılır. Fiziki tərbiyədə nəticəyönümlülüyü təmin edən amillər araşdırılır və daha da təkmilləşdirilir. Bu məsələdə təlim metod və vasitələrinin düzgün seçilməsi, bir-biri ilə inteqrasiya olunması və tətbiqinin təmini həyati əhəmiyyət daşımaqla, həmçinin mühüm təhsil mahiyyətinə malikdir.

Sürətli inkişafı təmin edən bacarıqların, məqsədin, məzmunun və təlim vəzifələrinin yerinə yetirilməsinin tədris şəraiti, onun imkanları ilə uyğunlaşdırılması təlimin reallaşdırılmasında əlverişli imkanlar yaradır. Məzmunun səciyyəvi xüsusiyyətlərinin, öyrədən və öyrənənin təlim imkanlarının nəzərə alınması da hərəki təlimin səmərəliliyinin artırılması üçün optimal şəraiti təmin edir. Əgər təlim məqsədi ilə seçilmiş metodlar və vasitələr təhsil-tərbiyə vəzifələrinə, məzmuna və şagirdlərin mənimsəmə imkanlarına cavab vermirsə, standart vasitələrdən, metodlardan kor-koranə istifadə olunursa, bu təlimə öz mənfi təsirini göstərərək mə-

nimsəmə imkanlarını aşağı səviyyəyə salır. Təlim-tərbiyə prosesinin təlimin vəzifələrinə və məzmununa uyğun gəlməsi, onlara müvafiq metod və vasitələrdən düzgün istifadə edilməsi, şagirdlərin dərketmə və hərəkətləri icraetmə qabiliyyətlərinin nəzərə alınması fiziki hərəkətlər üzrə tədris materiallarının düşüncəli, yüksək idraki fəallıqla öyrənilməsinə təkan verir.

Fiziki tərbiyə prosesinin müvəffəqiyyətlə nəticələnməsi təlimin hansı formada təşkilindən də sıx surətdə asılıdır. Fiziki tərbiyənin təşkili formalarına dərs, sinifdən və məktəbdənxaric keçirilən tədbirlər, səhər gigiyenik gimnastikası, fasilələrdə təşkil olunan oyunlar, əyləncələr və s. daxildir. Məqsəd isə sağlamlığı möhkəmləndirmək və fiziki inkişafı təmin etməkdən ibarətdir.

Frontal formada sinif şagirdləri hərəkətləri və yaxud fəndləri eyni vaxtda birlikdə icra edirlər. Şagirdlər yarım qruplara bölünmək üsulu ilə də tapşırıqları yerinə yetirirlər. Dairəvi üsulda isə qurulmuş alət və avadanlıqlar üzərində hərəkətlər şagirdlər tərəfindən növbə ilə icra olunur. Yəni hər hansı bir alət üzərində hərəkətlər icra olunduqdan sonra şagird dəstələri növbə ilə digər alətlər üzərində dairəvi üsulla bir-birini əvəz edirlər. Fərdi üsulla isə müəllimin tapşırığı ilə şagirdlər müvafiq hərəkətləri yerinə yetirirlər.

Fiziki tərbiyə dərslərində bu və ya digər formalardan ustalıqla istifadə etmək çox vacibdir. Fiziki təhsil və tərbiyə məsələlərinin həllində frontal və dairəvi məşq üsulundan daha geniş şəkildə istifadə olunması faydalı hesab olunur. Materialların məzmunu və qarşıda qoyulmuş didaktiv vəzifələr hər hansı bir formanın tətbiqini tələb edirsə, ola bilsin ki, digər tədris materialının məzmunu və vəzifələri başqa bir formadan istifadə edilməsini məqsədyönlü hesab edir.

Müəllim tədris prosesində təlimin formalarından düzgün istifadə etməli, əsas diqqət şagirdlərin fiziki hazırlığına, inkişafına, sağlamlığının möhkəmliyini təmin etməyə, hərəki qabiliyyətlərin yüksəlməsinə, bilik, bacarıq və vərdişlərin mənimsənilməsinə yönəldilməlidir. Belə olduqda həmin prosesdə ideya-siyasi, mənəvi və vətənpərvərlik hisləri də inkişaf edir, şagirdlərin fəal həyat mövqeyi və elmi dünyagörüşünün formalaşmasına imkanlar açılır, onlar şəxsiyyət kimi tədricən formalaşır, zehni, fiziki baxımdan təkmilləşirlər.

Müəyyən olunmuşdur ki, fiziki tərbiyə təliminin inkişafetdirici məzmunu o vaxt təmin olunur ki, vərdiş və tədris fəaliyyəti yüksələn xətt üzrə gedir, şəxsiyyətin qavrama, diqqət, yaddaş, təfəkkür, iradə, emosiya və digər psixoloji qabiliyyətləri inkişaf edir. Başqa halda “inkişaf” dar və psixoloji mənada nəzərdə tutulur. Şəxsiyyətin hərtərəfli, harmonik inkişafı mənasında başa düşülmür, bu da təhsil, tərbiyə psixoloji inkişaf və bunların birliyinin dərk edilməsini təmin etmir. Unutmamalı ki, fiziki tərbiyə müəllimi fiziki tərbiyənin təlimində vəzifələrin lazımi səviyyədə yerinə yetirilməsi üçün kompleks yanaşmanı xüsusən diqqətdə saxlamalıdır. Bütün dərslərdə qarşıya qoyulmuş vəzifələr məqsədəuyğun, bir-biri ilə koordinasiya olunmalıdır. Yəni fiziki tərbiyə prosesində hər hansı bir vəzifə icra olunarkən o, digər vəzifələrin yerinə yetirilməsinə mane olmamalı, əksinə, onun icrasının daha da təkmilləşdirilməsinə şərait yaratmalıdır. Məsələn, müəllim müxtəlif növ hərəki qabiliyyətləri inkişaf etdirən gimnastika hərəkətlərini öyrədərkən bu keyfiyyətlərin inkişafına dolayı yolla kömək göstərən mütəhərrik oyunlardan istifadə etməli, oyunların mahiyyəti, insan orqanizminə göstərdiyi təsirin şərhini verməli, onun hərəki xüsusiyyətlərinin gimnastika elementlərinin icrasında nə dərəcədə oynadığı rolu izah etməlidir. Bir sözlə, fiziki tərbiyə vasitələrinin (oyun, gimnastika və s.) sonda müqayisəetmə yolu ilə eyni məqsədə xidmət etmələrindən bəhs

etməli, bütün bunları şagirdlərə mənimsətməlidir.

Müşahidələrdən aydın olur ki, tədrisdə ümumi təlimin nəticələrinə nail olmaqda yalnız ayrı-ayrı hərəkətlərin texnikasına yiyələnmək, oyun bacarığına malik olmaq tam tutarlı sayılmır. Fiziki tərbiyənin təlimində zəruri bilik və bacarıqlara yiyələnmək, eləcə də vərdişlər aşılamaq tədris materialının həcmindən də mühüm dərəcədə asılıdır. Proqram tədris bölmələri üzrə, ilk növbədə, kompleks vəzifələr müəyyənləşdirildikdən sonra təlim-tərbiyənin məzmunu konkretləşdirilməlidir. Təlimin məzmununa aydınlıq gətirmək üçün birinci olaraq ictimai həyatla əlaqələndirmə, eyni zamanda müvafiq əlverişlilik prinsipinə verilən tələblərə uyğunlaşdırılmalıdır. Bütün situasiyalarda təlim və tərbiyə işlərinin məzmununda elmiliyin də nəzərə alınması vacibdir.

Yuxarıda göstərilənlərdən və aparılmış təcrübədən belə qənaətə gəlmək olur ki, gümrahlıq, yüksək əhvali-ruhiyyə, şənlik, cəldlik, çeviklik, dözümlülük qarşıya çıxan mürəkkəb və çətin təbii maneələrin aradan qaldırılmasından, şagirdlərin hərtərəfli fiziki və zehni inkişafından, şəxsiyyət kimi formalaşmasından ötrü fəaliyyətlərin tənzimlənməsini təmin edən komponentlərin səmərəli tətbiqinə, təhsil mühitinin yeniləşməsinə nail olmalıdır. Bütün bunlar fiziki tərbiyənin təlimində öyrədən və öyrənənlərin fəaliyyətinin uyğunlaşdırılmasında başlıca amil olmaqla, həm də mühüm stimullardandır.

*Rəyçi: prof. D.Quliyev*

**İstifadə edilmiş ədəbiyyat**

1. Kurikulumların hazırlanması və tətbiqi məsələləri. Tərtib edənlər: Əhmədov A., Abbasov Ə. Bakı: Kövsər, 2008.

2. Əliyev F., Ağayev Ş. Azərbaycanda elmin problemləri və inkişaf perspektivləri. Bakı: Elm, 2011.

3. Ümumtəhsil məktəblərinin I-IV sinifləri üçün fənn kurikulumları. Tərtib edən və hazırlayanlar: Əhmədov A., Abbasov Ə. Bakı: Təhsil, 2008.

4. Quliyev B. Mütəhərrik və əyləncəli oyunlar. Bakı: ADPU, 2011.

5. Hüseynov F. Ümumtəhsil məktəblərində fiziki tərbiyənin strukturu və tədrisi ardıcıllığı. // Kurikulum, № 2, 2013.

**Б.Кулиев**

**Компоненты, обеспечивающие регулирование деятельностей при обучении**

**Резюме**

В статье рассматриваются механизмы регулирования деятельности преподавателей и учеников на уроках физкультуры в начальных классах, в частности, выбор оптимальных педагогических компонентов и их применение в зависимости от условия и обстоятельств, а также от реальностей образования и способностей учеников. Кроме того, придается соответствующая ясность педагогическим факторам, современным требованиям и принципам, увеличивающим спортивную активность и ускоряющим интерактивность в учебе.

**B.Guliyev**

**Components providing regulation of activities in training**

**Summary**

In the article, the regulation mechanisms of teachers’ and pupils’ activity on physical training in primary classes, especially, choosing the optimal pedagogical components in this process, their implementation depending on the environment, circumstances, and educational realities and abilities of pupils, are researched. Besides that, pedagogical factor, modern demand and principles, which improve sports activity and interactivity in education, are appropriately explained.

# AZƏRBAYCANDA MƏKTƏB KİTABXANALARININ İNKİŞAF TARİXİNDƏN

**Yusif Qazıyev**
***pedaqogika üzrə fəlsəfə doktoru, əməkdar müəllim***

***Açar sözlər:*** *müşavirə, yaş, qrup, şöbə, konfrans, mütaliə.*
***Ключевые слова:*** *обсуждения, возраст, группа, подразделение, конференции, чтения.*
***Key words:*** *deliberation, age, group, department, conference, reading.*

Ötən əsrin ortalarından başlayaraq Azərbaycanda məktəb kitabxanaları kəmiyyət və keyfiyyətcə inkişaf etmişdir. O dövrdə məktəb kitabxanalarının tarixində əlamətdar hadisələrdən biri də 200-dən artıq uşağı olan məktəblərin kitabxanaçılarının müşavirəsinin çağırılması oldu. Müşavirədə diqqətəlayiq işlər tərifləndi, bir çox məktəb rəhbərlərinin kitabxanalara ciddi fikir vermədiyi isə tənqid edildi.

Bu müşavirənin respublika miqyasında böyük tarixi əhəmiyyəti oldu. Məktəb kitabxanalarında iş canlanmağa başladı. Mətbuatda məktəb kitabxanalarının iş təcrübəsi əvvəlki illərə nisbətən daha çox işıqlandırılırdı. Məsələn, pedaqoji mətbuatda məktəb kitabxanası haqqında 1960-cı ildə yalnız bir məqalə, 1962-ci ildə isə 3 məqalə çap edilmişdisə, 1964-cü ildə bunların sayı 8-ə qalxmışdır (2).

XX əsrin 60-cı illərində məktəb kitabxanaları öz qarşısına aşağıdakı vəzifələri qoymuşdu: a) Şagird mütaliəsində yaş xüsusiyyətlərini nəzərə almaq; b) şagirdin zövq, maraq və arzusunu bilmək və onu düzgün istiqamətə yönəltmək.

Qeyd edilən vəzifələrin yerinə yetirilməsi üçün ədəbiyyat seçimi uşaqların yaş xüsusiyyətlərinə uyğun olaraq kitabxanada bölmələr üzrə təşkil edilmişdi. Kitabxanaçı bununla yanaşı, oxucuları da qruplaşdırıb kitab tədavülü edirdi. Hər qrup üçün ayrı kitab təşkil edilmişdi. Qruplar aşağıdakı kimi idi: I-II siniflər; III-IV siniflər; V-VIII siniflər; IX-XI siniflər.

Şagirdlərin zövq və marağını öyrənərkən oxucu formulyarından geniş istifadə olunurdu. Formulyarda oxucu xasiyyətləri müəyyən edilirdi: a) üzv olduğu tarix; b) necə oxuyur (orta, əla, yaxşı); c) mütaliəyə həvəsi necədir; ç) kimlərin məsləhət və təsiri nəticəsində kitab alır; d) kitabı necə (tam, yarımçıq) oxuyur; e) oxuduğunu dərk edirmi; ə) ən çox hansı janr (nəsr, nəzm) üzrə mütaliə edir.

Bu dövrdə məktəb müdiriyyətləri öz istehsalat planlarında sinifdənxaric mütaliəyə ayrı bir bölmə ayırıb, il ərzində şagirdlərin mütaliəsini nəzarətə alırdılar. Məsələn, Yevlax şəhərindəki 3 nömrəli orta məktəbin istehsalat planında aşağıdakı məsələlər qoyulmuşdur:

1. Oxucu konfransları, dərnəklər, ədəbi-bədii gecələr keçirmək və sinifdənxaric oxunun təşkilinə nəzarət etmək.
2. Sinifdənxaric oxunu necə təşkil etmək haqqında müəllimlərə metodik göstərişlər vermək.

3. Mütaliəyə marağı artırmağın yolları haqqında tövsiyələr vermək.

4. Mütaliənin nəticələrinin necə hesaba alındığını vaxtaşırı yoxlamaq.

Əlbəttə ki, direktorların istehsalat planlarında sinifdənxaric mütaliəyə rəhbərlik fərqli olmuşdur.

Bu dövrdə sinif kitabxanalarının təşkili, siniflər üzrə oxunacaq kitabların müəyyən edilməsi, onların planlı mütaliəsi sinifdənxaric mütaliənin səmərəliliyini artıran tədbirlərdən sayılmışdır. İşin nəticəsi isə fənn müəllimləri, sinif müəllimləri, sinif rəhbərləri və məktəb kitabxanası tərəfindən yoxlanıb ümumiləşdirilirdi.

Şagirdlərə aşağıdakı mütaliə tövsiyələri edilərək məktəbin kitabxanasından asılırdı.

1. Hər gördüyün kitabı dərhal oxumaq qərarına gəlmə.

2. Mütaliə üçün kitab seçərkən kitabxanaçının və müəllimin məsləhətindən istifadə et.

3. Kitab oxuyarkən tələsmə, düşünərək oxu.

4. Başa düşmədiyin söz və ifadənin üstündən keçmə. Onu lüğət dəftərçəsinə yazıb mənasını öyrənməyə çalış.

5. Kitabı oxuyarkən abzas və cümlələri buraxma. Kitabı axıra qədər oxu.

6. Oxu zamanı kitabın müəllifinin adını, hansı nəşriyyat tərəfindən nəşr olunduğunu, nəşr edilmə tarixini, əsas ideyasını, başlıca qəhrəmanlarını, dilini möhkəm mənimsəməyə çalış.

7. Kitabda xoşuna gələn fakt və hadisələri qeyd dəftərinə yaz.

8. Kitabı təmiz saxla, səhifələrini korlama, yazıb qaralama.

9. Yorulana qədər oxuma.

10. Uzanaraq oxuma.

11. Qaranlıqda oxuma. Elə et ki, işıq sol tərəfdən düşsün.

Qeyd edilən dövrdə aparılan işlərdən biri və ən başlıcası oxucu yığıncaqlarının – oxucu konfranslarının aparılması idi. Oxucu konfransları şagird mütaliəsinin məzmununu, mütaliə prosesinin xüsusiyyətlərini, kəmiyyət və keyfiyyətlərini aşkar edir və lazımi tədbirlərin görülməsini zəruri edirdi (3).

Burada şagirdlər qazandıqları müvəffəqiyyətlərdən və rast gəldikləri çətinliklərdən danışırdılar.

Konfransların maraqlı keçməsi üçün əmək və müharibə veteranları, eləcə də digər əlaqədar şəxslər konfransa dəvət olunur, onlarla görüşlər keçirilirdi (3).

Məktəb kitabxanaları IX, X, XI sinif şagirdlərindən ibarət kitabxanaçılıq dərnəyi təşkil etmişdilər ki, bu dərnəklər 3 il fəaliyyəti müddətində şagirdlərə kitabxanaçılıq sənətini də öyrədirdi. Şagirdlər kamal attestatı ilə birlikdə həmin sənət barədə də vəsiqə alır, müəllimlərin fəal iştirakı ilə kitab müzakirələri, tematik gecələr keçirir, kitabı müxtəlif metod və üsullarla təbliğ edirdilər. Azərbaycanın görkəmli yazıçıları, alimləri, incəsənət ustaları ilə görüşlər təşkil olunurdu. Məsələn, 1964-cü ilin 22 sentyabrında Azərbaycan yazıçıları İmran Qasımov və Həsən Seyidbəyli ilə görüş keçirilmiş, onlar öz yaradıcılıq planlarından danışmışlar.

Bu dövrdə də əvvəlki dövrlərdə olduğu kimi məktəb kitabxanalarına rəhbərlik üçün vəsait və metodiki tövsiyə, demək olar ki, yox dərəcəsində idi. Baxmayaraq ki, məktəb və uşaq kitabxanaları haqqında qısa məqalələr yazılır, ümumi mülahizələr qeyd edilirdi. Bunlar qeyri-ixtisasçı və gənc ixtisasçı kitabxanaçılar üçün qeyri-qənaətbəxş hesab oluna bilərdi. Ancaq qabaqcıl pedaqoq və alimlərimizin zehni düşüncəsi sayəsində bu çatışmazlıqların, az da olsa, qarşısı alınırdı. Onların şagird mütaliəsi haqqında bir çox məqalə, əsər və tövsiyələri kitabxanaçıların köməyinə gəlirdi. O cümlədən onların mə-

qalə, əsər və kitabçaları Azərbaycanda məktəb kitabxanalarının inkişaf tarixini bir daha zənginləşdirmişdir. O cümlədən İ.Vəlixanlının 1964-cü ildə “Azərbaycan məktəbi” jurnalında çap edilmiş “Şagirdlərin mütaliə mədəniyyəti haqqında” məqaləsinin, A.Xələfovun “Mütaliə mədəniyyəti haqqında” kitabının (1965), “Şagirdlərin sinifdənxaric mütaliəsinə rəhbərlik (IV-VII siniflər)” (1966) və s. məqalələrinin rolu böyük olmuşdur. Ancaq bununla belə şagird mütaliəsi haqqında metodik boşluq mövcud idi.

Bu boşluğu aradan qaldırmaq üçün respublikanın Maarif Nazirliyi tövsiyə və təkliflər edərək şagird mütaliəsi haqqında yeni məqalə, əsər və metodik vəsaitlərin yazılması və onların təbliği ideyasını irəli sürdü. O, akademik M.Mehdizadə mütaliənin didaktik əhəmiyyətindən bəhs edərək yazırdı ki, bədii ədəbiyyat mütaliəsinin təşkili o qədər aktual, o qədər mühüm məktəb problemidir ki, bunu təşkil etmədən şagirdlərdə fəal idrak mövqeyinin formalaşdırılmasına nail olmaq olduqca çətindir, təlimdə vəzifə şagirdləri təkcə “öyrətmək” deyil, həm də “öyrətməyi öyrənməkdir”. Daha sonra akademik yazırdı ki, V-VIII siniflərdə mütaliə problemlərinin tədqiq olunmasına başlanmışdır, lakin I-IV və yuxarı sinif şagirdlərinin mütaliə mədəniyyətinin təşkili məsələsi hələ də öz tədqiqatçısını gözləyir (6).

Yeri gəlmişkən, A.Xələfov mütaliənin metod və üsullarından danışaraq, mütaliə mədəniyyətini üç mərhələyə ayırırdı:

1. Şagird bədii əsərdə nə axtarır, başlıca olaraq onun əsərə verdiyi qiymətin əsasını nədə görür?

2. Oxucu kitabları təhlil edirmi, əgər edirsə, xüsusən nəyi, daha doğrusu, əsərin hansı cəhətini nəzərdə tutur?

3. Oxucu kitabları təhlil etməklə estetik mədəniyyəti, bədii yaradıcılıq xüsusiyyətlərini anlayırmı, ideyanı dərk edirmi? (7).

Birinci mərhələdə, əsərdə oxucu hər şeydən çox onun məzmunu, fabulası ilə maraqlanır. O istəyir ki, əsər daha çox maraqlı olsun, əsərdə əsas hadisənin inkişafı elə qurulsun ki, nə ilə qurtaracağı əvvəlcədən məlum olmasın.

Mütaliə mədəniyyəti birinciyə nisbətən yüksəksəviyyəli olan şagirdlər ikinci mərhələyə aid edilir. Onlar əsərdən həyat materialı, öz əxlaqi sifətləri ilə rəğbət hissi oyadan qəhrəmanları axtarıb tapmaq istəyirlər.

Üçüncü mərhələdə şagirdlər estetik mədəniyyəti, bədii yaradıcılıq xüsusiyyətlərini anlamaq, əsəri ideya-bədii cəhətdən bütünlükdə təhlil edə bilməsi ilə fərqlənirlər. Əsərin əxlaqi-estetik cəhəti, qəhrəmanın əxlaqi hərəkətlərinə verilən qiymət oxucu tənqidinin mərkəzində durur.

Bu təxmini mərhələlərin əhəmiyyəti ondan ibarət olmuşdur ki, abonentlə söhbət zamanı fərdi mütaliə planı və göstərici tərtib edərkən bu məsələlərin nəzərə alınması kitabxanada oxucuların mütaliəsinə rəhbərlik işinin keyfiyyətini yüksəldər və mövcud nöqsanların aradan qaldırılmasına müəyyən kömək edər (7).

Ötən əsrin 60-cı illərində məktəb kitabxanalarının işləri ilbəil təkmilləşdirilirdi. Bu, ondan irəli gəlirdi ki, məktəblərdə bütün müəllim kollektivi kitabxanaya yaxından kömək edib, tövsiyə siyahıları tərtib edirdilər, şagirdlərin yaş səviyyəsinə uyğun kitabların verilməsinə nail olurdular. Bir çox tədbirləri müəllim kollektivi özü aparırdı ki, bu da kitabxananın səmərəli işini təmin edirdi (8).

Həmin dövrdə uşaq bağçasından başlamış ümumtəhsil məktəblərinin bütün siniflərində ədəbi-bədii yaradıcılıq işlərinə ciddi fikir verilirdi. O dövrün mətbuatında qeyd edilirdi: yaradıcılıq, eləcə də ədəbi yaradıcılıq yeni, orijinal və ictimai əhəmiyyətli məh-

sul verən mürəkkəb bir prosesdir. O, insandan dərin həyati bilik, yüksək mədəniyyət, möhkəm əqidə, xüsusi keyfiyyətlər – özünə qarşı yüksək tələbkarlıq, cəmiyyət və insanlar qarşısında məsuliyyət hissi, hədsiz əməksevərlik tələb edir. Lakin bunlarla yanaşı, ədəbi yaradıcılıqda insanın qabiliyyət və istedadının da mühüm rolu vardır.

Buna görə də məktəblilərdə ədəbi yaradıcılıq qabiliyyətini tərbiyə etmək üçün onların ədəbi yaradıcılıq fəaliyyəti ilə tanış olmaq, ədəbi yaradıcılıq qabiliyyətinin psixoloji quruluşuna daxil olan komponentlərin onlarda nə kimi xüsusiyyətlərə malik olmasını bilmək şagirdlərin ədəbi yaradıcılığının tərbiyəsi ilə məşğul olan hər kəs üçün zəruridir. Çünki ədəbi yaradıcılıq qabiliyyəti insanın ədəbi yaradıcılıq fəaliyyətini təmin edən müəyyən psixoloji komponentlərin vəhdətindən ibarətdir.

Məktəbin həyatla əlaqələndirilməsində, yüksək mənəvi keyfiyyətlərin formalaşmasında, şagirdlərin təlim və tərbiyəsində, onların dünyagörüşünün genişlənməsində, proqram materiallarının mənimsənilməsində, bədii hislərin və yüksək əxlaqi keyfiyyətlərin tərbiyə olunmasında məktəb kitabxanasının böyük rol oynadığı qeyd edilirdi.

Kitab insanlara yeni biliklər verir, onun dünyagörüşünü genişləndirir, nitq mədəniyyətini gözəlləşdirir. Ona görə də dövlət və hökumət məktəb kitabxanalarının şəbəkəsinin genişləndirilməsinə, onların kitab fondunun zənginləşdirilməsinə həmişə qayğı göstərmişdir. Çünki gənc nəslin yeni dövrün tələblərinə uyğun yetişdirilməsində, onların bilik dairəsinin genişləndirilməsində məktəb kitabxanalarının da böyük rolu vardır. Bunun vacibliyi hələ o dövrdə də hiss edildiyindən XX əsrin 60-cı illərində bütün məktəblərdə kitabxana mövcud idi. 1965-ci ilin sonunda respublika məktəblərində kitab fondu 5 milyon nüsxəyə çatmışdır ki, bunun da 3 milyon nüsxədən artığı ancaq sinifdənxaric oxu üçün olmuşdur (10).

Bəs bu kitabxanalardan necə istifadə edilmişdir? Məktəb kitabxanaları üzərilərinə düşən vəzifənin öhdəsindən gələ bilmişdirmi?

Araşdırmalar göstərir ki, respublika üzrə bir çox kitabxanalar keçən əsrin 60-cı illərində şagirdlərin mütaliəsini düzgün istiqamətləndirmişlər: şagirdlərin öz yaş xüsusiyyətlərinə uyğun kitablar oxumalarına nail olunmuşdur; ayrı-ayrı siniflər üçün tövsiyə siyahıları tutulmuşdur; oxucularla müsahibələr keçirilmiş, kitabla rəftar qaydaları haqqında geniş söhbətlər edilmişdir.

Bununla yanaşı, məktəb kitabxanalarına bu dövrdə də nəzarət zəif olmuşdur. Mənbələrin birində deyilir: “Xalq maarif şöbəsi işçiləri məktəblərdə olarkən çox zaman kitabxanaya baş çəkmir, oxucuların miqdarı ilə, uşaqların hansı kitablara maraq göstərmələri, kitabxanaçının fəaliyyəti ilə maraqlanmırlar” (11).

O dövrdə mövcud olan nöqsanların aradan qaldırılması məqsədilə Maarif Nazirliyinin kollegiyası 29 iyun 1963-cü ildə “Respublika məktəblərində sinifdənxaric oxunu yaxşılaşdırmaq tədbirləri haqqında” xüsusi qərar qəbul etdi. Qərarda məktəb kitabxanalarının maddi bazasının möhkəmləndirilməsi, burada ali təhsilli kitabxanaçının işləməsinə nail olunması, müəllimlərin yeni çıxan ədəbiyyatla müntəzəm tanış olması üçün əməli tədbirlərin görülməsi xüsusi olaraq qeyd olunur. Qərarda, həmçinin Azərbaycan məktəblərinin materialları əsasında sinifdənxaric mütaliəyə rəhbərlik mövzusunda elmi-tədqiqat əsərlərinin yazılmasının vacibliyi də göstərilirdi (13).

*Rəyçi: prof. M.İlyasov*

**İstifadə edilmiş ədəbiyyat**

1. Məktəb və uşaq kitabxanaları işçilə-

rinin müşavirəsi. // Azərbaycan müəllimi, 29 mart 1962, № 25.

2. Журнал Министерство Народного Проведения, часть XXX-C. П., 1853.

3. Yusifov Y. Bilik mənbəyi, mənəvi “qida mənbəyi” // Azərbaycan məktəbi. 1968, № 2.

4. Nemətzadə H. və b. Məktəb kitabxanalarında qayda yaratmalı. // Azərbaycan müəllimi, 22 noyabr 1962.

5. Nadir A. Məktəb kitabxanasında. // Azərbaycan müəllimi, 8 oktyabr 1964.

6. Mehdizadə M. Azərbaycan SSR-də məktəb təhsili yeni yüksəlişdə (rusca). B., 1967.

7. Xələfov A. Şagirdlərin mütaliə mədəniyyəti haqqında // Azərbaycan məktəbi, 1964, № 6.

8. Qurbanov Ə. Kitabxana və ateizm tərbiyəsi // Azərbaycan məktəbi, 1964, № 4.

9. Kərimov R. Məktəb kitabxanası // Azərbaycan məktəbi, 1963, № 2.

10. Məktəb kitabxanasının fondu. // Azərbaycan müəllimi, 31 may 1985, № 45, (4121).

11. Məktəb kitabxanalarına diqqəti artırmalı (Baş məqalə). // Azərbaycan müəllimi, 2 dekabr 1965, № 95.

12. “Azərbaycan məktəbi” jurnalı. 1962, № 4.

13. Azərbaycan SSR Maarif Nazirliyində (Məktəb kitabxanası). // Azərbaycan müəllimi, 29 oktyabr 1975, № 87.

**Ю.Газыев**

**Из истории развития школьных библиотек в Азербайджане**

**Резюме**

В 60-ые годы прошлого столетия многие библиотеки по республике направили чтение учеников в нужном направлении: ученики достигли возможности читать книги, соответствующие их возрасту. Были составлены рекомендуемые списки по разным классам; проведены беседы с читателями о правилах обращения с книгой.

**Y.Qaziyev**

**On development history of school libraries in Azerbaijan**

**Summary**

The article is dedicated to the school libraries which have been developed highly in the period of socialism (1961-1965). Researches were carried out, recommendations were listed for separate classes, and interviews were taken from readers, concerning this matter.

*Metodika, qabaqcıl təcrübə*

# ŞAGİRDLƏRƏ VƏ TƏLƏBƏLƏRƏ QARABAĞIN TARİXİ OBYEKTİV, HƏRTƏRƏFLİ ÖYRƏDİLMƏLİDİR

**Qasım Hacıyev**
***AMEA-nın A.A.Bakıxanov adına Tarix İnstitutunun "Qarabağ tarixi" şöbəsinin müdiri, tarix elmləri doktoru***

***Açar sözlər:*** *Azərbaycan, Qarabağ, tarix, mövzu, dərs, proqram.*
***Ключевые слова:*** *Азербайджан, Гарабах, история, тема, урок, программа.*
***Key words:*** *Azerbaijan, Karabakh, history, topic, lesson, program.*

"Azərbaycan məktəbi" jurnalının 2013-cü ildə nəşr olunan 6-cı nömrəsində "Qarabağ tarixi" proqramı üzrə qədim dövrdən XX əsrin əvvəllərinədək Qarabağın tarixini əhatə edən mövzuların tədrisi şərh edilmişdir. Azərbaycanın Qarabağ regionunun tarixi coğrafiyası, Azərbaycanın ilk dövlətlərinin yarandığı dövrdə Qarabağ regionunun tarixi, Qarabağın Erkən Orta əsrlər və ərəb xilafətinin hakimiyyəti dövrünün tarixi, IX yüzilliyin ikinci yarısı – XII yüzillikdəki tarixi ilə bağlı izahlar verilmişdir. Eyni zamanda burada XVI-XVII yüzilliklərdə Qarabağ regionunun ictimai-siyasi vəziyyətinə, iqtisadi həyatına, mədəniyyətinə, XVIII əsrdə Qarabağ xanlığının yaranmasına, XIX yüzillikdə Qarabağ regionunda iqtisadi vəziyyətə, inzibati islahatlara, sosial münasibətlərə, həmçinin maarif, mədəniyyət, mətbuat, ədəbiyyat və incəsənətə dair biliklərin tədrisinə dair şərhlər də təqdim olunmuşdur.

Azərbaycanın Qarabağ regionunun XX yüzilliyin əvvəllərindən müasir dövrə qədər tarixi isə aşağıdakı kimi, ayrı-ayrı mövzularla, xronoloji ardıcıllıqla öyrədilir.

"Azərbaycanın Qarabağ bölgəsi XX yüzilliyin əvvəllərində (1900-1917-ci illər)" mövzusu ilə əlaqədar olaraq ilk öncə XX yüzilliyin əvvəllərində regionda sosial-iqtisadi vəziyyət haqqında ümumi məlumat verilir. Sonra Qarabağ əhalisinin milli və sosial tərkibi barədə də məsələlərə toxunulur. Azərbaycanın Qarabağ regionunda xalqın sosial və milli əsarətə qarşı mübarizəsindən bəhs edilir. Ardınca 1905-1907-ci illərdə Qarabağ regionunda milli münasibətlərin kəskinləşməsi, Şuşa, Cəbrayıl, Karyagin (Füzuli) qəzalarında müsəlmanlara qarşı ermənilərin törətdiyi kütləvi qırğınlardan bəhs edilir. Eyni zamanda, Qarabağın kənd təsərrüfatı və sənətkarlıq sahələrindən danışılır. Qarabağ regionunun şəhərlərinə və ticarət əlaqələrinə dair ətraflı məlumat verilir, mədəniyyət sahəsində baş verən dəyişikliklər şərh edilir.

XIX yüzilliyin sonu - XX yüzilliyin əvvəllərində Qarabağda elm və mədəniyyətə dair məlumat verilir.

"Azərbaycanın Qarabağ bölgəsi ZFDR və Azərbaycan Xalq Cümhuriyyəti dövründə" mövzusu üzrə ümumi məlumat verilir. Burada Rusiyada baş vermiş 1917-ci il fevral inqilabının Azərbaycanda, həmçinin Qarabağ regionunda vəziyyətə təsirindən bəhs edilir.

1918-ci ilin yazında bolşevik-daşnak müttəfiqliyinin azərbaycanlılara qarşı kütləvi qırğınlar törətməsi, Qarabağda erməni-

lərin azərbaycanlılara qarşı soyqırımı siyasəti və bunun nəticələri haqqında məlumat verilir. Sonra Bakı Xalq Komissarları Sovetinin yaradılması, fəaliyyəti və onun Qarabağ regionunda münasibətindən bəhs edilir. Qarabağda Zaqafqaziya Federativ Demokratik Respublikası zamanı ümumi vəziyyətə, siyasi və iqtisadi duruma dair məlumat verilir.

Mövzu ilə əlaqədar Qarabağ regionunun Azərbaycan Xalq Cümhuriyyəti (AXC) dövründə vəziyyətindən, xüsusi olaraq AXC-nin yaranması dövründə Qarabağ regionunda milli oyanışdan, siyasi-hərbi proseslərdən bəhs edilir. Qarabağ regionunda 1918-1919-cu ilin birinci yarısında ümumi vəziyyətə toxunulur. 1919-cu ilin ikinci yarısı – 1920-ci illərdəki proseslər şərh edilir. Ardınca 1920-ci ilin yazında AXC-də hökumət böhranından, Qarabağ regionunda erməni qiyamından, separatizmindən bəhs edilir. Ermənilərin azərbaycanlılara qarşı soyqırımına dair ətraflı məlumat verilir. XI Qırmızı Ordunun Azərbaycana hərbi müdaxiləsi, AXC-nin süqutu konkret və dolğun şəkildə şərh edilir.

Azərbaycan SSR-in Qarabağ regionunda baş verən proseslər şərh edilərkən XX əsrin 20-30-cu illərində Qarabağ regionunda sovet rejiminin qurulması və ona qarşı milli-müqavimət hərəkatından (1920-ci il) danışılır. Ermənistanın Yuxarı Qarabağı ələ keçirmək cəhdləri, Azərbaycanda erkən sovetləşdirmə dövrü, Azərbaycan SSR-in ərazi bütövlüyünə qəsd və qondarma Dağlıq Qarabağ Muxtar Vilayətinin yaradılması (1920-1923) haqqında ətraflı məlumat verilir.

Azərbaycan SSR-in DQMV-də sənayeləşdirmə və zorakı kollektivləşdirmə dövrü tarixi (XX əsrin 20-30-cu illəri) və bunun ağır sosial-iqtisadi nəticələrindən bəhs edilir. Sonra Azərbaycan SSR-in DQMV-də mədəni quruculuq və mənəvi həyata dair şərhlər, Qarabağda sosial dəyişikliklərin həyata keçirilməsi və yeni inzibati ərazi quruluşu haqqında məlumat verilir.

DQMV-də sosial-iqtisadi həyat, inzibati-amirlik sisteminin güclənməsi, repressiyalar, Sovet hökumətinin ilk illərindən etibarən Qarabağda milli dəyərlərin məhv edilməsi elmin, ədəbiyyatın və incəsənətin vəziyyəti konkret faktlarla göstərilir.

“Azərbaycan SSR-in Dağlıq Qarabağ Muxtar Vilayəti 1941-1950-ci illərin I yarısında” mövzusu üzrə ümumi məlumat verilir. İkinci Dünya müharibəsi dövründə, DQMV-də hərbi, iqtisadi və mədəni səfərbərlikdən, DQMV-nin İkinci Dünya müharibəsi dövründə faşizmə qarşı vuruşlarda ön və arxa cəbhədə fəaliyyətlərindən bəhs edilir. Həmçinin DQMV-nin iqtisadi həyatı, xalq təsərrüfatının bərpa və inkişafında Qarabağ regionunun yeri və rolu haqqında (yanvar 1946-dekabr 1950) məlumat və şərh verilir.

DQMV-də (yanvar 1946-dekabr 1950-ci illər) mədəni quruculuq işlərinə dair məlumat verilir. Mərkəzi hökumətin anti-azərbaycan siyasəti və Ermənistan SSR-in Azərbaycan SSR-in DQMV-nə yeni ərazi iddiaları (1940-1950-cı illərdə) haqqında şərh verilir. Eyni zamanda DQMV-də 1940-1950-ci illərdə mədəniyyətin, təhsilin inkişafından, mətbuatın səviyyəsindən danışılır.

“Azərbaycan SSR-in Dağlıq Qarabağ Muxtar Vilayəti 1950-ci illərin sonu-1960-cı illərdə” mövzusu əsasında DQMV-də sənayenin inkişafı, kənd təsərrüfatı, əhalinin sosial strukturu, rifah və məişəti haqqında məlumatlar qeyd olunur. DQMV-də təhsilin, elmin, ədəbiyyat və incəsənətin inkişafına yer verilir. Burada XX yüzilliyin 50-60-cı illərində Ermənistan SSR-in Azərbaycan SSR-ə qarşı növbəti ərazi iddialarından və bunun nəticələrindən danışılır.

“Azərbaycan SSR-in Dağlıq Qarabağ Muxtar Vilayəti 1970-1980-ci illərdə” mövzusunda SSRİ hakimiyyət orqanlarının

Azərbaycan SSR-ə qarşı qərarları məsələsinə toxunulur. DQMV-nin dirçəlişi siyasətinə, DQMV-də 1970-1985-ci illərdə iqtisadi inkişafa, sosial yüksəlişə, mədəniyyətin dinamik inkişafına dair məlumat qeyd olunur.

1980-ci illərin ikinci yarısında SSRİ-də "Yenidənqurma" siyasəti və bunun iflası, DQMV-də "yenidənqurma", onun ictimai, iqtisadi və siyasi nəticələri (1986-1988-ci illər) şərh edilir. Ölkədə erməni separatizminin yenidən baş qaldırması, Ermənistanın Azərbaycana qarşı təcavüzkar siyasətinin yeni mərhələsinin başlanmasına dair məlumat verilir. Uydurma Dağlıq Qarabağ problemi, Dağlıq Qarabağ ətrafında baş verən hadisələr, azərbaycanlıların kütləvi surətdə Ermənistandan deportasiya edilməsindən bəhs edilir. Eləcə də, SSRİ rəhbərliyinin anti-azərbaycan siyasəti və DQMV-də milli münaqişə ocağının alovlandırılması (1988-ci il), DQMV-nin Azərbaycan tərkibindən çıxması və Muxtar Vilayətin Ermənistana birləşdirilməsinə dair qərarların qəbul edilməsi şərh edilir. Burada DQMV-də ictimai vəziyyətin gərginləşdirilməsi, Ermənistanın Azərbaycanın Qarabağ regionunu dövlət separatizminin meydanına çevirməsi, eyni zamanda, DQMV-də Azərbaycanın suveren hüquqlarının pozulması, DQMV-də Xüsusi İdarə Komitəsinin yaradılması və onun ermənipərəst siyasəti (1989-cu il), Qarabağ regionunda qanlı terror əməliyyatları və qondarma "Dağlıq Qarabağ Respublikası"nın yaradılması (1990-1991-ci illər) haqqında ətraflı məlumat verilir.

"Dağlıq Qarabağ Azərbaycan Respublikasının yaranması və möhkəmlənməsi dövründə (1991-2008-ci illər)" mövzusu üzrə Azərbaycan Respublikasının dövlət müstəqilliyini bərpa etmək haqqında Azərbaycan Respublikası Ali Sovetinin Bəyannaməsi və dövlət müstəqilliyi haqqında Konstitusiya Aktının qəbul edilməsinə dair məlumat verilir.

Ermənistanın Azərbaycana ərazi iddiaları və etnik təmizləmə siyasətinin yeni mərhələsinin başlanmasından bəhs edilir. Burada erməni silahlı birləşmələrinin Azərbaycan ərazilərinə hərbi müdaxiləsi, Qarabağ müharibəsinin başlanması, erməni silahlı birləşmələrinin Yuxarı Qarabağda irimiqyaslı hərbi əməliyyatları, Xocalı soyqırımı (1992-ci il), Qarabağ torpaqlarının Ermənistan tərəfindən işğalı haqqında ətraflı məlumat verilir. Ermənistan-Azərbaycan Dağlıq Qarabağ münaqişəsi və Azərbaycan Respublikasının xarici siyasətindən, Dağlıq Qarabağ münaqişəsinin beynəlxalq probleme çevrilməsindən, münaqişənin həllində ATƏT-in vasitəçilik missiyasından, münaqişə ilə bağlı BMT-nin qətnamələrindən, münaqişənin nizamlanması prosesində Avropa Şurası, Avropa Birliyi və digər beynəlxalq təşkilatların iştirakından bəhs edilir.

Qarabağ müharibəsi, Azərbaycanın 20 % ərazisinin – Dağlıq Qarabağın və ətraf 7 rayonun Ermənistan silahlı qüvvələri tərəfindən işğalı şərh edilir. Burada Ermənistan-Azərbaycan Dağlıq Qarabağ münaqişəsinin kəskinləşməsi, Respublikada növbəti hakimiyyət böhranı, ümummilli lider Heydər Əliyevin Respublika rəhbərliyinə qayıdışı, daxili sabitliyin yaranması üçün həyata keçirilən tədbirlər, Dağlıq Qarabağ böhranının dərinləşməsi və ordu quruculuğu, müharibənin dayandırılması, atəşkəs aktının imzalanması haqqında məlumat verilir. Azərbaycan Respublikasının müstəqilliyi və ərazi bütövlüyü uğrunda mübarizənin güclənməsindən danışılır.

Azərbaycan Respublikasında iqtisadi islahatların, iqtisadi inkişafın və neft strategiyasının Dağlıq Qarabağ probleminin həlli məsələsinə təsiri, "Əsrin müqaviləsi"nin Ermənistan-Azərbaycan Dağlıq Qarabağ münaqişəsinin həlli məsələsində rolu şərh edilir.

Dağlıq Qarabağ münaqişəsinin böyük

dövlətlərin və beynəlxalq təşkilatların siyasətində yeri, Ermənistan-Azərbaycan Dağlıq Qarabağ münaqişəsinin Azərbaycan Respublikasının xarici siyasətində yeri, münaqişənin sülh yolu ilə həll edilməsi siyasəti, beynəlxalq aləmdə müzakirəsi, münaqişənin həlli üçün regional xarici siyasətə dair məlumat verilir. İlham Əliyevin Azərbaycan Respublikasının prezidenti seçilməsindən və onun Ermənistan-Azərbaycan Dağlıq Qarabağ münaqişəsinin sülh yolu ilə həll edilməsi uğrunda mübarizəsindən ətraflı bəhs edilir.

*Rəyçi: prof. M.Əmrahov*

**Г.Гаджиев**

**Необходимо объективно, всесторонне преподавать историю Гарабаха учащимся и студентам**

**Резюме**

Уроки, занятия по истории Гарабаха проводятся на основании учебной программы “История Гарабаха” (Г.А.Гаджиев. Программа по истории Гарабаха. Баку, 2010, на азерб. языке), изданной в 2010 г. Учащиеся и студенты изучают историю Гарабаха XX столетия по нижеследующим темам:

- “Гарабахский регион Азербайджана в начале XX века (1900-1917)”;
- “Гарабахский регион Азербайджана в период существования АДР и ЗСФСР”;
- Установление советского режима в 20-30-х гг. XX столетия в Гарабахском регионе Азербайджанской ССР и движение национального сопротивления (1920 г);
- “НКАО Азербайджанской ССР в 1941- первой половине 50-х гг. XX века”;
- “НКАО Азербайджанской ССР в конце 50-х-60-х гг. XX столетия”;
- “НКАО Азербайджанской ССР в 70-80-х гг. XX века”;
- Нагорный Гарабах в период возникновения и укрепления Азербайджанской Республики (1991-2008 гг.).

**G.Hajiyev**

**Pupils and students must be objectively and comprehensively taught the history of Karabahk**

**Summary**

Lessons, studies on the history of Karabakh are conducted on the basis of the program “The history of Karabakh” (G.Hajiyev. The program on the history of Karabakh. Baku: 2010, in Azerbaijani published in 2010. Pupils and students learn the XX century history of Karabakh on the following topics:

- “The Karabakh region of Azerbaijan in the early XX century (1900-1917)”;
- “The Karabakh region of Azerbaijan in the period of the TSFDR and the ADR”;
- Establishment of the Soviet regime in the 20-30s of the XX century in Karabakh region of the Azerbaijan SSR and the National Resistance Movement (1920);
- “The MGAR of Azerbaijan SSR in 1941 - the first half of the 50s of the XX century”;
- “The MGAR of Azerbaijan SSR in the late 50s - 60s of the XX century”;
- “The MGAR of Azerbaijan SSR in the 70 -80s of the XX century”;
- “Daghlig Karabakh during the emergence and strengthening of the Azerbaijan Republic (1991-2008 years)”.

***Məmməd Əmin Rəsulzadə - 130***

# MƏMMƏD ƏMİN RƏSULZADƏ YARADICILIĞINDA PEDAQOJİ İDEYALAR

**Hüseyn Əhmədov**
***akademik***

***Açar sözlər:*** *Azərbaycan Xalq Cümhuriyyəti, milli istiqlal ideyalarının tərənnümçüsü, təhsilin demokratikləşdirilməsi, müstəqil müəllimlər seminariyasının yaradılması.*

***Ключевые слова:*** *Азербайджанская Демократическая Республика, глашатай суверенитет народа, демократизация образования, учреждение самостоятелной учителской семинарии.*

***Key words:*** *The Azerbaijan Democratic Republic, promoter of the ideas of national sovereignty, democratization of education, creation of an independent teachers' seminary.*

Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev Azərbaycan Xalq Cümhuriyyətinin banisi Məmməd Əmin Rəsulzadənin 130 illik yubileyinin dövlət səviyyəsində keçirilməsi ilə bağlı sərəncam imzalamışdır.

XIX əsrin sonları və XX əsrin əvvəllərində Azərbaycan xalqı milli müstəqillik, azadlıq duyğuları ilə yaşayırdı. O illərdə xalqımızın qabaqcıl şəxsiyyətləri, mütəfəkkir adamları, ziyalıları xalqımızda milli azadlıq, milli müstəqillik duyğularını gücləndirmiş, milli dirçəliş, milli oyanış əhvali-ruhiyyəsini yaymış və bunların hamısı məntiqi olaraq Azərbaycan Xalq Cümhuriyyətinin yaranmasına gətirib çıxarmışdır.

Belə mütəfəkkir, maarifçi və ziyalı şəxslərdən biri də M.Ə.Rəsulzadə idi.

İstedadlı alim, jurnalist və publisist olan M.Ə.Rəsulzadə 1884-cü ildə Bakının Novxanı kəndində anadan olmuşdur. İlk təhsilini "Rus-Azərbaycan" məktəbində almış, sonra Bakı texniki məktəbini bitirmişdir. Gənclik illərində mətbuatda dərc olunmuş yazılarında xalqa söz, mətbuat, vicdan, cəmiyyət və ittifaqlar yaratmaq azadlıqları verilməsi tələbləri ilə çıxış edir, xalqı maariflənməyə çağırır, Rusiyanın Azərbaycanda yeritdiyi milli qırğın siyasətini kəskin tənqid edirdi. 1905-1907-ci illər rus inqilabının gedişində və bundan sonra Azərbaycanda yaranan milli oyanış, Həsən bəy Zərdabi, Əlimərdan bəy Topçubaşov, Əhməd Ağa oğlu, Əli bəy Hüseynzadə və başqalarının çar Rusiyasının milli ayrı-seçkilik siyasətinə qarşı mübarizəsi M.Ə.Rəsulzadənin milli-siyasi görüşlərinin formalaşmasına güclü təsir göstərmişdir. M.Ə.Rəsulzadə 1905-1907-ci illər inqilabının məğlub olmasından sonra İrana, sonra isə Türkiyəyə mühacirət etmiş, burada Əli bəy Hüseynzadə və Əhməd Ağaoğlu ilə sıx əməkdaşlıq etmiş, "Türk ocağı" təşkilatına daxil olmuş, "Türk yurdu" jurnalında Cənubi Azərbaycan türklərinə həsr olunmuş məqalələr yazmışdır.

O, 1918-ci il mayın 27-də Azərbaycan Milli Şurasının (parlamentinin) sədri seçilmiş və Azərbaycan Xalq Cümhuriyyəti Parlamentinin formalaşdırılmasında mühüm rol oynamışdır.

M.Ə.Rəsulzadə parlamentin təntənəli açılışında (1918, 7 dekabr) parlaq nitq söyləmiş və sonra gənc Cümhuriyyətin dövlət quruluşu, daxili və xarici siyasətinin əsas prinsipləri barədə bəyannamə ilə çıxış etmişdir. Onun "Bir dəfə qaldırılmış bayraq bir daha enməz" sözləri parlament üzvlərinin ayaq üstə sürəkli alqışları ilə qarşılanmışdı. M.Ə.Rəsulzadə Azərbaycan Xalq Cümhuriyyəti Parlamentində Azərbaycanın milli və dövlət maraqlarına cavab verən qanunların qəbulunda həlledici rol oynamışdır. Azərbaycan Xalq Cümhuriyyətinin süqutundan sonra isə gizli fəaliyyətə keçmişdir.

O, Azərbaycan mətbuatı tarixində siyasi və pedaqoji publisistikanın ən görkəmli nümayəndələrindən biridir. Tədqiqatlar göstərir ki, onun 1903-1920-ci illərdə təkcə Azərbaycanın dövri mətbuatında 1200-dən artıq müxtəlif janrda yazıları dərc olunmuşdur. O, ədəbi-publisistik fəaliyyətini siyasi mühacirət illərində də davam etdirmişdir. Onun məqalələrində xalq maarifi, məktəb təhsili ilə bağlı çox maraqlı və dəyərli fikirlər vardır.

Yaşadığı ziddiyyətli və son dərəcə mürəkkəb dövrün bir sıra vacib pedaqoji problemlərindən bəhs edən məqalələrində çarizmin ucqarlardakı mürtəce təhsil siyasəti tənqid edilir. O, yerli məktəblərdə ana dili tədrisinin yarıtmaz olduğunu ayrıca vurğulayırdı. "Tərəqqi" qəzetinin 7 oktyabr 1908-ci il 70-ci sayında dərc etdirdiyi "Yerli məktəblər" adlı məqaləsində yazırdı: "məktəblərin çoxusunda ana dili dərsi varsa da dərsin özü və müəllimlərinin qədr və heysiyyəti yox dərəcəsindədir". O, məktəblərdə yerli dillərdən birinin vacib olduğuna baxmayaraq, bu dilin öyrənilməsinin əhəmiyyətsizliyə düçar olduğunu qeyd edirdi. Bu səbəbdən də "ana dilinin rəsmi varlığı həqiqi yoxluq dərəcəsinə gəlmişdir", - deyirdi. O, yerli xalqların, o cümlədən azərbaycanlıların uşaqlarına təlim olunan ana dili dərslərinin layiqli mərtəbəyə çatdırılmasını tələb edirdi. Həmin məqalə bu sözlərlə bitir: "Ən diqqət verməli məsələlərdən biri budur".

M.Ə.Rəsulzadə məktəb dərsliklərinə, o cümlədən "Əvvəlinci il", "İkinci il" adlı dərsliklərlə yanaşı, ibtidai məktəblərdə hesab dərsliklərinin də vacibliyini ön plana çəkirdi. O yenə də 1908-ci ildə "Tərəqqi" qəzetində (2 noyabr, 1908, № 91) dərc etdirdiyi "Hesab məsələləri" adlı məqaləsində ana dili dərsindən sonra ikinci yeri tutan hesab dərsinin əhəmiyyətindən bəhs edir və əvvəllər bu sahədə müvafiq kitabların olmadığını göstərirdi. O, ürək yanğısı ilə yazırdı ki, "Hesab məsələləri" kitabının su kimi gərək və lazım olduğunu" bilməliyik. M.Ə.Rəsulzadə yenicə çapdan çıxmış Üzeyir Hacıbəyovun "Hesab məsələləri" adlı kitabının nəşrini alqışlayırdı. O yazırdı: "Mühərrirlərimizdən müəllim Üzeyir Hacıbəyov cənablarının bu əsəri ibtidai məktəblərin birinci və ikinci şöbələri şagirdlərindən ötrü lüzumlu bir dərs kitabıdır".

Yaradıcılığı və pedaqoji irsi ilə yaxından tanış olduqda belə bir nəticə hasil olur ki, xalqımızın bu unudulmaz oğlu bütün həyatı boyu məktəblərin, xüsusilə də ibtidai məktəblərin milli olmasına çalışmışdır. Onun "Yerli ibtidai məktəblər" adlı məşhur məqaləsində oxuyuruq: "İbtidai məktəb gərək ki, milli olsun. Burada təlim ana dilində olsun. Bu məktəblər gərək camaatin məişətinə uyğun olsun" ("Tərəqqi " №107, 20 noyabr 1908-ci il).

M.Ə.Rəsulzadənin fəaliyyətində müəllim və müəllim hazırlığı problemi də ətraflı şərh edilmişdir. Onun "Müəllimlər gərək" ("Tərəqqi" №109, 23 noyabr 1908) adlı məqaləsi bu cəhətdən diqqətəlayiqdir. Məqalə bu sözlərlə başlayır: "Məktəb qədri bilindikcə, elm və mərifətə olan meyil artdıqca müəllim yoxluğu özünü bildirir!...."

M.Ə.Rəsulzadə dünyəvi təhsil verən, daha qabaqcıl və mütərəqqi olan rus məktəblərində deyil, milli ruhu və əxlaqı əks etdirdiyi üçün ruhani məktəblərə üstünlük verirdi. Təhsil almadan mədəniyyətə qovuşmağın qeyri-mümkünlüyünü dərk edən ədibin fikrincə, tək-tək fərdlərin deyil, yalnız bütün millətin maarifləndirilməsi ilə mədəniyyət yaratmaq mümkündür. Məktəbləri milli mədəniyyətin formalaşmasını sürətləndirən faktor kimi səciyyələndirən M.Ə.Rəsulzadə bu fikirdə idi ki, tədris müəssisələri millətin ruhuna, adət-ənənələrinə uyğun olmalıdır. O, ruhanilərin və müəllimlərin yeni ruhda tərbiyələndirilməsini diqqət mərkəzində saxlayır və məktəbin milliləşdirilməsi üçün olduqca əhəmiyyətli bir amil kimi təqdir edirdi. Ədib milli məktəblərin mövcudluğunu hər bir millətin ədəbi hüququ kimi səciyyələndirərək bunu istər siyasi, istərsə də elmi baxımdan əsaslandırmağı unutmurdu. "Açıq söz" qəzetində dərc etdirdiyi "Firudin bəy Köçərli məktubuna aid" yazısında isə müəllif Qori Müəllimlər Seminariyası məzunlarının ana dilini yaxşı bilmədiklərindən narahatlığını ifadə edirdi (3, s.140).

Qori Müəllimlər Seminariyası Azərbaycan şöbəsinin Azərbaycan şəhərlərindən birinə köçürülməsi fikri M.Ə.Rəsulzadə tərəfindən də təqdir edilmişdir. Məmməd Əmin Rəsulzadə "Müəllimlər gərək" adlı məqaləsində deyirdi: "Əcəba bütün Qafqaza müəllim yetişdirməkdən ötrü bir Qori seminariyası bəsdirmi?

O yazırdı: Müsəlmanlara məxsusi darülmüəllimin açmaq lüzumu çoxdan özünü bildirməkdədir. Zatən bu xüsusda artıq danışıqlar olunur və vaxtında bu danışıqlar, bu layihələrin qayətdə iti bir surət aldığı dəxi məlumumuzdur. Lakin bizim hər işimizdə olduğu kimi, bu məsələdə də bütün danışıqlarımız, layihələrimiz, təsəvvürlərimiz hələ danışıq, layihə, təsəvvür oluyor, qalıyor, ondan o tərəfə keçilmiyor!"..

1918-ci ildə AXC-nin yaradılmasından sonra Qori seminariyasının Azərbaycan bölməsinin Qazaxa köçürülməsi vacib bir məsələ kimi hökumətin qarşısında dururdu. Azərbaycan hökumətinin 22 iyun 1918-ci il tarixli qərarı ilə Zaqafqaziya Müəllimlər Seminariyasının Azərbaycan bölməsi müstəqil seminariyaya çevrilərək Qazaxa köçürüldü və burada fəaliyyətini davam etdirdi. Firidun bəy Köçərli seminariyanın direktoru təyin edildi.

M.Ə.Rəsulzadənin ədəbi-ictimai, siyasi və pedaqoji fəaliyyətində Azərbaycanda ilk ali məktəb - Bakı Dövlət Universitetinin açılması ayrıca əhəmiyyət kəsb edir. O, bu məsələnin ciddi tərəfdarı olmuş və universitetin təsis edilməsini dövlətin əsas vəzifələrindən biri hesab edirdi.

Bu gün ölkədəki ali məktəblərin flaqmanı olan Bakı Dövlət Universiteti Azərbaycan Xalq Cümhuriyyətinin ən böyük nailiyyətlərindən biridir. Bu universitetin yaranması o dövrdə gedən tarixi proseslərin zərurətindən doğan bir hadisə Azərbaycan Xalq Cümhuriyyətinin təhsil siyasətinin nəticəsi idi. Universitetin yaradılması məsələsi parlamentin iclaslarında gərgin keçən müzakirədən sonra öz həllini tapdı. O vaxt parlament üzvlərindən biri Mustafa Məmmədov demişdir: "Biz bu gün artıq universitetin möhtəşəm binasının təməl daşını qoyduq. Parlament tərəfindən həmin qanun layihəsinin qəbul edilməsi tariximizdə ən əhəmiyyətli aktlardan biri olacaqdır. Artıq universitetin taleyindən narahat olmağa dəyməz. Parlamentdə tarixi bir gün baş verdi".

Həqiqətən də, 21 avqust 1919-cu il bütövlükdə Azərbaycan təhsili, elm və mədəniyyət tarixinin ən mürəkkəb, ən gərgin, lakin ən şərəfli günlərindən biri oldu.

Universitetin yaradılmasında gərgin mübahisəyə səbəb olan məsələlərdən biri

təhsilin hansı dildə-rus, yoxsa Azərbaycan dilində olması ilə bağlı idi. Bu məsələdə "universitetin və maarifin həqiqi dostları" adlandırılanlar, o cümlədən M.Ə.Rəsulzadə, N.Yusifbəyli, R.Kaplanov, Səməd ağa Ağamalı oğlu və başqaları xüsusilə fərqlənirdilər.

Bakıda universitet açılmasını müdafiə edənlər həmin elm-təhsil ocağını milli müstəqilliyin, demokratik, azad, dünyəvi dövlətin əsas atributlarından biri sayır, onun xalqın intellektual potensialının, elm, təhsil və mədəniyyətinin, milli ruhunun, milli özünüdərkinin inkişaf etdirilməsinə, millətimizin müstəqil və azad yaşamağa layiq olduğunu bütün dünyaya sübut etməyə xidmət edəcəyinə inanırdılar.

Universitetdə tarixi reallıq üzündən milli kadrlar olmadığını, tədrisin rus dilində aparılacağını milli faciə kimi qələmə verənlərə qarşı haqq səsini ucaldan "universitetin və maarifin dostları" belə hesab edirdilər ki, təlimin rus dilində olması millətin və dövlətin mənafelərinə heç bir xələl gətirməz, əksinə, bu prosesə tez başlanmalıdır ki, az müddətdən sonra milli kadrlar yetişsin. Dünyanın bir çox ölkələrində yeni yaranan universitetlərin də ilk mərhələdə əcnəbi dildə təhsil vermələri artıq sınanmış təcrübədir və universitetdə tədrisin hansı dildə aparılmasına baxmayaraq, o, Azərbaycan dövlətinə, xalqına, Vətəninə xidmət edəcəkdir. Həm də Qanun layihəsinə görə, universitetdə ana dilimiz məcburi tədris ediləcəkdir. Elmin ümumbəşəri olduğu, hansı dildə olursa-olsun, onu öyrənməyin vacibliyi xüsusi olaraq vurğulanırdı.

Məmməd Əmin Rəsulzadə bu məsələdən danışarkən deyirdi: "Onların dəfələrlə rus elmi, rus mədəniyyəti,-deyə təkrar etmələri əfkarı-ümumiyyəni qorxudanmaz... Ülüm və fünun bitərəfdir. Dünyada rus elmi deyil, beynəlmiləl bir elm var. Biz bu beynəlmiləl elmi hər bir millətin ağzından eşitdiyimiz kimi, rus professorları ağzından da öyrənə bilərik. Çünki bizə ...elmi və fənni Çində belə olsa, öyrənməyi tövsiyə etmişlər. ...Binaən-ileyh biz rusluq mərkəzində, rus darülfünunlarında təhsil edənlərdən zərər görmədik...Darülfünunun faydalarından birisi də budur ki, burada bir kərə elmi bir müəssisə vücuda gələcək. Bununla məmləkətin məchul qalmış bir çox xüsusiyyəti öyrəniləcəkdir. Cəmaət arasında elmə və fənnə nə qədər həvəs artacaqdır. ...Digər tərəfdən, xaricə getməyə imkanı olmayan tələbələr elm və fənn hasil etmək imkanında olacaqlar. Vəqtilə bu darülfünun get-gedə milliləşəcək...Heç bir millət tarixən ilk addımında milli bir darülfünununa sahib olmamışdır. Darülfünun hansı dildə olursa da olsun, açıb oxumalıyıq..." (Azərbaycan Xalq Cümhuriyyəti. (1918-1920). Parlament (Stenoqrafik hesabatlar). Bakı, 1998, II cild, səh.11-12).

Universitetdə milli dil məsələsi ətrafında müzakirələrdə Səməd ağa Ağamalıoğlu böyük uzaqgörənliklə deyirdi: "Darülfünun olmasa, dil də qüvvələnməyəcəkdir. Darülfünun olan yerdə dil də böyüyür..." (yenə orada, səh.18).

Beləliklə, Azərbaycan Parlamenti 1919-cu il sentyabrın 1-də "Bakı Dövlət Universitetinin təsis edilməsi haqqında" qanun qəbul etdi. Həmin qanunda deyilirdi:

Dörd fakültədən ibarət Bakı şəhərində Dövlət Darülfünunu təsis edilir. Şərq şöbəsi ilə bərabər tarix və lisanə fakültəsi, riyaziyyat fakültəsi, hüquq fakültəsi və tibb fakültəsi.

Bakı Dövlət Universitetinin yaranmasında Azərbaycanın Ə.B.Haqverdiyev, T.Şahbazi, M.Şahtaxtlı, F.Rzabəyli, R.Məlikov, M.Əfəndiyev, M.Mirqasımov kimi tarixi şəxsiyyətləri ilə yanaşı, tanınmış rus alimlərinin, ilk növbədə, V.Razumovski

(universitetin ilk rektoru) və başqalarının böyük xidmətləri olmuşdur.

Beləliklə, 1919-cu il noyabrın 15-də Bakı Dövlət Universitetinin əsası qoyuldu və Azərbaycan özünün ali təhsil ocağını yaratdı. Bununla da Azərbaycan xalqının tarixinə yeni parlaq səhifə yazıldı. Avropa ilə Asiyanın qovuşuğunda yeni çıraq yandı. Azərbaycanda müasir dünyəvi ali təhsilin təməli qoyuldu.

Məlum olduğu kimi, 1919-cu ilə qədər Azərbaycanda ən yüksək təhsil ocaqları gimnaziyalar və müəllim seminariyaları idi. Azərbaycan gəncləri ali təhsil almaq üçün qonşu dövlətlərə, ilk növbədə, Türkiyə, Rusiya və Avropaya üz tuturdular. Bakı Dövlət Universitetinin yaradılması ölkədə ali təhsilin, ümumi təhsilin, elm və mədəniyyətin inkişafına böyük töhfələr verdi. Sonrakı illərdə Azərbaycanda yaranmış ali məktəbləri, elmi-tədqiqat institutları öz başlanğıcını Bakı Dövlət Universitetindən götürmüşdür.

İlk vaxtlar iki fakültə - tibb və tarix-filologiya fakültələri, 44 müəllim, o cümlədən 12 professorla fəaliyyətə başlayan Bakı Dövlət Universiteti bu gün inkişaf etmiş ölkələrin ali məktəbləri ilə bir sırada durur. Dünyanın bir neçə ölkəsindən olan gənclərin ali təhsil alması üçün Bakı Dövlət Universitetinə gəlmələri bu təhsil ocağının şərəf və şöhrətini daim ucaldır.

Nəticə olaraq qeyd edək ki, M.Ə.Rəsulzadənin pedaqoji ideyaları Azərbaycan məktəb və pedaqoji fikir tarixinin qızıl səhifələrini təşkil edir.

**İstifadə edilmiş ədəbiyyat**

1. Rəsulzadə M.Ə. Əsərləri, II cild. Bakı, 2001.

2. Azərbaycan pedaqoji antologiyası. XIX əsr XX əsrin əvvəlləri. Bakı, 2011.

3. Sultanlı V. İstiqlal sevgisi. Bakı, 2014.

4. Hüseynov Ş. Milli haqq və ədalət axtarışında. Bakı, 2004.

5. Fərzəliyeva M. M.Ə.Rəsulzadə və ana dilimiz. Bakı: Təhsil, 2003.

6. Rəsulzadə M.Ə. "Balalara hədiyyə". // "İqbal" qəzeti, 19 oktyabr, 1914.

7. Rəsulzadə M.Ə. Məktəb və mədrəsə. // "Açıq söz" qəzeti, 1916, nömrə 138.

**Г.Ахмедов**

**Педагогические идеи в творчестве Мамед Эмина Расулзаде**

**Резюме**

Статья посвящена у 130-летию со дня рождения видного государственного деятеля М.Э.Расулзаде. Анализируется и оценивается его деятельность в области развития народного просвещения в Азербайджане в начале XX века.

**H.Ahmadov**

**Pedagogical ideas in Mammad Amin Rasulzadeh's literary activity**

**Summary**

The article is dedicated to the well-known public figure M.A.Rasulzadeh's 130$^{th}$ anniversary. The information is given about his contribution to the enlightenment and development of Azerbaijan education.

***Pedaqoji fikir tariximizdən***

# ANA DİLİ TƏDRİSİ METODİKASININ FORMALAŞMASI TARİXİNƏ BİR NƏZƏR

**Nazilə Yusifova**
***ADPU-nun Azərbaycan dili və onun tədrisi metodikası kafedrasının müəllimi, pedaqogika üzrə fəlsəfə doktoru***

***Açar sözlər:*** *ana dili, tədris metodikası, ibtidai sinif, orfoqrafiya, fonetika, qrammatika, induktiv və deduktiv metod.*

***Ключевые слова:*** *родной язык, методика преподавания, начальная школа, орфография, фонетика, дедукция, индукция.*

***Key words:*** *native language, teaching methodology, primary classes, spelling, phonetics, inductive and deductive methods.*

1958-ci ildə Azərbaycan Dövlət Pedaqoji Universitetində ilk dəfə olaraq "İbtidai təhsilin metodikası və pedaqogikası" adlı yeni fakültə yaradılır. Burada əsas məqsəd ibtidai siniflərdə dərs deyə biləcək mütəxəssislər hazırlamaqdan ibarət idi. Fakültə yaradıldıqdan sonra bunun üçün proqram əsasında dərslik və dərs vəsaitləri yaratmaq problemi də yarandı.

İbtidai siniflərdə ana dili əsas fənn sayıldığından ana dilindən dərs deməyi bacaran mütəxəssis hazırlığında yararlı dərsliyin hazırlanmasının zəruriliyi meydana çıxdı. Həmin zərurəti gerçəkliyə çevirmə vəzifəsini isə professor A.Abdullayev öz üzərinə götürdü və 1962-ci ildə "İbtidai məktəbdə Azərbaycan dilinin tədrisi metodikası" kitabını nəşr etdirdi. İbtidai siniflərdə ana dili təliminin əhəmiyyətini prof. A.Abdullayev bütün ciddiliyi ilə irəli sürür, orta təhsilin müvəffəqiyyətini ibtidai təhsildə ana dili təlimi ilə əlaqələndirirdi. Həmin vəsait ibtidai siniflərdə ana dilinin tədrisi metodikası üzrə bir çox dərslik və dərs vəsaitlərinin hazırlanmasında mənbə rolunu oynamışdır. Həmin dərs vəsaitindəki savad təlimi, oxu təlimi və nitq inkişafı ilə bağlı metodik mülahizələrdən mövcud təlim prosesində də istifadə olunur. Xüsusilə dərs vəsaitindəki müəllim və şagird arasında qarşılıqlı əlaqə metodlarının bir qismi interaktiv təlimdə istifadə olunur. Biliklərin müstəqillik və fəallıq şəraitində mənimsənilməsi, təlimdə problem situasiya yaradaraq praktik nəticələrin əldə olunması və şagirdlərin əldə etdiyi biliklərin əməli həyata tətbiqi A.Abdullayevin tədqiqatlarında xüsusi qeyd edilir ki, yeni təlim metodu kimi məktəblərimizdə geniş tətbiqi tələb edilən interaktiv metodların mahiyyətində həmin ideyalar dayanır.

Müəllif ibtidai siniflərdə ana dili təliminin tərbiyəvi xarakterinə xüsusi diqqət yetirərək təlimin ümumi vəzifələrini aşağıdakı kimi qruplaşdırmışdır:

1) Məktəb, ana dili vasitəsilə bir tərəfdən şagirdin siyasi məfkurə tərbiyəsini qüvvətləndirməli, digər tərəfdən də təbiət və cəmiyyətə aid idrak sahəsini genişləndirib

ona düzgün istiqamət verməli, şagirdin zehnini yeni təsəvvürlər, surət, məfhum və hislərlə zənginləşdirməli və onun şüurunda əldə edilmiş yenilikləri nəqş edib möhkəmləndirməlidir.

2) Məktəb, ana dili vasitəsilə şagirddə olan söz ehtiyatını zənginləşdirməli, ifadələrini islah və təshih etməli, onların miqdarını artırmalı və əldə edilənləri zehində möhkəmləndirməlidir. Bundan başqa, məktəbin qarşısında şagirdin əqli və əxlaqi iqtidarını artıraraq, ona rabitəli nitq, şüurlu surətdə dərk etmək və dərk etdiyini başqasına anlada bilmək kimi bacarıqların verilməsi durmalıdır.

3) Məktəb, ana dili vasitəsilə gələcəkdə öz inkişafını sərbəst halda davam etdirə bilmək üçün şagirdlərdə dərk etmək və mənimsədiklərini anlada bilmək vərdişlərini tərbiyə etməlidir. Onlar ana dilində şifahi və yazılı şəkildə öz fikirlərini ifadə edə bilməlidirlər" (1, s.8).

Kitabın I fəsli "Savad təlimi metodikası" adlanır. Bu fəsildə savad təlimi dövründəki məşğələlərin xüsusiyyətləri, səs təhlil-tərkib üsulu, savad təlimində səs və sözlərin ardıcıl seçilməsi, ifadəli oxu ilə yazının qarşılıqlı əlaqəli surətdə aparılan savad təlimi sistemi, səslər və onların qrafik işarələrinin öyrədilməsi yolları, sözlərin oxunması təlimi, kəsmə əlifba, heca cədvəli üzrə işlər, cümlə və rabitəli mətnin oxunması yolları, əlifbadan sonrakı dövrdə oxu, savad təlimində uşaqlarda qrammatika və orfoqrafiyaya dair ibtidai təsəvvür yaratmaq, savad təlimi dərslərində şagirdlərin nitqini inkişaf etdirmək yolları kimi məsələlər izah edilir, savad təlimindən dərs nümunələri verilir.

Savad təlimində səs və sözlərin ardıcıl seçilməsindən danışan müəllif qeyd edir ki, səslərin öyrənilməsi qaydası onların çətinlik dərəcəsi ilə müəyyənləşdirilir. Yəni səs və hərfin öyrədilməsinin ardıcıllığında Azərbaycan əlifbasındakı hərflərin düzülüş sistemi əsas götürülmür. Səs və onun qrafik işarəsinin öyrədilməsində səsin asan tələffüzü, qrafik işarəsinin asan yazılması, səsin heca və sözün müxtəlif yerlərindən asanlıqla ayrıla bilməsi, heca və sözün əmələ gəlməsindəki çoxluğu, başqa səslərlə qarışa bilməməsi və s. prinsiplər əsas götürülür. A.Abdullayev və onun sələfləri tərəfindən hazırlanan və "Əlifba" kitabının tərtibində rəhbər tutulan həmin prinsip indi də gözlənilir. 50 ildən artıq "Əlifba" kitabının müəllifi olan və kitabın təlim – tərbiyə imkanlarını daim zənginləşdirən Y.Zeynalov da çoxlu yeni prinsiplər tətbiq etməklə həmin prinsipə sadiq qalmışdır.

Kəsmə əlifba ilə aparılacaq işlərdən danışan müəllif yazır: "Uşaqlarda düzgün oxu vərdişi yaratmaq üçün kəsmə əlifbanın böyük rolu vardır. Ona görə hər bir şagird kəsmə əlifba ilə təmin olunmalıdır. Bunu etmək o qədər də çətin deyildir, çünki hər bir əlifba kitabına kəsmə əlifba və kəsmə hecalar əlavə olunur. Müəllim başqa bir yolla da hərəkət edə bilər, o, şagirdlərdə olan bütün kəsmə əlifbaları toplayıb sinif şkafında saxlaya və lazım olduqca hissə-hissə onları şagirdlərə verib məşğələ apara bilər" (1, s.29).

Daha sonra müəllif xəttin normalarından bəhs edir ki, bunlar hazırda mədəni tələblər kimi ümumiləşdirilir. Savad təlimi dövründə yazıya verilən orfoqrafik, gigiyenik, kalliqrafik və rabitəlilik tələblərindən danışan prof. A.Abdullayev XX əsrin 60-cı illərinin təlim prosesinə uyğun olaraq hərflərin yazılışında müxtəlif hüsnxət növlərindən istifadə məsələlərini də araşdırır. Sonralar yazıda sürətin artırılması üçün bir çox elementar (tük xətlər, alov-dilli xətlər, hərfin altında və üstündə qoyulan işarələr və s.) hüsnxət qaydalarından çıxarıldı. Təbiidir ki, A.Abdullayevin öz dövrü üçün aktual olan elementli yazının öyrədilməsi məsləhət bilinmədi. Savad təlimi dövründə yazıya verilən digər tələblərin məzmunu A.Abdul-

layevin metodikamız üçün müəyyənləşdirdiyi qaydalara uyğundur.

"Yazı və hüsnxət təlimi metodikasının əsas məsələləri" başlığı altında hüsnxət təlimi metodikasının yollarından danışılır. Bunlar genetik və takt yolu, habelə yazının millər üzrə aparılması yolundan ibarətdir. Takt yolundan danışarkən müəllif yazır ki, bu yolun özünəməxsus faydalı cəhətləri və əhəmiyyəti vardır. Bununla belə, takt yolu yazı təlimində yalnız köməkçi rol oynaya bilər. O, yazı təlimi üçün ilk, başlanğıc yol olmaqdan daha çox, şagirdləri sürətli yazıya alışdırır. Təlimin əvvəlində bu yoldan ancaq bəzi hallarda, təxminən, ilin I yarısının sonuna doğru istifadə etmək olar.

III fəsil qiraət metodikasına həsr edilmişdir. Qiraət təliminin məqsəd və vəzifələrindən danışarkən prof. A.Abdullayev təlim prosesində aşağıdakı vəzifələrin həyata keçirilməsini lazım bilir.

Dərslikdə durğu işarələri haqqında (nöqtə, vergül, sual, nida, nöqtəli vergül, iki nöqtə, çox nöqtə, mötərizə, dırnaq işarəsi) praktik məlumat verilir. Qüvvətləndirici sözlərin qiraəti barədə də məlumat çatdırılır. Nəhayət, şeir, nağıl və digər bədii mətnlərin oxusunda spesifik cəhətlərdən danışılır. Oxuya verilən tələblər mətnin növ və janr, pafos (təntənəli, lirik, satirik) və s. xüsusiyyətlərini gözləməyə yönəlmişdir. Məs., lirik şeirin oxusunda istifadə olunan səs tonu elmi-kütləvi mətnlərdə istifadə olunur.

Qiraətin növlərindən danışan müəllif səsli və səssiz qiraətdən, habelə elmi-kütləvi əsərlərin (əməli məqalələrin) qiraətindən bəhs edir.

1. Səssiz qiraətdən danışan müəllif haqlı olaraq yazır: " Səssiz qiraətdə sözlər nə deyilir və nə də başqası tərəfindən eşidilir. Səssiz qiraətdə pıçıltı və ya dodaqları tərpətmək düzgün deyildir. Çünki belə qiraət hər halda səssiz deyil, yarım səsli qiraətə çevriləcəkdir. Səssiz qiraət zamanı dodaqlar hərəkətsiz olmalıdır. Səssiz qiraətin bu xüsusiyyəti qiraətin daha sürətli olmasına imkan verir".

Müəllif səssiz qiraətin mənfi cəhətlərini də göstərdikdən sonra yazır: "Yuxarıda deyilənlərdən bu nəticəyə gəlmək olur ki, şagirdləri həm səsli, həm də səssiz qiraətə alışdırmaq lazımdır.

Birləşdirilmiş (səsli və səssiz) qiraət. Şagirdləri müntəzəm və planlı surətdə səsli və səssiz qiraət təliminə hazırlamaq üçün hər iki qiraətin birləşdirilmiş növündən istifadə edilməlidir. Belə qiraətdə həm səsli, həm də səssiz qiraət növbə ilə davam edir, biri digərini tamamlayır, təkmilləşdirir. Xüsusən ana dili təliminin ilk illərində səsli və səssiz qiraət bir-birini əvəz etməlidir" (1, s. 85).

Qiraət təlimində mətn seçməyin əhəmiyyətini qiymətləndirən müəllif elmi-kütləvi və bədii mətnlərin, habelə qəzet və jurnalların oxunmasına verilən tələblərdən danışır.

"Qiraət texnikasını mənimsəmək üçün istifadə ediləcək metodik yollar"dan danışan müəllif yazır: "Qiraət texnikasını mənimsətmək – şagirdlərdə düzgün, sürətli və bədii qiraət vərdişləri tərbiyə etmək deməkdir. Qiraət texnikasını mənimsətmək üçün istifadə edilən mühüm metodik yollar aşağıdakılardan ibarət olmalıdır:

1) müəllimin nümunəvi qiraəti;

2) düzgün qiraət və səhvləri islah etmək üçün müəllimin verdiyi izahat və göstərişlər, şagirdlərə qiraət qaydasının öyrədilməsi;

3) müəllimin rəhbərliyi ilə şagirdlərin sərbəst qiraət təcrübələri".

IV fəsil "Qrammatika və orfoqrafiya tədrisinin metodikası" adlanır. İbtidai məktəbdə qrammatika və orfoqrafiya təliminin məqsəd və vəzifələrindən danışan müəllif göstərir ki, ibtidai məktəbdə şagirdlərə veriləcək qrammatik bilik sadə xarakter daşımalıdır. Bu qrammatik məlumat həcm etibarilə

elə olmalıdır ki, bir tərəfdən şagirdlərdə düzgün nitq və savadlı yazı vərdişi əmələ gətirsin, digər tərəfdən, onlarda tədricən mücərrəd təfəkkürü inkişaf etdirsin və eyni zamanda, dilin qrammatik quruluşu ilə onları, səthi də olsa, tanış edə bilsin. Bu vəziyyətdə qrammatik məlumatın elmi xarakter daşımasına diqqət yetirilməlidir. Lakin şagirdə qrammatik nəzəriyyəni deyil, onun nəticələrindən nitq inkişafında istifadə etməyi öyrətmək lazımdır. Qrammatik nəzəriyyə nitq inkişafı ilə elə əlaqələndirilməlidir ki, şagirdlərdə linqvistik təfəkkürün formalaşdırılması üçün ilkin bünövrə yaradılsın.

Təsadüfi deyil ki, orfoqrafiyanın qrammatika ilə əlaqəli tədrisi orfoqrafiya təlimində istifadə olunan əsas prinsiplərdən biri kimi səciyyələndirilir. Dilimizin yazı qaydaları xüsusiyyətinə uyğun olaraq linqvistik biliyə yiyələnmək orfoqrafiyanı mənimsətmək üçün əsasdır.

Müəllif qrammatika tədrisinin əsas üsullarından danışarkən, induktiv və deduktiv yoldan istifadəni düzgün hesab edir, lakin burada induktiv və deduktiv yolu üsul adlandırmaq nisbətən dəqiq deyildir. İnduktiv və deduktiv yol, metod, üsul adlandırılması o qədər də ciddi qüsur hesab olunmamalıdır. Bundan başqa, qrammatika təliminin yolları kimi müəllimin izahı, dərsliyin oxunması, qrammatik təhlil, qrammatik çalışmalar evə tapşırıq kimi qeyd edilmişdir. Sonra isə bu yollardan istifadənin formaları göstərilmişdir.

Dərslikdə ibtidai siniflərdə fonetika və qrammatika təliminin məzmununu şərh etdikdən sonra, müəllif qrammatik çalışmalardan geniş istifadə edilməsini, nəzəri məlumatın praktika ilə əlaqələndirilməsi və möhkəmləndirilməsini vacib sayır.

Məlumdur ki, Azərbaycan dili təliminin müvəffəqiyyətini təyin edən əsas cəhətlərdən biri çalışmalar sistemidir. Çalışmalar dərsliyin mühüm hissəsini təşkil edir. Çalışmaları icra etməklə şagirdlər müvafiq dil hadisəsinin mühüm əlamətlərini ayırmağa, dil faktlarını qarşılaşdırmağa, onlar arasında əlaqə yaratmağa, öz nitqlərində linqvistik vasitələri şüurlu surətdə seçməyə, nəzəri bilikləri praktikaya tətbiq etməyə alışırlar. Çalışmaların yerinə yetirilməsi 2 şəkildə – kollektiv və fərdi şəkildə aparıla bilər. Kollektiv çalışma, adətən, əvvəlcə şifahi surətdə aparılır və sonra yazdırılır. Məsələn, müəllim bütün sinfə tapşırıq və ya sual verir. Qarşılıqlı əlaqə nəticəsində cavablar dəqiqləşdirilir. Ən yaxşı cavab müəllimin rəhbərliyi ilə kollektiv tərəfindən redaktə edilib taxtada yazılır və qalan şagirdlər isə onun surətini dəftərlərinə köçürürlər.

Orfoqrafiya təliminin yollarından danışan müəllif çap olunmuş mətni olduğu kimi köçürmək, əlyazması ilə olan mətnlərin üzünü köçürmək, mətnə söz artırmaq, onu genişləndirib üzünü köçürmək kimi iş növlərini vacib hesab edir. Bundan başqa, prof. A.Abdullayev orfoqrafiya təlimində istifadə olunan izahlı, xəbərdarlıqlı, səsli imla, görmə imla, yaradıcı imla, sərbəst imla, seçmə imla, yoxlama imla, əzbərlənmiş mətnin yazılması kimi yazıları izah edir, orfoqrafik lüğətin tərtibi və ondan istifadə yollarını göstərir. Bütün bu iş formalarının aparılması qaydası və təlim əhəmiyyəti şərh edilir. Hazırda orfoqrafiya təlimində bu yazılardan istifadə metodikası A.Abdullayevin şərhlərinə uyğundur.

Bundan sonra müəllif qrammatika və orfoqrafiya məşğələlərində əyani vasitələrdən istifadənin əhəmiyyətindən, məzmunu və tərtibi qaydalarından, orfoqrafik səhvlərin düzəldilməsi yollarından bəhs edir.

V fəsil "Şagirdlərin şifahi və yazılı nitqlərinin inkişafı" adlanır. Burada əvvəlcə nitq üzərində aparılan işlərin əhəmiyyəti, şifahi nitqin yazılı nitqlə əlaqəsi aydınlaşdırılır. Şagirdlərin nitq səhvləri qruplaşdırılır. A.Abdullayev şagirdlərin nitq səhvlərini

aşağıdakı kimi qruplaşdırır.

1) Şagirdlərin şifahi nitqində aşağıdakı qüsurları müşahidə

Qiraətlə əlaqəli aparılan nitq inkişafı məşğələlərinin məzmununa aşağıdakılar daxildir: suallara cavab, plan tutmaq, oxunmuş mətni nağıl etmək, oxunmuş mətndən çıxarışlar etmək, mətni əzbərləmək, mətnə başlıq vermək, hadisələrin yerini dəyişmək və lüğət üzərində iş.

Prof. A.Abdullayev Y.Ş.Kərimovla birlikdə 1968-ci ildə “İbtidai siniflərdə ana dili tədrisinin metodikası” dərsliyinin yeni, təkmil nəşrini hazırlayıb nəşr etdirdi.

Bu dərslikdə I fəsil bütövlükdə ibtidai məktəbdə ana dili tədrisinin tarixinə həsr edilmişdir. Burada mollaxanalardan, mədrəsələrdən, ilk dərsliklərdən, habelə ibtidai məktəbdə Azərbaycan dilinin tədrisi metodikasına aid yazılmış dərs vəsaitlərindən bəhs olunur.

“Savad təlimi metodikası” adlanan II fəsil məzmun etibarilə 1962-ci il dərsliyindən az da olsa fərqlənir. Burada əlifba təlimi dövrünə aid müxtəlif dərs nümunələri verilmişdir. Həmçinin burada kiçik və böyük hərflərin bölgüsü verilmiş, hərfin öyrədildiyi dərsin mərhələləri göstərilmişdir. Bunlar aşağıdakılardır:

1. Yazıya hazırlıq;
2. Giriş müsahibəsi;
3. Hərfin müəllim tərəfindən yazılması;
4. Hərfin elementlərinin müəllim tərəfindən yazdırılması;
5. Hərfin yazılışının möhkəmləndirilməsi;
6. Hərfin şagirdlər tərəfindən yazı taxtasında yazılması;
7. Hərfin şagirdlər tərəfindən dəftərə yazılması;
8. Tərkibində yeni hərf olan sözlərin yazılması;
9. Evə tapşırıq.

Burada, həmçinin hüsnxətdən dərs nümunəsi verilmişdir.

A.Abdullayev və Y.Kərimov tərəfindən yazılmış bu dərslik istər öz dövrü, istərsə də müasir təlim şəraitində ən yararlı praktik əsərdir. Sonralar ana dili tədrisi məsələlərinə aid bir sıra dərslik və dərs vəsaitləri həmin əsər əsasında yazılmış, bəzi mülahizələr eyni ilə təkrar olunmuşdur. Xüsusilə həmin dərs vəsaitində savad təlimi və nitq inkişafı, qiraət təlimi və nitq inkişafı, qrammatika və orfoqrafiya və s. məsələlərinin qoyuluşu və izahına sonrakı müəlliflər cüzi artırmalar etmişlər. Bu vəsait müasir təlim şəraitində də sinif müəllimlərinin praktik ehtiyacını əsasən ödəyə bilir.

“Qrammatika və orfoqrafiya tədrisinin metodikası” adlanan IV fəsildəki yeniliklər, əsasən, aşağıdakılardan ibarətdir. Burada qrammatikanın tədrisi metodikasının elmi əsasları, şagirdlərdə qrammatik məfhumların yaradılması yolları geniş diapozonda təqdim olunmuşdur. Qrammatika təliminin əsas üsullarında da dəqiqləşmələr vardır. Dərslikdə oxuyuruq: “Qrammatika tədrisində, əsasən, induksiya və deduksiyadan istifadə olunur. Məktəb təcrübəsində induksiya və deduksiya, şərti olaraq, təlim üsulu adlansa da, əslində bunlar təlim üsulu deyil. Onlar əqli nəticə prosesini müəyyənləşdirir.

İnduksiya təlim işində istifadə olunan müəyyən bir hökm, qərar və ya nəticədir;

burada fikir xüsusidən ümumiyə, ayrı-ayrı faktlardan ümumiləşdirməyə doğru inkişaf edir.

Deduksiya da tədris işində istifadə olunan müəyyən hökm, qərar və ya nəticədir;

burada induksiyanın əksinə olaraq, əşya haqqında veriləcək yeni bilik və məlumatlar müəyyən sinif üçün nəzərdə tutulmuş fənnə, yaxud öyrədiləcək qayda-qanunlara uyğun şəkildə, ümumidən xüsusiyə, ümumiləşdirmədən ayrı-ayrı faktlara doğru hərəkət

edir.

İnduktiv və ya deduktiv metodun tətbiqi öyrənilən dil hadisəsinin mahiyyətindən, onun spesifikasından, materialın məqsədindən, həmin məsələyə dair şagirdlərin bilik səviyyəsindən, onların yaşından və s. asılıdır.

Deduksiya ilə, yaxud doqmatik yolla, dərs keçərkən müəllim əvvəlcə, qrammatik tərifi söyləyir və onu misallarla izah edir. Gördüyümüz kimi, burada induksiya və deduksiya üsul kimi təqdim olunmuşdur.

Əlbəttə, induksiya və deduksiyaya müəyyən mənada üsul da demək olar, lakin onları yol adlandırmaq daha dəqiqdir.

Bu dərslikdə qrammatik çalışmalar və Azərbaycan dili dərslərində əyanilikdən istifadəyə daha geniş verilmişdir.

Dərs tiplərindən də daha geniş danışılmış və dərs nümunələri əksini tapmışdır.

Qrammatik biliyin hesaba alınması və qiymətləndirilməsi, habelə əsas qrammatik mövzuların tədrisi metodikası tam genişliyi ilə şərh və izah edilmişdir.

Ümumiyyətlə, qrammatika təliminə olduqca geniş yer verilmişdir. Orfoqrafiya təlimində istifadə edilən yazılara kommentarili (izahlı) yazılar, seçmə imla, lüğət üzrə imla, habelə ifadə və inşalar daha geniş əhatə olunmuşdur.

Yazı işlərinin təshihi və səhvlər üzərində işin təşkilinə də daha geniş yer verilmişdir.

"Şagirdlərin şifahi və yazılı nitqinin inkişafı" adlanan V fəsildə lüğət üzrə işlərdən daha geniş danışılmış, lüğət işinin istiqamətləri elə ümumiləşdirilmişdir ki, hazırda bu, heç bir əlavə edilmədən istifadə olunur.

İnamla demək olar ki, prof. A.Abdullayevin "İbtidai məktəbdə Azərbaycan dilinin tədrisi metodikası" kitabı bu gün də öz aktuallığını itirməmişdir.

*Rəyçi: prof. İ.Bayramov*

**İstifadə edilmiş ədəbiyyat**

1. Abdullayev A. İbtidai məktəbdə Azərbaycan dili tədrisinin metodikası. Bakı: Azərtədrisnəşr, 1962.

2. Abdullayev A. İbtidai məktəblərdə qiraət təlimi metodikası. // Azərbaycan dili və ədəbiyyat tədrisi metodikası, 1961, IV bur.

3. Abdullayev A. İbtidai məktəblərdə qrammatika və orfoqrafiyanın tədrisi metodikası. // Azərbaycan dili və ədəbiyyat tədrisi, 1961, II bur.

4. Abdullayev A. İbtidai məktəbdə savad təlimi metodikası. // Azərbaycan məktəbi, 1961, №1.

5. Abdullayev A. İbtidai məktəbdə şagirdlərin şifahi və yazılı nitqinin inkişaf etdirilməsi haqqında. // Azərbaycan məktəbi, 1961, №8.

6. Abdullayev A., Kərimov Y. İbtidai siniflərdə ana dili tədrisinin metodikası. Bakı: Maarif, 1968.

**Н.Юсифова**

**Взгляд на историю формирования учебной методики родного языка**

**Резюме**

В статье говорится о заслугах профессора А.Абдуллаева в области преподавания родного языка в начальных классах.

**N.Yusifova**

**A glance at formation history of native language teaching methodology**

**Summary**

In this article, it is spoken about the formation of motherland's teaching methodology in primary classes by prof. A.Abdullayeva.

***“Azərbaycan məktəbi” – 90***
***(Jurnalımızın arxivindən)***

# “AZƏRBAYCAN MƏKTƏBİ” MƏNƏ NƏ VERDİ

**Əjdər Ağayev**
***pedaqoji elmlər doktoru, professor***

Məmnunam ki, “Azərbaycan məktəbi” jurnalı redaksiyası ilə otuz ildən artıqdır ki, fəal əməkdaşlıq edirəm; hətta ömrümün mühüm bir parçasını, fəaliyyətimin əhəmiyyətli bir hissəsini “Azərbaycan məktəbi”nin inkişafına sərf etmişəm...

Jurnalın baş redaktoru vəzifəsində çalışdığım 1974-1980-ci illərdə xeyli təkmilləşdim, təşkilatçı kimi yetişdim. Jurnal mənə çox şey verdi. Belə ki, əvvələn, məndə idarəçilik və idarəedicilik qabiliyyəti formalaşdırdı. İşgüzarlıq ahəngini daim saz saxlamaq, kollektiv üzvlərinin fərdi iradi xüsusiyyətlərini ictimai maraqlarla uzaqlaşdırmaq, qayğı və hörmətlə yanaşı, vəzifə və peşə tələbkarlığını yüksəltmək, ünsiyyət və davranış mədəniyyətinə, rəhbərlik etikası normalarına əməl etmək, təmkinlilik, səbrlilik və s. kimi idarə başçısına lazım olan bir çox keyfiyyətlərə yiyələnmək və s. o illərin izləridir.

İkincisi, redaksiyada iş prosesində məşhur yaradıcı şəxslərlə, görkəmli alimlərlə, sənətkarlarla, o dövrün partiya və dövlət xadimləri ilə, təsərrüfat və idarə rəhbərləri ilə tanış olmağım və əlaqələr saxlamağım məndə, necə deyərlər, aysberqin üst qatına baxmaqla alt qatına da bələd olmaq, xüsusən də böyük şəxsiyyətlərdə adiliklə mürəkkəbliyin sintez olduğunu görə bilmək həssaslığı formalaşdırdı.

Bu planda maarif naziri akademik Mehdi Mehdizadənin xüsusi yeri olduğunu ayrıca qeyd etmək istərdim. Çünki o böyük insanla demək olar ki, hər gün əlaqə saxlamalı olurdum. Onun müdrikliyi, təhsil sahəsinin bütün problemlərinə dərindən bələdliyi, demokrizmi, yüksək mədəniyyəti, tədqiqatçılıq səriştəliliyi, hər bir qabaqcıl müəllimə, təhsil işçisinə qayğısı və s. mənim üçün bir öyrənc nümunəsi idi.

Bu illərdə akademik Həsən Əliyevlə, maestro Niyazi ilə, o zamankı SSRİ PEA-nın Tərbiyənin Ümumi Problemləri İnstitutunun direktor müavini, məşhur pedaqoq professor İ.Maryenko ilə, görkəmli bəstəkar D.Kobalevski ilə, moskvalı musiqişünas B.Dimentmanla və digər görkəmli alimlərlə redaksiyada görüşlərim, məşhur sovet pedaqoqları M.Skatkin, İ.Lerner, M.Maxmutov, Z.Ravkinlə işgüzar məktublaşmaların, SSRİ-nin və Rusiyanın, o cümlədən Ukrayna, Belorusiya, Tatarıstan, Özbəkistan, Tacikistan, Gürcüstan, Latviya, Litva, Estoniya respublikalarının pedaqoji mətbuat orqanları ilə yaradıcı əməkdaşlığım mənim inkişafımda mühüm rol oynamışdır.

O illərdə Maarif Nazirliyi xətti ilə təlim-tərbiyə işinin təkmilləşdirilməsinə və ya digər təhsil probleminə dair elmi-praktik konfranslar keçirilərdi. Nazir akademik M.Mehdizadənin məruzəsindən sonra mən də çıxış etməli olurdum. Bu tədbirlər məni həm öyrənməyə, həm də öz üzərimdə daha ciddi işləməyə sövq edirdi.

Uzun müddət “Azərbaycan məktəbi” jurnalında baş redaktor işləmiş Rüstəm Hüseynovun çox səmərəli iş üslubu barəsində eşitmişdim. Professor M.Muradxanov mənə məsləhətlər verir və Rüstəm Hüseynovdan öyrənməyi tövsiyə edirdi. Bu yö-

* 7

nümdə öyrənmələr də işimizin uğurlu qurulmasına kömək edirdi.

Güclü redaksiya heyəti yaratmağım da öyrənə-öyrənə təkmilləşməyimizə kömək edirdi. Redaksiya heyətinin üzvlərindən Ədbül Əlizadə elmi məsləhətləri, Sabir Şəfiyev və Sərdar Quliyev təəssübkeşlik qayğıları ilə jurnalın kütləviliyinə nail olmağa çalışırdılar. Birgə səyin nəticəsi idi ki, "Azərbaycan məktəbi" və ona əlavələrdən biri – "İbtidai məktəb və məktəbəqədər tərbiyə" məcmuəsi hərəsi 22.000 tirajla nəşr olunurdu. Pedaqoji-metodik jurnal olan "Azərbaycan məktəbi" və ona əlavə nəşr edilən məcmuələrin hər nömrəsi müəllimlərin, təhsil işçilərinin gündəlik istifadə etdiyi vəsaitə çevrilmişdi. Jurnalın 1977-ci ildə 50 illik yubileyi keçirilərkən, bu barədə ətraflı bəhs edildi, jurnal o zaman Azərbaycan SSR Ali Sovetinin Fəxri Fərmanına layiq görüldü.

Redaksiyaya daxil olan sanballı məqalələrdən də çox şey əxz edirdim. Bütün əlyazmalarını ilk dəfə özüm oxuyurdum, sonra müvafiq şöbə redaktorlarına göndərirdim. İşlənib çap üçün hazırlanmış bütün materialları nəşrə göndərərkən bir daha oxuyurdum. Nəhayət, jurnal nömrəsinin siqnal nüsxəsini alanda da məqalələrin necə çap olunduğunu diqqətlə nəzərdən keçirir, bir çoxunu oxuyurdum. Redaksiyaya sifarişlə və ya sifarişsiz daxil olan məqalələri oxumaq mənim bilik dairəmi xeyli genişləndirirdi. Eyni zamanda daimi yazan müəlliflərin üslubuna, yazmaq texnikasına bələdləşirdim. Mən hər kəsin üslubunu saxlamaq tərəfdarı idim, yazıları işləyib şablon üsluba, təhkiyə tərzinə salmağa meyil göstərmirdim. Lakin elmiliyə, məntiqliyə, ümumiləşdirməçiliyə üstünlük verirdim. Hansı müəllifin necə yazdığını illər keçdikcə daha dəqiq müəyyənləşdirməyə başladım. Müəlliflərin bəzilərinin yazı sirrini bilsəm də, bu barədə heç kəsə indiyə qədər bir kəlmə deməməyimi də jurnalist etikasına xas cəhət sayıram.

Etiraf edim ki, yaza-yaza, işləyə-işləyə özümün də, necə deyərlər, qələmim itiləşir, püxtələşir, əsl jurnalist sənətkarlığına yiyələnirdim. Azərbaycan Jurnalistlər Birliyinin üzvü olmağım, jurnalistlərin qurultaylarına nümayəndə seçilməyim, bəzi ədəbi qələbələr o illərdə əldə etdiyim nailiyyətlərdir.

"Azərbaycan məktəbi" jurnalına əlavə nəşr edilən məcmuələr vaxtımı xeyli alırdı. Baş redaktor kimi bütün redaksiya fəaliyyətinə cavabdeh olmağım fənlərin tədrisi metodikaları üzrə buraxılan məcmuələrin də istər poliqrafik, jurnalistik, istərsə də metodik səviyyələrinin artırılması ilə məşğul olmağımı tələb edirdi.

Bütün bunlar mənim nəşriyyat-poliqrafiya işlərini öyrənməyimə səbəb oldu. Redaksiyaya yeni əməkdaşlar seçərkən onların mətbəə işlərini bilmələrini, korrektə, texniki redaktə bacarıqlarını nəzərə alırdım. Yaxud redaksiyaya işə göndərilən ali təhsilli jurnalistin bir neçə aylıq ilk işini korrektə və texniki redaktədən başlayırdım. Təcrübə göstərirdi ki, bu cür yanaşma jurnalistlərin redaksiya işçisi kimi daha yaxşı fəaliyyət göstərmələrinə təkan verir.

Redaksiyada kadrların inkişafına xüsusi səy göstərirdim. Çalışırdım ki, öz seçimim olsun. Adətən, o zamanlar boşalan yerlərə kimləri götürməkdə "yuxarılar" diktədən istifadə edirdilər. Mən nazir M.Mehdizadənin dəstəyi ilə məsələni operativ həll edib, "boş yer" məlumatının yayılmasına imkan vermirdim. Məsələn, bir dəfə boşalmış baş redaktor müavini vəzifəsinə məsul katib Tahir Əliyevi, məsul katib vəzifəsinə şöbə redaktoru Məhəmməd Baharlını, onun yerinə isə əməkdaş Yusif Əliyevi təqdim edib, bu məsələni operativ həll etməklə mənə kənardan olan təzyiqləri aşıra bildim. Bu gün T.Əliyev, M.Baharlı, Y.Əliyevlə işlədiyim o illəri məmnunluqla xatırlayıram. Həm də şadam ki, öz istedadları və zəhmətkeş olmaları ilə tanınan, xüsusilə də halallığa ta-

pınan həmin jurnalistlərin inkişafında, geniş yaradıcı fəaliyyət imkanı əldə etmələrində az-çox əməyim olmuşdur.

Jurnalın hər sayında bu adamların gərgin zəhməti, işıqlı fikirləri, yaradıcılıq dünyasının bir parçası həkk olunub, redaksiya onların hesabına əsl yaradıcılıq laboratoriyasına çevrilmişdi. Respublikanın görkəmli pedaqoq, filosof, psixoloq, metodist alimləri, təhsili idarəetmə rəhbərləri, qabaqcıl müəllimlər, tərbiyəçilər məzmunlu məqalələrlə jurnal və məcmuələrin səhifələrində çıxış edirdilər.

Çalışırdıq ki, fəaliyyətimizdə jurnalist cəsarəti, ayıqlığı, peşəkarlığı, operativliyi, təsirliliyi baş prinsiplərə çevrilsin. Baxmayaraq ki, o zamanlar vəzifə daşıyan adamlarda öz istəyini, öz səsini içinə salmaq, “əngəli çıxar” - deyə təşəbbüslərə meyil göstərməmək, bir sözlə, faydalı özünəməxsusluğa görə “yuxarılardan” çəkinmək meyili vardı. Bu da təsadüfi deyildi. Həqiqətən, Moskva tükü-tükdən seçib milli təşəbbüslərə tənqidi-cəzalandırıcı münasibət bildirirdi. Belə bir şəraitdə mən “Azərbaycan məktəbi” jurnalının üstünə yazılan “1925-ci ildən çıxır” ifadəsini “1924-cü ildən çıxır” ifadəsi ilə əvəz etdim. Çünki həqiqətən də, pedaqoji jurnalın sovet hakimiyyəti illərində ardıcıl nəşri 1924-cü ildə “Yeni məktəb”in meydana çıxması ilə başlanmışdı. Bu həqiqət arxiv sənədləri ilə, hətta Moskvada nəşr olunmuş “Pedaqoqiçeskaya ensiklopediya”da gedən materiallarla təsdiq olunurdu. Mənə deyirdilər ki, Moskva buna icazə verməyəcək, “cavab verməli olacaqsan”. Belə əlamət, doğurdan da meydana çıxdı. Moskvadan xüsusi məktub gəldi və orada tələb olunurdu ki, biz hansı əsasla jurnalın nəşr tarixini bir il irəli çəkmişik? Mən arxiv sənədlərinə də çoxdan nəşr olunmuş soraq-məlumat kitablarına istinad edərək pedaqoji jurnalın fasiləsiz nəşr tarixini “Yeni məktəbi”n ilk nömrəsinin nəşri ilə əlaqələndirdim və bu tarixin 1924-cü il olduğunu təsdiqlədim. Görünür ki, opponentləri inandıra bilmişdim, ona görə də heç bir sorğu-sual qarşısında qalmadım.

Sonralar düşündüm ki, belə bir işi görməyimə görürdüm, gərək pedaqoji jurnalımızın nəşr tarixini 1906-cı ildən götürəydim. Çünki 1906-cı ildə nəşrə başlayan “Dəbistan” jurnalı əsasən məktəblilər üçün nəzərdə tutulsa da, ciddi pedaqoji mahiyyət daşıyırdı. Bu işi azacıq fasilədən sonra “Məktəb” jurnalı (1911) davam etdirib. 1920-1922-ci illərdə fasilələrlə bir və ya bir neçə nömrə işıq üzü görməklə müxtəlif adlı pedaqoji mahiyyətli jurnallar nəşr olunub. 1924-cü ildən isə irəlidə qeyd etdiyim kimi “Yeni məktəb”lə nəşrə başlayan pedaqoji mətbuatın orqanı müxtəlif adlarla müntəzəm nəşr olunub. Deməli, Azərbaycanda pedaqoji jurnalın nəşr tarixinin 1906-cı ildən başlandığını əsas götürmək daha düzgün olardı.

Jurnalın baş redaktoru olduğum illərdə səmərəli işlərimizdən biri də “Azərbaycan məktəbi”nin əlavəsi kimi “Məktəbdə bədən tərbiyəsi” məcmuəsinin nəşrinə başladığımız oldu. Hökumətin bu barədə xüsusi qərarı vardı. Amma işi biz görməli idik. Məcmuə ildə 6 olmaqla hərəsi 3,0 çap vərəqi həcmində nəzərdə tutulmuşdu. Xüsusi redaktorun müəyyənləşdirilməsi problemə çevrildi. Fiziki tərbiyə, bədən tərbiyəsi və idman üzrə ixtisas hazırlıqlı, jurnalist bacarıqlı, necə deyərlər, iti qələmli, redaktə qabiliyyətli kadr tapmaq birdən-birə mümkün olmadı. Bu məcmuənin də redaktəsini özüm öhdəmə götürdüm. Amma pedaqoji elmlər namizədləri, idman ustaları Baloğlan Quliyev, Hidayət Məmmədov, bədən tərbiyəsi metodisti Fikrət İsmayılov və digər mütəxəssislər mənə yaxından kömək göstərirdilər.

1976-cı ildən nəşrə başlayan məcmuə çox böyük kütləvilik qazandı. Məcmuə təkcə məzmunca deyil, poliqrafik və estetik baxımdan da diqqəti cəlb edirdi. Fotoqraf-

lardan Vahid və Əli məktəblərdə, klublarda, meydançalarda oyun zamanı baş verən ən incə hərəkət və fəndləri, məşhur idmançıların qələbə anını əks etdirən şəkillərlə məcmuənin baxımlılığını daha da artırırdılar. 1978-ci ildə isə məcmuənin redaktəsini eyni zamanda bədən tərbiyəsi ixtisaslı Tahir Əliyevə həvalə etdim...

Çalışırdıq ki, "Azərbaycan məktəbi" jurnalı Maarif Nazirliyinin mətbuat orqanı olmaqla yanaşı, elmi-metodik mərkəzə çevrilsin. Biz buna nail olmuşduq. Nazir akademik M.Mehdizadə özü işimizin bu istiqamətinə kömək edirdi.

Müəlliflərin püxtələşməsində, elmi kadrların yetişməsində az-çox göstərdiyimiz köməkdən bu gün iftixar hissi keçirirəm. Çünki onların hər biri artıq öz dəst-xətti, yaradıcılığı ilə tanınan şəxslərdir. Bu qəbildən adı təkcə Azərbaycanda deyil, keçmiş İttifaqda tanınan müəllim Natiq Səfiyevi, dünyasını vaxtsız dəyişmiş alim Hacı Muxtarovu, tanınmış dilçi alim Aydın Paşanı, görkəmli germanist Fəxrəddin Veysəlovu, görkəmli dilçi alim və ictimai xadim Nizami Xudiyevi yaxşı xatırlayıram. İnkişaflarında mətbu xidmətim olan bütün adamların hamısı mənim üçün çox əzizdirlər.

Yeri gəlmişkən qeyd edim ki, artıq mənim üçün xatirəyə dönmüş 70-ci illərdə Maarif Nazirliyinin aparat işçiləri, nazirlik tabeliyində olan institut, idarə əməkdaşları da "Azərbaycan məktəbi" ilə sıx əlaqə saxlayırdılar. Zəhra xanım Əliyeva, Nəcəf Nəcəfov, Nəriman Abdullayev, Süleyman Mirzəliyev, Əyyub İmaməliyev kimi nazirlikdə müxtəlif vəzifə daşıyan mütəxəssislər dəyərli məqalələri ilə müəllimlərə, təhsil işçilərinə istiqamətverici və öyrədici köməklik göstərirdilər. Bu baxımdan, o zamankı Azərbaycan KP MK-nın elm və tədris müəssisələri şöbəsinin məsul işçisi Əlimirzə Əhmədovun xidmətləri unudulmazdır.

Baş redaktorluq fəaliyyətimdə Azərbaycan elmi pedaqogikasını formalaşdıran nəsillərin varisliyinin şahidi olduğum üçün taleyimdən çox razıyam. O illərin yaşlı və gənc alimlərinin yaradıcılıq kreslosunu yaxından duymuş və onlarla əməkdaşlıq fəaliyyəti göstərmişəm. Azərbaycan pedaqoji elmini ilhamla, gərgin axtarışlarla yaradanları yaxından görə bilmişəm. İndi o illərə nəzər salanda bu mənzərə daha aydın görünür. Kimdir onlar? Yaşlı nəsil - Əhməd Seyidov, Mehdi Mehdizadə, Mərdan Muradxanov; orta nəsil - Əliheydər Həşimov, Əkbər Bayramov, Nurəddin Kazımov, Hüseyn Əhmədov, Əbdül Əlizadə, Yusif Talıbov, Əziz Əfəndizadə, Yəhya Kərimov, Bəşir Əhmədov; gənc nəsil – İbrahim Mollayev, Hadı Rəfibəyli, Zahid Qaralov, bu sətrlərin müəllifi, Fikrət Seyidov, Allahverdi Eminov, Sabir Şəfiyev, Sərdar Quliyev, Rəfiqə Mustafayeva, Xəlil Fətəliyev, Sultansəlim Axundov, Məcid İsmixanov və b...

Mən baş redaktorluq fəaliyyətimə başlarkən redaksiyada sağlam olmayan "abhava" vardı. Maarif Nazirliyinin Kollegiyası redaksiyadakı vəziyyəti, jurnal səhifələrinə çıxmış məqalələrin müzakirəsini keçirib qərar qəbul etmişdi ki, baş redaktor Əkbər Mirzəyev, şöbə redaktorları Nağı İsmayılzadə və Əmiraslan Rəcəbov işdən xaric edilsin. Redaksiyada kadrlarla işin normal səviyyəyə qaldırılması yeni baş redaktora, yəni mənə həvalə edilmişdi.

Bəşir Əhmədovla Nurəddin Kazımov heç cür ipə-sapa yatmayıb, bir-birinə mətbuatda hücum edirdilər. Açığını deyim ki, B.Əhmədov daha güclü "hücumda" idi. Birinci qətiyyətli addımım bu yersiz mübahisəni aradan qaldırmaq oldu. Necə etdim? B.Əhmədovun məqalələrinin üstünə baş redaktor dərkənarı yazıb, qeyd etdim ki, bu yazıların heç bir elmi, metodiki əhəmiyyəti yoxdur, istinad olunan müəlliflər moskvalı alimlərdir, müəllif lazım bilirsə, "Sovetskaya pedaqogika" səhifələrinə çıxsın. Belə-

liklə, "Azərbaycan məktəbi" səhifələrinə xoş, əhəmiyyətli, işıqlı, dərin elmi məqalələr üçün açıq elan edildi. B.Əhmədov o zamankı "Kommunist" qəzetində jurnalda gedən bir tərcümə materialının yararsız tərcümə edildiyini, çoxlu səhvlərə yol verildiyini sübut edən bir tənqidi yazı ilə çıxış etdi və jurnaldakı yazını "təshihindən" nəticə çıxararaq ona bir dil metodisti kimi "2" qiymət verdiyini yazdı. Mən bu məsələyə səbr və təmkinlə yanaşdım. Hələ görüləsi çox işlərim vardı. Təbii ki, hamı kimi mənim də istəyənim və istəməyənimin olması labüd idi. Çılğınlıq göstərməyi lazım bilmədim. Bir vərəqəlik məlumatla "Kommunist" qəzetinin baş redaktoru A.Rzayevə bildirdim ki, həmin materialın tərcümə müəllifi işdən çıxarılmış keçmiş baş redaktordur, yazı mətbəəyə də mən işə başlamazdan əvvəl göndərilib. Bundan sonra belə səhvlər olmayacaq.

Bəşir Əhmədova da rəğbətli münasibətimi dəyişmədim. Onun gərəkli məqalələrini, açdığı müzakirələri, diskussiyaları rəğbətlə qarşıladım.

Jurnala rəhbərlik etdiyim dövrdə bəzi ziddiyyətli hallarla rastlaşsam da, səbr, təmkin, soyuqqanlılıq, insanlara inam və etibar, səmimi münasibət, kin saxlamamaq, qayğıkeşliyi əskiltməmək hesabına bu hallardan əzabsız çıxmış, mövqeyimi həmişə qoruya bilmişəm. Redaksiya bu baxımdan da məni yetkinləşdirdi. İnsanları - sözübütöv, mərd olanları, həqiqi və yalançı səmimiyyətliləri və s. gördüm və xeyli təcrübə qazandım. O zaman maarif nazirinin müavini işləyən mərhum Əfsun Əfəndiyevi, nazirin birinci müavini vəzifəsində çalışan Rəfiqə Hüseynovanı mərd, birsifətli, ədalətli insanlar kimi ömrüm boyu xatırlayacağam.

"Azərbaycan məktəbi"nin mənim rəhbərliyimlə dirçəlişində öz qayğısı və məsləhətlərini heç vaxt əsirgəməyən mərhum Şahin Səfərovu bu əlamətdar gündə xüsusi yad etmək istərdim. O, "Azərbaycan müəllimi" qəzetinin redaktoru idi. Tanınmış jurnalist, maarifçi və elm xadimi kimi böyük nüfuzu vardı. 1980-ci ildə baş redaktorluqdan getməyim haqqında yeni nazir E.Qafarova qarşısında məsələ qaldırdığımı eşidəndə öz narazılığını bildirdi. MK-dan Əlimirzə Əhmədov da zəng edib, - get ərizəni geri götür, - dedi. Rəhbərlik etdiyim kollektivdə bu məsələnin nə qədər təəssüflə qarşılandığını hiss etdim.

...1981-ci il yanvarın 2-də Zəhra xanım Əliyevanı redaksiyada baş redaktor kimi kollektivə təqdim edib, doğma yerim Azərbaycan ETPEİ-yə qayıtdım. Lakin bu günə qədər "Azərbaycan məktəbi"ndəki baş redaktor işləyərkən tutduğum fəal mövqeyimdən ayrılmamışam. Bu isə Zəhra xanım Əliyevanın xidmətidir. O, 18 il əvvəl məndən redaksiyanın sənədlərini qəbul edərkən dedi: "Yaddan çıxarmayın ki, Siz burada həmişə hörmət və ehtiramla qarşılanacaqsınız, biz həmişə Sizinlə birlikdə işləyəcəyik". Cəsarətliliyi, işgüzarlığı, təşkilatçılığı, sözübütövlüyü ilə tanınan Zəhra xanımın bu sözləri xoşa gəlmək üçün deyilməmişdi. 18 ildən artıqdır ki, mən Zəhra xanımın rəhbərlik etdiyi redaksiya heyətinin üzvüyəm, redaksiyanın bütün işlərinin öncülləri sırasındayam. Pedaqogika, tərbiyə nəzəriyyəsi, şəxsiyyətin tərbiyə, təhsil quruculuğu və d. problemlərə aid məqalələrim ardıcıl dərc olunur. Müzakirələrin, "dəyirmi stol" söhbətlərinin keçirilməsində iştirak edir, bəzən bunları özüm təşkil edirəm. Vaxtilə "Azərbaycan məktəbi" redaksiyasında işlərkən əxz etdiyim yaradıcılıq keyfiyyətləri, indi mənə doğma jurnala xidmətdə yardımçı olur...

Ömrümün ən qaynar illərini sərf etdiyim "Azərbaycan məktəbi"nin 75 illik yubileyi mənim üçün sonsuz dərəcədə doğma və əzizdir. Onu bağrıma basıb təbrik edir, jurnal üçün zəhmət çəkənlərə uzun ömür arzulayıram...

**Azərbaycan məktəbi, 1999, № 6**

# 2014-2015-ci dərs ili üçün ümumtəhsil məktəblərinin tədris planları

## 2014-2015-ci dərs ilində ümumtəhsil məktəblərinin I-VII sinifləri üçün tədris planı (tədris Azərbaycan dilində)

| № | Fənnin adı | Siniflər üzrə həftəlik dərs saatlarının miqdarı | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|
| | | I | II | III | IV | V | VI | VII |
| 1 | Azərbaycan dili | 9 | 10 | 10 | 10 | 5 | 4 | 4 |
| 2 | Ədəbiyyat | | | | | 2 | 2 | 2 |
| 3 | Xarici dil | 1 | 1 | 1 | 1 | 3 | 3 | 3 |
| 4 | İkinci xarici dil | | | | | 1 | 1 | 1 |
| 5 | Riyaziyyat | 4 | 4 | 4 | 4 | 5 | 5 | 5 |
| 6 | İnformatika | 1 | 1 | 1 | 1 | 1 | 1 | 1 |
| 7 | Azərbaycan tarixi | | | | | 2 | 1 | 1 |
| 8 | Ümumi tarix | | | | | | 1 | 1 |
| 9 | Fizika | | | | | | 1 | 2 |
| 10 | Kimya | | | | | | | 1 |
| 11 | Biologiya | | | | | | 2 | 2 |
| 12 | Coğrafiya | | | | | | 2 | 2 |
| 13 | Həyat bilgisi | 1 | 1 | 2 | 2 | 1 | 1 | 1 |
| 14 | Texnologiya | 1 | 1 | 2 | 2 | 1 | 1 | 1 |
| 15 | Fiziki tərbiyə | 2 | 2 | 2 | 2 | 2 | 2 | 2 |
| 16 | Təsviri incəsənət | 1 | 1 | 1 | 1 | 1 | 1 | 1 |
| 17 | Musiqi | 1 | 1 | 1 | 1 | 1 | 1 | 1 |
| **Cəmi:** | | **21** | **22** | **24** | **24** | **25** | **29** | **31** |
| Dərsdənkənar məşğələlər | | 2 | 2 | 2 | 2 | 3 | 3 | 3 |
| **Yekun:** | | **23** | **24** | **26** | **26** | **28** | **32** | **34** |

## 2014-2015-ci dərs ilində ümumtəhsil məktəblərinin I-VII sinifləri üçün tədris planı (tədris rus dilində)

| № | Fənnin adı | Siniflər üzrə həftəlik dərs saatlarının miqdarı | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|
| | | I | II | III | IV | V | VI | VII |
| 1 | Rus dili | 9 | 10 | 10 | 10 | 5 | 4 | 4 |
| 2 | Ədəbiyyat | | | | | 2 | 2 | 2 |
| 3 | Azərbaycan dili (dövlət dili kimi) | 2 | 2 | 2 | 2 | 2 | 2 | 2 |
| 4 | Xarici dil | 1 | 1 | 1 | 1 | 3 | 3 | 3 |
| 5 | İkinci xarici dil | | | | | 1 | 1 | 1 |
| 6 | Riyaziyyat | 4 | 4 | 4 | 4 | 5 | 5 | 5 |
| 7 | İnformatika | 1 | 1 | 1 | 1 | 1 | 1 | 1 |
| 8 | Azərbaycan tarixi | | | | | 2 | 1 | 1 |
| 9 | Ümumi tarix | | | | | | 1 | 1 |
| 10 | Fizika | | | | | | 1 | 2 |
| 11 | Kimya | | | | | | | 1 |
| 12 | Biologiya | | | | | | 2 | 2 |
| 13 | Coğrafiya | | | | | | 2 | 2 |
| 14 | Həyat bilgisi | 1 | 1 | 2 | 2 | 1 | 1 | 1 |
| 15 | Texnologiya | 1 | 1 | 2 | 2 | 1 | 1 | 1 |
| 16 | Fiziki tərbiyə | 2 | 2 | 2 | 2 | 2 | 2 | 2 |
| 17 | Təsviri incəsənət | 1 | 1 | 1 | 1 | 1 | 1 | 1 |
| 18 | Musiqi | 1 | 1 | 1 | 1 | 1 | 1 | 1 |
| **Cəmi:** | | **23** | **24** | **26** | **26** | **27** | **31** | **33** |
| Dərsdənkənar məşğələlər | | 2 | 2 | 2 | 2 | 3 | 3 | 3 |
| **Yekun:** | | **25** | **26** | **28** | **28** | **30** | **34** | **36** |

**2014-2015-ci dərs ilində ümumtəhsil məktəblərinin I-VII sinifləri üçün tədris planı**

**(tədris gürcü dilində)**

| № | Fənnin adı | Siniflər üzrə həftəlik dərs saatlarının miqdarı | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|
| | | I | II | III | IV | V | VI | VII |
| 1 | Gürcü dili | 9 | 10 | 10 | 10 | 5 | 4 | 4 |
| 2 | Ədəbiyyat | | | | | 2 | 2 | 2 |
| 3 | Azərbaycan dili (dövlət dili kimi) | 2 | 2 | 2 | 2 | 2 | 2 | 2 |
| 4 | Xarici dil | 1 | 1 | 1 | 1 | 3 | 3 | 3 |
| 5 | İkinci xarici dil | | | | | 1 | 1 | 1 |
| 6 | Riyaziyyat | 4 | 4 | 4 | 4 | 5 | 5 | 5 |
| 7 | İnformatika | 1 | 1 | 1 | 1 | 1 | 1 | 1 |
| 8 | Azərbaycan tarixi | | | | | 2 | 1 | 1 |
| 9 | Ümumi tarix | | | | | | 1 | 1 |
| 10 | Fizika | | | | | | 1 | 2 |
| 11 | Kimya | | | | | | | 1 |
| 12 | Biologiya | | | | | | 2 | 2 |
| 13 | Coğrafiya | | | | | | 2 | 2 |
| 14 | Həyat bilgisi | 1 | 1 | 2 | 2 | 1 | 1 | 1 |
| 15 | Texnologiya | 1 | 1 | 2 | 2 | 1 | 1 | 1 |
| 16 | Fiziki tərbiyə | 2 | 2 | 2 | 2 | 2 | 2 | 2 |
| 17 | Təsviri incəsənət | 1 | 1 | 1 | 1 | 1 | 1 | 1 |
| 18 | Musiqi | 1 | 1 | 1 | 1 | 1 | 1 | 1 |
| **Cəmi:** | | **23** | **24** | **26** | **26** | **27** | **31** | **33** |
| Dərsdənkənar məşğələlər | | 2 | 2 | 2 | 2 | 3 | 3 | 3 |
| **Yekun:** | | **25** | **26** | **28** | **28** | **30** | **34** | **36** |

**2014-2015-ci dərs ilində ləzgi dili öyrədilən ümumtəhsil məktəblərinin I-VII sinifləri üçün tədris planı**

**(tədris Azərbaycan dilində)**

| № | Fənnin adı | Siniflər üzrə həftəlik dərs saatlarının miqdarı | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|
| | | I | II | III | IV | V | VI | VII |
| 1 | Azərbaycan dili | 7 | 8 | 8 | 8 | 4 | 3 | 3 |
| 2 | Ədəbiyyat | | | | | 2 | 2 | 2 |
| 3 | Ləzgi dili | 2 | 2 | 2 | 2 | 2 | 2 | 2 |
| 4 | Xarici dil | 1 | 1 | 1 | 1 | 2 | 2 | 2 |
| 5 | İkinci xarici dil | | | | | 1 | 1 | 1 |
| 6 | Riyaziyyat | 4 | 4 | 4 | 4 | 5 | 5 | 5 |
| 7 | İnformatika | 1 | 1 | 1 | 1 | 1 | 1 | 1 |
| 8 | Azərbaycan tarixi | | | | | 2 | 1 | 1 |
| 9 | Ümumi tarix | | | | | | 1 | 1 |
| 10 | Fizika | | | | | | 1 | 2 |
| 11 | Kimya | | | | | | | 1 |
| 12 | Biologiya | | | | | | 2 | 2 |
| 13 | Coğrafiya | | | | | | 2 | 2 |
| 14 | Həyat bilgisi | 1 | 1 | 2 | 2 | 1 | 1 | 1 |
| 15 | Texnologiya | 1 | 1 | 2 | 2 | 1 | 1 | 1 |
| 16 | Fiziki tərbiyə | 2 | 2 | 2 | 2 | 2 | 2 | 2 |
| 17 | Təsviri incəsənət | 1 | 1 | 1 | 1 | 1 | 1 | 1 |
| 18 | Musiqi | 1 | 1 | 1 | 1 | 1 | 1 | 1 |
| **Cəmi:** | | **21** | **22** | **24** | **24** | **25** | **29** | **31** |
| Dərsdənkənar məşğələlər | | 2 | 2 | 2 | 2 | 3 | 3 | 3 |
| **Yekun:** | | **23** | **24** | **26** | **26** | **28** | **32** | **34** |

**2014-2015-ci dərs ilində ləzgi dili öyrədilən ümumtəhsil məktəblərinin I-VII sinifləri üçün tədris planı (tədris rus dilində)**

| № | Fənnin adı | Siniflər üzrə həftəlik dərs saatlarının miqdarı | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|
| | | I | II | III | IV | V | VI | VII |
| 1 | Rus dili | 7 | 8 | 8 | 8 | 4 | 3 | 3 |
| 2 | Ədəbiyyat | | | | | 2 | 2 | 2 |
| 3 | Azərbaycan dili (dövlət dili kimi) | 2 | 2 | 2 | 2 | 2 | 2 | 2 |
| 4 | Ləzgi dili | 2 | 2 | 2 | 2 | 2 | 2 | 2 |
| 5 | Xarici dil | 1 | 1 | 1 | 1 | 2 | 2 | 2 |
| 6 | İkinci xarici dil | | | | | 1 | 1 | 1 |
| 7 | Riyaziyyat | 4 | 4 | 4 | 4 | 5 | 5 | 5 |
| 8 | İnformatika | 1 | 1 | 1 | 1 | 1 | 1 | 1 |
| 9 | Azərbaycan tarixi | | | | | 2 | 1 | 1 |
| 10 | Ümumi tarix | | | | | | 1 | 1 |
| 11 | Fizika | | | | | | 1 | 2 |
| 12 | Kimya | | | | | | | 1 |
| 13 | Biologiya | | | | | | 2 | 2 |
| 14 | Coğrafiya | | | | | | 2 | 2 |
| 15 | Həyat bilgisi | 1 | 1 | 2 | 2 | 1 | 1 | 1 |
| 16 | Texnologiya | 1 | 1 | 2 | 2 | 1 | 1 | 1 |
| 17 | Fiziki tərbiyə | 2 | 2 | 2 | 2 | 2 | 2 | 2 |
| 18 | Təsviri incəsənət | 1 | 1 | 1 | 1 | 1 | 1 | 1 |
| 19 | Musiqi | 1 | 1 | 1 | 1 | 1 | 1 | 1 |
| **Cəmi:** | | **23** | **24** | **26** | **26** | **27** | **31** | **33** |
| Dərsdənkənar məşğələlər | | 2 | 2 | 2 | 2 | 3 | 3 | 3 |
| **Yekun:** | | **25** | **26** | **28** | **28** | **30** | **34** | **36** |

**2014-2015-ci dərs ilində ümumtəhsil məktəblərinin VIII-XI sinifləri üçün tədris planı (tədris Azərbaycan dilində)**

| № | Təhsil sahələri | Siniflər üzrə həftəlik saatların miqdarı | | | |
|---|---|---|---|---|---|
| | | VIII | IX | X | XI |
| 1. | **Dillər və ədəbiyyat** | | | | |
| | Azərbaycan dili | 3 | 2 | 2 | 2 |
| | Ədəbiyyat | 2 | 3 | 3 | 2 |
| | Xarici dil | 3 | 2 | 2 | 2 |
| 2. | **Riyaziyyat və informatika** | | | | |
| | Cəbr | 3 | 3 | | |
| | Cəbr və analizin başlanğıcı | | | 2 | 2 |
| | Həndəsə | 2 | 2 | 1 | 1 |
| | İnformatika | | | 1 | 1 |
| 3. | **İctimai fənlər** | | | | |
| | Tarix | 1 | 1 | 1 | 1 |
| | Azərbaycan tarixi | 2/1 | 2 | 2 | 2 |
| | İnsan və cəmiyyət | 1 | 1 | 1 | 1 |
| | İqtisadi və sosial coğrafiya | 0/1 | 2 | | |
| | Azərbaycan Respublikasının Konstitusiyası | | 1 | | |
| | İqtisadiyyatın əsasları | | 1 | 1 | 1 |
| 4. | **Təbiət fənləri** | | | | |
| | Fizika | 2 | 3 | 2 | 2 |
| | Astronomiya | | | | 1 |
| | Kimya | 2 | 2 | 2 | 2 |
| | Biologiya | 2 | 2 | 2 | 1 |
| | Fiziki coğrafiya | 1 | | 1 | 2 |

| | | | | | |
|---|---|---|---|---|---|
| 5. | **Əmək hazırlığı və texnologiya** | | | | |
| | Əmək hazırlığı | 1 | | | |
| | Rəsmxət | 1 | 1 | | |
| 6. | **Fiziki tərbiyə və gənclərin çağırışaqədərki hazırlığı** | | | | |
| | Fiziki tərbiyə | 2 | 2 | 2 | 2 |
| | Gənclərin çağırışaqədərki hazırlığı | | | 2 | 2 |
| 7. | **İncəsənət** | | | | |
| | Təsviri incəsənət | | | | |
| | Musiqi və nəğmə | 1 | | | |
| | **CƏMİ:** | **29** | **30** | **27** | **27** |
| **Seçmə fənlər:** | | **3** | **4** | **8** | **10** |
| **Şagirdlərin məcburi maksimum dərs yükü** | | **32** | **34** | **35** | **37** |
| **Fakültativ, fərdi və qrup məşğələləri** | | **4** | **2** | **1** | **1** |

## 2014-2015-ci dərs ilində ümumtəhsil məktəblərinin VIII-XI sinifləri üçün tədris planı (tədris rus dilində)

| **№** | **Təhsil sahələri** | **Siniflər üzrə həftəlik saatların miqdarı** | | | |
|---|---|---|---|---|---|
| | | **VIII** | **IX** | **X** | **XI** |
| 1. | **Dillər və ədəbiyyat** | | | | |
| | Rus dili | 3 | 2 | 2 | 2 |
| | Azərbaycan dili (dövlət dili kimi) | 2 | 2 | 2 | 2 |
| | Ədəbiyyat | 2 | 3 | 3 | 2 |
| | Xarici dil | 3 | 2 | 2 | 2 |
| 2. | **Riyaziyyat və informatika** | | | | |
| | Cəbr | 3 | 3 | | |
| | Cəbr və analizin başlanğıcı | | | 2 | 2 |
| | Həndəsə | 2 | 2 | 1 | 1 |
| | İnformatika | | | 1 | 1 |
| 3. | **İctimai fənlər** | | | | |
| | Tarix | 1 | 1 | 1 | 1 |
| | Azərbaycan tarixi | 2/1 | 2 | 2 | 2 |
| | İnsan və cəmiyyət | 1 | 1 | 1 | 1 |
| | İqtisadi və sosial coğrafiya | 0/1 | 2 | | |
| | Azərbaycan Respublikasının Konstitusiyası | | 1 | | |
| | İqtisadiyyatın əsasları | | 1 | 1 | 1 |
| 4. | **Təbiət fənləri** | | | | |
| | Fizika | 2 | 3 | 2 | 2 |
| | Astronomiya | | | | 1 |
| | Kimya | 2 | 2 | 2 | 2 |
| | Biologiya | 2 | 2 | 2 | 1 |
| | Fiziki coğrafiya | 1 | | 1 | 2 |
| 5. | **Əmək hazırlığı və texnologiya** | | | | |
| | Əmək hazırlığı | 1 | | | |
| | Rəsmxət | 1 | 1 | | |
| 6. | **Fiziki tərbiyə və gənclərin çağırışaqədərki hazırlığı** | | | | |
| | Fiziki tərbiyə | 2 | 2 | 2 | 2 |
| | Gənclərin çağırışaqədərki hazırlığı | | | 2 | 2 |

| | | | | | |
|---|---|---|---|---|---|
| 7. | **İncəsənət** | | | | |
| | Təsviri incəsənət | | | | |
| | Musiqi və nəğmə | 1 | | | |
| | **CƏMİ:** | **31** | **32** | **29** | **29** |
| **Seçmə fənlər:** | | **3** | **4** | **8** | **10** |
| **Şagirdlərin məcburi maksimum dərs yükü** | | **34** | **36** | **37** | **39** |
| **Fakültativ, fərdi və qrup məşğələləri** | | **4** | **2** | **1** | **1** |

**2014-2015-ci dərs ilində ümumtəhsil məktəblərinin VIII-XI sinifləri üçün tədris planı (tədris gürcü dilində)**

| № | Təhsil sahələri | Siniflər üzrə həftəlik saatların miqdarı | | | |
|---|---|---|---|---|---|
| | | VIII | IX | X | XI |
| 1. | **Dillər və ədəbiyyat** | | | | |
| | Gürcü dili | 3 | 2 | 2 | 2 |
| | Azərbaycan dili (dövlət dili kimi) | 2 | 2 | 2 | 2 |
| | Ədəbiyyat | 2 | 3 | 3 | 2 |
| | Xarici dil | 3 | 2 | 2 | 2 |
| 2. | **Riyaziyyat və informatika** | | | | |
| | Cəbr | 3 | 3 | | |
| | Cəbr və analizin başlanğıcı | | | 2 | 2 |
| | Həndəsə | 2 | 2 | 1 | 1 |
| | İnformatika | | | 1 | 1 |
| 3. | **İctimai fənlər** | | | | |
| | Tarix | 1 | 1 | 1 | 1 |
| | Azərbaycan tarixi | 2/1 | 2 | 2 | 2 |
| | İnsan və cəmiyyət | 1 | 1 | 1 | 1 |
| | İqtisadi və sosial coğrafiya | 0/1 | 2 | | |
| | Azərbaycan Respublikasının Konstitusiyası | | 1 | | |
| | İqtisadiyyatın əsasları | | 1 | 1 | 1 |
| 4. | **Təbiət fənləri** | | | | |
| | Fizika | 2 | 3 | 2 | 2 |
| | Astronomiya | | | | 1 |
| | Kimya | 2 | 2 | 2 | 2 |
| | Biologiya | 2 | 2 | 2 | 1 |
| | Fiziki coğrafiya | 1 | | 1 | 2 |
| 5. | **Əmək hazırlığı və texnologiya** | | | | |
| | Əmək hazırlığı | 1 | | | |
| | Rəsmxət | 1 | 1 | | |
| 6. | **Fiziki tərbiyə və gənclərin çağırışaqədərki hazırlığı** | | | | |
| | Fiziki tərbiyə | 2 | 2 | 2 | 2 |
| | Gənclərin çağırışaqədərki hazırlığı | | | 2 | 2 |
| 7. | **İncəsənət** | | | | |
| | Təsviri incəsənət | | | | |
| | Musiqi və nəğmə | 1 | | | |
| | **CƏMİ:** | **31** | **32** | **29** | **29** |
| **Seçmə fənlər:** | | **3** | **4** | **8** | **10** |
| **Şagirdlərin məcburi maksimum dərs yükü** | | **34** | **36** | **37** | **39** |
| **Fakültativ, fərdi və qrup məşğələləri** | | **4** | **2** | **1** | **1** |

**2014-2015-ci dərs ilində ləzgi dili öyrədilən ümumtəhsil məktəblərinin VIII-XI sinifləri üçün tədris planı (tədris Azərbaycan dilində)**

| № | Təhsil sahələri | Siniflər üzrə həftəlik saatların miqdarı | | | |
|---|---|---|---|---|---|
| | | VIII | IX | X | XI |
| 1. | **Dillər və ədəbiyyat** | | | | |
| | Azərbaycan dili | 2 | 2 | 2 | 2 |
| | Ləzgi dili | 2 | 2 | | |
| | Ədəbiyyat | 2 | 3 | 3 | 2 |
| | Xarici dil | 2 | 1 | 2 | 2 |
| 2. | **Riyaziyyat və informatika** | | | | |
| | Cəbr | 3 | 3 | | |
| | Cəbr və analizin başlanğıcı | | | 2 | 2 |
| | Həndəsə | 2 | 2 | 1 | 1 |
| | İnformatika | | | 1 | 1 |
| 3. | **İctimai fənlər** | | | | |
| | Tarix | 1 | 1 | 1 | 1 |
| | Azərbaycan tarixi | 2/1 | 2 | 2 | 2 |
| | İnsan və cəmiyyət | 1 | 1 | 1 | 1 |
| | İqtisadi və sosial coğrafiya | 0/1 | 2 | | |
| | Azərbaycan Respublikasının Konstitusiyası | | 1 | | |
| | İqtisadiyyatın əsasları | | 1 | 1 | 1 |
| 4. | **Təbiət fənləri** | | | | |
| | Fizika | 2 | 3 | 2 | 2 |
| | Astronomiya | | | | 1 |
| | Kimya | 2 | 2 | 2 | 2 |
| | Biologiya | 2 | 2 | 2 | 1 |
| | Fiziki coğrafiya | 1 | | 1 | 2 |
| 5. | **Əmək hazırlığı və texnologiya** | | | | |
| | Əmək hazırlığı | 1 | | | |
| | Rəsmxət | 1 | 1 | | |
| 6. | **Fiziki tərbiyə və gənclərin çağırışaqədərki hazırlığı** | | | | |
| | Fiziki tərbiyə | 2 | 2 | 2 | 2 |
| | Gənclərin çağırışaqədərki hazırlığı | | | 2 | 2 |
| 7. | **İncəsənət** | | | | |
| | Təsviri incəsənət | | | | |
| | Musiqi və nəğmə | 1 | | | |
| | **CƏMİ:** | **29** | **30** | **27** | **27** |
| **Seçmə fənlər:** | | **3** | **4** | **8** | **10** |
| **Şagirdlərin məcburi maksimum dərs yükü** | | **32** | **34** | **35** | **37** |
| **Fakültativ, fərdi və qrup məşğələləri** | | **4** | **2** | **1** | **1** |

**2014-2015-ci dərs ilində ləzgi dili öyrədilən ümumtəhsil məktəblərinin VIII-XI sinifləri üçün tədris planı (tədris rus dilində)**

| № | Təhsil sahələri | Siniflər üzrə həftəlik saatların miqdarı | | | |
|---|---|---|---|---|---|
| | | VIII | IX | X | XI |
| 1. | **Dillər və ədəbiyyat** | | | | |
| | Rus dili | 2 | 2 | 2 | 2 |
| | Ləzgi dili | 2 | 2 | | |
| | Azərbaycan dili (dövlət dili kimi) | 2 | 2 | 2 | 2 |
| | Ədəbiyyat | 2 | 2 | 3 | 2 |

| | | | | | |
|---|---|---|---|---|---|
| | Xarici dil | 2 | 1 | 2 | 2 |
| **2.** | **Riyaziyyat və informatika** | | | | |
| | Cəbr | 3 | 3 | | |
| | Cəbr və analizin başlanğıcı | | | 2 | 2 |
| | Həndəsə | 2 | 2 | 1 | 1 |
| | İnformatika | | | 1 | 1 |
| **3.** | **İctimai fənlər** | | | | |
| | Tarix | 1 | 1 | 1 | 1 |
| | Azərbaycan tarixi | 2/1 | 2 | 2 | 2 |
| | İnsan və cəmiyyət | 1 | 1 | 1 | 1 |
| | İqtisadi və sosial coğrafiya | 0/1 | 2 | | |
| | Azərbaycan Respublikasının Konstitusiyası | | 1 | | |
| | İqtisadiyyatın əsasları | | 1 | 1 | 1 |
| **4.** | **Təbiət fənləri** | | | | |
| | Fizika | 2 | 3 | 2 | 2 |
| | Astronomiya | | | | 1 |
| | Kimya | 2 | 2 | 2 | 2 |
| | Biologiya | 2 | 2 | 2 | 1 |
| | Fiziki coğrafiya | 1 | | 1 | 2 |
| **5.** | **Əmək hazırlığı və texnologiya** | | | | |
| | Əmək hazırlığı | 1 | | | |
| | Rəsmxət | 1 | 1 | | |
| **6.** | **Fiziki tərbiyə və gənclərin çağırışaqədərki hazırlığı** | | | | |
| | Fiziki tərbiyə | 2 | 2 | 2 | 2 |
| | Gənclərin çağırışaqədərki hazırlığı | | | 2 | 2 |
| **7.** | **İncəsənət** | | | | |
| | Təsviri incəsənət | | | | |
| | Musiqi və nəğmə | 1 | | | |
| | **CƏMİ:** | **31** | **32** | **29** | **29** |
| **Seçmə fənlər:** | | **3** | **4** | **8** | **10** |
| **Şagirdlərin məcburi maksimum dərs yükü** | | **34** | **36** | **37** | **39** |
| **Fakültativ, fərdi və qrup məşğələləri** | | **4** | **2** | **1** | **1** |

**2014-2015-ci dərs ilində azsaylı xalqların dilləri öyrədilən ümumtəhsil məktəblərinin I-IV sinifləri üçün tədris planı (tədris Azərbaycan dilində)**

| **№** | **Fənnin adı** | **Siniflər üzrə həftəlik dərs saatlarının miqdarı** | | | |
|---|---|---|---|---|---|
| | | **I** | **II** | **III** | **IV** |
| 1 | Azərbaycan dili | 7 | 8 | 8 | 8 |
| 2 | “---” dili | 2 | 2 | 2 | 2 |
| 3 | Xarici dil | 1 | 1 | 1 | 1 |
| 4 | Riyaziyyat | 4 | 4 | 4 | 4 |
| 5 | İnformatika | 1 | 1 | 1 | 1 |
| 6 | Həyat bilgisi | 1 | 1 | 2 | 2 |
| 7 | Texnologiya | 1 | 1 | 2 | 2 |
| 8 | Fiziki tərbiyə | 2 | 2 | 2 | 2 |
| 9 | Təsviri incəsənət | 1 | 1 | 1 | 1 |
| 10 | Musiqi | 1 | 1 | 1 | 1 |
| **Cəmi:** | | **21** | **22** | **24** | **24** |
| Dərsdənkənar məşğələlər | | 2 | 2 | 2 | 2 |
| **Yekun:** | | **23** | **24** | **26** | **26** |

**2014-2015-ci dərs ilində azsaylı xalqların dilləri öyrədilən ümumtəhsil məktəblərinin I-IV sinifləri üçün tədris planı (tədris rus dilində)**

| № | Fənnin adı | Siniflər üzrə həftəlik dərs saatlarının miqdarı | | | |
|---|---|---|---|---|---|
| | | I | II | III | IV |
| 1 | Rus dili | 7 | 8 | 8 | 8 |
| 2 | “---” dili | 2 | 2 | 2 | 2 |
| 3 | Azərbaycan dili (dövlət dili kimi) | 2 | 2 | 2 | 2 |
| 4 | Xarici dil | 1 | 1 | 1 | 1 |
| 5 | Riyaziyyat | 4 | 4 | 4 | 4 |
| 6 | İnformatika | 1 | 1 | 1 | 1 |
| 7 | Həyat bilgisi | 1 | 1 | 2 | 2 |
| 8 | Texnologiya | 1 | 1 | 2 | 2 |
| 9 | Fiziki tərbiyə | 2 | 2 | 2 | 2 |
| 10 | Təsviri incəsənət | 1 | 1 | 1 | 1 |
| 11 | Musiqi | 1 | 1 | 1 | 1 |
| **Cəmi:** | | **23** | **24** | **26** | **26** |
| Dərsdənkənar məşğələlər | | 2 | 2 | 2 | 2 |
| **Yekun:** | | **25** | **26** | **28** | **28** |

## Tədris planlarına dair qeydlər

**1.** Azərbaycan Respublikasının ümumtəhsil məktəbində tədrisi nəzərdə tutulan xarici dil (dillər) ingilis, alman, fransız, rus, ərəb dilləri arasından seçilir.

**2.** Tədris dilindən asılı olmayaraq, bütün ümumtəhsil məktəblərində xarici dilin tədrisi I (birinci) sinifdən başlanır. Tədrisi I (birinci) sinifdən başlanan xarici dil şagirdin məktəbdə öyrəndiyi əsas xarici dil hesab edilir.

**3.** Xarici dilin (dillərin) tədrisi üçün məktəbdə müvafiq pedaqoji kadr potensialının və maddi-tədris bazanın olması zəruri şərt hesab edilir.

**4.** Bu “Qeydlər”in 3-cü bəndində nəzərdə tutulan şərt ödənilməklə bir neçə xarici dil tədris olunan məktəbdə övladı üçün müvafiq xarici dil onun valideyni (digər qanuni nümayəndəsi) tərəfindən seçilir.

**5.** Valideynlərin (digər qanuni nümayəndələrin) seçimi ilə bağlı zərurət yaranarsa, eyni sinifdə iki xarici dil qrupu təşkil oluna bilər. Bu halda aşağıdakılar nəzərə alınmalıdır:

5.1. Həmin sinfin bu “Qeydlər”in 19-cu bəndində nəzərdə tutulmuş qayda üzrə 2 (iki) qrupa bölünməsi.

5.2. Bu qrupların dil seçiminə görə bərabər şagird sayı, yaxud qismən az say fərqi ilə komplektləşdirilməsi.

5.3. Məktəbdə həmin xarici dillərin hər biri üzrə ən azı iki nəfər müəllimin olması.

**6.** Ümumtəhsil məktəblərində ikinci xarici dil V (beşinci) sinifdən etibarən tədris olunur.

**7.** Müvafiq pedaqoji kadr potensialı və tədris bazası olduğu halda, ikinci xarici dilin tədrisindən və öyrənilməsindən imtina olunması yolverilməzdir.

**8.** İkinci xarici dilin tədrisini təmin etmək məqsədilə əməkhaqqı mövcud qaydada ödənilməklə digər təhsil müəssisələrindən müəllim (mütəxəssis) dəvət oluna bilər.

**9.** I və V (birinci və beşinci) siniflərdən başlayaraq tədris edilən xarici dillərin növbəti siniflərdə dəyişdirilməsinə qətiyyən yol verilmir.

**10.** Xarici dil (dillər) üzrə müvafiq pedaqoji kadr potensialı olmadığı halda:

10.1. İbtidai siniflərdə xarici dilə ayrılan saat ana dilinin (tədris dili) tədrisinə verilir.

10.2. V-VII (beşinci-yeddinci) siniflərdə xarici dilə ayrılan saatlar hər birinə 1 (bir) saat olmaqla ana dili (tədris dili), “Ədəbiyyat” və “Riyaziyyat” fənlərinin tədrisinə verilir.

10.3. VIII-XI (səkkizinci-onbirinci) siniflərdə xarici dilə ayrılan saatların digər fənlərin tədrisinə verilməsi (hər birinə 1 (bir) saatdan artıq olmamaq şərtilə) məsələsi məktəb pedaqoji şurasının qərarına

əsasən həll edilir. Bu halda həmin fənlərdən ixtisaslı pedaqoji kadrların olması nəzərə alınır.

**11.** İkinci xarici dil tədris edilməyən məktəblərdə bu məqsədlə ayrılan saat əsas xarici dilin öyrənilməsinə, ümumiyyətlə xarici dil keçilməyən məktəblərdə isə "Texnologiya" fənninin tədrisinə verilir.

**12.** Tərkibində III (üçüncü) və ya IV (dördüncü) sinif olan komplekt siniflərdə ana dili (tədris dili) 10 (on) saat, "Həyat bilgisi" və "Texnologiya" fənlərinin hər biri 2 (iki) saat tədris olunur.

**13.** Dərsdənkənar, fakültativ məşğələ qrupları və dərnəklər şagirdlərin sayı 8 (səkkiz) nəfərdən az olmamaq şərti ilə komplektləşdirilir.

**14.** I-XI (birinci-onbirinci) siniflərdə müvafiq olaraq dərsdənkənar məşğələlərə, fakültativ, fərdi və qrup məşğələlərinə ayrılmış saatlardan 1 (bir) saatı dərs cədvəlinə daxil edilməməklə fakültativ kurs formasında şagirdlərin sayı 8 (səkkiz) nəfərdən az olmayan siniflərdə (o cümlədən komplekt siniflərdə) "Həyati bacarıqlara əsaslanan təhsil" kursunun tədrisinə verilir.

Şagirdlərin sayı 8 (səkkiz) nəfərdən az olan siniflərdə həmin kurs sinif təşkilat saatlarında keçilir.

**15.** I-IV (birinci-dördüncü) siniflərdə dərsdənkənar məşğələlərə ayrılan digər 1 (bir) saat müəyyən edilmiş məktəblərdə dərs cədvəlinə daxil olunmaqla "Şahmat" fənninin tədrisinə, "Şahmat" fənni keçilməyən məktəblərdə "Riyaziyyat" fənninin tədrisinə verilir.

"Riyaziyyat" fənni üzrə müvafiq əlavə mövzular aidiyyəti fənn müəllimlərinin iştirakı ilə təhsil şöbəsinin (idarəsinin) metodkabineti tərəfindən hazırlanıb təsdiq edilir.

**16.** Füzuli, Beyləqan, Ağcabədi, Ağdam, Tərtər, Goranboy, Xocavənd, Göygöl, Daşkəsən, Gədəbəy, Tovuz, Qazax, Ağstafa, Kəlbəcər, Laçın, Cəbrayıl, Şuşa, Qubadlı, Xocalı, Zəngilan rayonlarının bütün ümumtəhsil məktəblərinin, habelə Naxçıvan MR-in Ermənistanla sərhəddə yerləşmiş ümumtəhsil məktəblərinin VI (altıncı) siniflərində dərsdənkənar məşğələlərə ayrılmış vaxt hesabına həftədə 1 (bir) saat olmaqla ikinci yarımildə "Mina təhlükəsinə dair maarifləndirmə" adlı fakültativ kurs tədris olunur.

Qeyd edilən rayonların bütün ümumtəhsil məktəblərinin və Naxçıvan MR-in Ermənistanla sərhəddə yerləşmiş ümumtəhsil məktəblərinin IV (dördüncü) siniflərində isə həmin kurs üzrə mövzular "Həyat bilgisi" fənninin daxilində keçilir.

**17.** Müvafiq ixtisaslı kadrları və maddi-texniki, tədris bazası olan ümumtəhsil məktəblərinin VIII-IX (səkkizinci-doqquzuncu) siniflərində fakültativ, fərdi və qrup məşğələlərinə ayrılan saatlardan 1 (bir) saatı dərs cədvəlinə daxil edilməklə "İnformatika" fənninin tədrisinə verilir.

**18.** VIII (səkkizinci) sinifdə fakültativ, fərdi və qrup məşğələlərinə ayrılan saatlardan 1 (bir) saatı dərs cədvəlinə daxil edilməklə "Qarabağın tarixi" fakültativ kursun tədrisinə ayrılır.

**19.** Müvafiq maddi-tədris baza və ixtisas müəllimləri olduğu halda, şagirdlərin sayı 20 (iyirmi) və daha çox olan siniflər aşağıdakı fənlərin tədrisində iki qrupa bölünür:

19.1. Təlim rus və gürcü dillərində aparılan ümumtəhsil məktəblərinin I-XI (birinci-onbirinci) siniflərində Azərbaycan dili (dövlət dili kimi).

19.2. Təlim dilindən asılı olmayaraq, bütün ümumtəhsil məktəblərinin I-XI (birinci-onbirinci) siniflərində xarici dil, V-VII (beşinci-yeddinci) siniflərdə ikinci xarici dil.

19.3. Bütün ümumtəhsil məktəblərinin V-XI (beşinci-onbirinci) siniflərində "Fiziki tərbiyə", V-VII (beşinci-yeddinci) siniflərində "Texnologiya" (ikinci xarici dilə ayrılan saat hesabına tədris edilən "Texnologiya" dərsləri istisna olunmaqla), VIII (səkkizinci) sinifdə "Əmək hazırlığı".

19.4. Seçmə fənlərə ayrılan saatlardan 1 (bir) saat verilməklə "İnformatika" fənninin 2 (iki) saat tədris olunduğu ümumtəhsil məktəblərinin X-XI (onuncu-onbirinci) siniflərində həmin dərslər üzrə praktik məşğələlər.

**20.** Kompyuter kabineti olmayan ümumtəhsil məktəblərində "İnformatika" fənni üzrə praktik məşğələ keçilmir.

**21.** Təhsil Nazirliyinin 21 sentyabr 2010-cu il tarixli, 1241 nömrəli əmri ilə təsdiq edilmiş "Gənclərin çağırışaqədərki hazırlığı" fənn proqramına əsasən, tibbi biliklərin əsaslarına aid mövzular bütün sinfə tədris olunur

**22.** VIII-XI (səkkizinci-onbirinci) siniflərdə seçmə saatların tətbiqi 2006-2007-ci dərs ili üçün təsdiq edilmiş müvafiq qaydalar üzrə aparılır.